*Azərbaycan Milli Elmlər Akademiyası Folklor İnstitutu Elmi Şurasının 07 dekabr 2023-cü il tarixli qərarı ilə (protokol №8) çap olunur.*

*Redaktor:* **Araz Yaquboğlu**
*"Dədə Ələsgər Ocağı" İctimai Birliyi idarə heyətinin üzvü, tədqiqatçı-jurnalist*

*Ön sözün müəllifi:* **Qılman İman**
*Şair-publisist*

*Məsləhətçilər:* **Xətai Ələsgərli**
*"Dədə Ələsgər Ocağı" İctimai Birliyinin sədri*

**Rəşid Süleymanov**
*"Dədə Ələsgər Ocağı" İctimai Birliyi idarə heyətinin üzvü*

*Rəyçilər:* **Tacir Qurbanov (Səmimi)**
*AMEA Folklor İnstitutunun dosenti*

**Mirzə Vərağa Almasov**
*Filologiya üzrə fəlsəfə doktoru*

**Axund Hacı Soltan Əlizadə**
*İlahiyyatçı alim, tədqiqatçı*

***Müəllif kitabın çap olunmasında maddi və mənəvi köməklik göstərənlərə minnətdarlığını bildirir.***

**Hacı Həsən Hüseyni. Nakam aşiq (məqalələr toplusu). Bakı, "İmza", 2023, 424 səh.**

Kitabın müəllifi Qazi Hacı Həsən Hüseyni klassiklərin dini şeirlərindəki məğz və mənaların araşdırılmasında tanınmış tədqiqatçı, din xadimidir. Onun Novrəs İmanın 120 illik yubileyi ərəfəsində yazdığı "Nakam aşiq" (məqalələr toplusu) adlı bu kitab da inanırıq ki, Novrəs İmansevərlərin ürəyincə olacaqdır.

Kitabdan aşıq yaradıcılığı sahəsində təhsil alan magistrlər və aspirantlar istifadə edə bilər.

**ISBN 978-9952-31-326-7**

## XEYİR-DUA

Uca və Əzəmətli Allahın adı ilə.

Bu kitaba Xeyir-duamı kainatın yaranmasına səbəb və İslam dininin rəhbəri olan Həzrəti-Məhəmməd əl-Mustəfanın (s) mübarək “Əli (ə) həqq ilədir, Həqdə Əli (ə) ilədir” hədisi ilə başlayıram. Bu hədis mütəvatir (raviləri çox və düzgün olan) bir hədisdir ki, Novrəs İman da sələfləri və xələfləri kimi öz şeirlərində tez-tez bu hədisi-şərifə istinad edib. Misal olaraq ustadın “Gəlmişəm” rədifli şeirinə diqqət yetirək:

İbtida, dilimdə olub “Bismillah”,
Sığınmışam ol Xudaya, gəlmişəm.
Mənim əzbərimdi “La fəta illa”,
Əxz eləyib yüz min ayə, gəlmişəm.

Çəkilib məddimiz doğru ərkana,
Əbəs düşməmişəm mən bu cahana.
Xidmət eyləmişəm Şahi-Mərdana,
Bel bağlayıb Mürtəzayə, gəlmişəm!

...Peyğəmbər nə lazım, gətirmə dilə,
Sən onun əmrinə gəl düzəl hələ.
Novrəstə İmanam, olmuşam belə,
Yön çevirib Kərbəlaya, gəlmişəm!

Allah-təala mübarək “Həşr” surəsinin 24-cü ayəsində buyurur: “O, (hər şeyi) yaradan, yoxdan var edən, (hər şeyə) surət verən Allahdır. Ən gözəl adlar (əsmayi-hüsna) an-

caq Ona məxsusdur. Göylərdə və yerdə nə varsa (hamısı) Onu təqdis edib şəninə təriflər deyər. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir!"

Allahın salamı olsun "Nakam aşiq" (məqalələr toplusu) kitabının yazarı, Əhli-beyt (ə) sevdalısı, vətənpərvər, Qarabağ müharibəsi qazisi Hacı Həsən Hüseyni qardaşıma. Hacı Həsən Hüseyni torpağına, vətəninə cani dildən bağlı olan bir insandır, müsəlman kişidir, həvəskar folklorşünas, ozan-aşıq sənətinin mahir tədqiqatçısıdır. Bütün bu sadaladığım adlardan savayı mükəmməl ilahiyyatçı alimdir. Hacı Həsən Hüseyni gənc yaşlarından ozan-aşıq sənətinə vurğun olub, dahi aşıqlarımız Göyçəli Miskin Abdal, Aşıq Qurbani, Aşıq Abbas Tufarqanlı, Xəstə Qasım Tikmədaşlı, Ağ Aşıq Allahverdi, Şair Məmmədhüseyn, Aşıq Alı, Dədə Ələsgər, Sarı Aşıq, Daşkəndli Aşıq Nəcəf, Həsən Xəyallı, Bəhmən Göyçəli, Novrəs İman və başqa aşıqların həyatı, yaradıcılığı onu cəlb edib. Bir çox kitablara müəlliflik edib. Əhli-beyt (ə.m) aşiqi Dədə Ələsgərin 200 illik yubileyinə həsr etdiyi kitabına mənim xeyir-duamla başlayıb. İndi də qələmə aldığı "Nakam aşiq" (məqalələr toplusu) kitabına xeyir-dua yazmağı özümə borc bildim. Hacı qardaşım Novrəs İmanın həyatını öz şəxsi həyatına bənzərliyini görüb, qərara gəlir ki, aşığın nakam yaşanmış ömrünə aid kitab yazsın. Haqq aşıqlarının həyatı keşməkeşli olur. Novrəs İmanın ömrünə nəzər saldıqda onun necə acılı, ağrılı həyat yaşadığının şahidi oluruq. Novrəs İmanın yaradıcılığının ana xəttini Peyğəmbər (s) və Əhli-beytə (ə.m) həsr etdiyi qoşmalar, gəraylılar, divanilər, müxəmməslər, qıfılbəndlər və s. təşkil edir.

Mən Ağamir Eyvaz oğlu bir Seyyid olaraq, Hacı Həsən Hüseyni qardaşımın qələmə aldığı “Nakam aşiq” (məqalələr toplusu) kitabına öz xeyir-duamı verirəm. Allah Hacının gözlərini nurlu eləsin, qələm tutan barmaqları var olsun. El sənəti sayılan aşıq yaradıcılığı, folklorun oxucularına tövsiyəm budur ki, vətənpərvər oğul, qazi Hacı Həsənin qələmə aldığı kitabı sevə-sevə oxusunlar. Gələcək nəsillər öz xalqının dahi sənətkarlarını, aşıqlarını, onların yaradıcılıqlarını, həyatını tanısın, oxuyub maraqlansınlar. Hacı qardaş heç zaman bu yolda yorulmayasan, nə qədər çətin olsa da, sonda əziyyətinin bəhrəsini oxucularından görəsən, İnşəallah.

Sağ ol, var ol, Hacı Həsən. Heç zaman yorulmayasan!

***Hacı Ağamir Seyyid Eyvaz oğlu***

# İLAHİ EŞQİN TƏRCÜMANI
## (ön söz)

Allahın adı ilə!

Novrəs İmanın adını nə vaxt eşitdiyimi dəqiq xatırlamasam da, onu bilirəm ki, ayağım yer, dilim söz, əlim qələm tutandan bu isim könül dünyamın ən uca yerində qərar tutub. Bu möhtəşəm imzanın arxasında misra-misra ilahi sirlər, qeyb ərənlərini vəsf edən bəşəri kəlamlar durur ki, içi daş-qaşla dolu mücrü içində bu sənət əsərləri, təəssüf ki, hələ də oxunmamış, tədqiq olunmamış qalır.

Novrəs İman zəngin yaradıcılığı, qeyri-adi şəxsiyyəti ilə xalq yaddaşını sağlığında fəth etmiş nadir sənətkarlardandır. Əlyazmaları özü tərəfindən məhv edilsə də, şeirləri günümüzə qədər aşıqların, xanəndələrin, poeziyasevərlərin qəlbində yaşamaqdadır. Bu bəxtəvərliyi ustadı Dədə Ələsgərdən sonra ən çox Novrəs İman yaradıcılığına şamil etmək olar. Bir şəxsiyyət olaraq öz sözü və əqidəsi olan ustad kimi də haqqında söylənən dastanlar, rəvayətlər, əhvalatlar onu irreal dünyanın sakini kimi gözümüzdə daha da ucaldır.

Quranı əzbər bilməsi, bədahətən şeir demək qabiliyyəti, qarşısındakı adamın qəlbindən keçənlərin ona agah olması, gələcəyi otuz-qırx il qabaq şeirlərində uzaqgörənliklə ifadə etməsi imkan verir ki, Novrəs İman Haqq aşiqi, Haqq şairidir deyək.

Əziz ata, itkin düşən fərzəndin,
Ağla hey düşəndə yada doyunca.
Mənim gərdənimdə çarx kəməndini,
Dolandırar bu dünyada doyunca.

Və yaxud:

Əgər bir ilahi düzəltsə işim,
Şad olaram Kərbəlada doyunca.

Bu şeirdə Novrəs İman gələcək həyatı ilə bağlı açıq informasiya versə də, zamanında onu duymadılar. Və Novrəs İman həmişə bu duyulmazlığın, dərkolunmazlığın mənəvi əzabını çəkdi. Qaranlıq içərisində bir nur parlasa da, cahil mühit onu özü də bilmədən söndürdü.

Ustad sənətkar özünü bu qaragüruh cəmiyyətə olduğu kimi təqdim etməyə çalışsa da, niyyəti alınmadı, axırda cəhalət əlindən baş götürüb getməyə qərar verdi.

Hələ qəflətdəsiz, yatmısız hələ,
Sayıb məni bir divana deyərsiz.
Cəfanız çox olar, yəqin il-ilə,
Dərdinizi ruhi-cana deyərsiz.

Bu bəndin arxasınca bir neçə il sonra Adolf Hitlerin hakimiyyətə gəlişi ilə dünya düzəninin dəyişəcəyini, 37-ci il repressiyası ilə qanlar töküləcəyini, İkinci Dünya müharibəsinin başlayacağını, 1948–1953 deportasiyasına işarə edərək yazır:

Sərsəri fanidə qırılar canlar,
Tökülər yaxında çox nahaq qanlar.
Seçilməz haqq-nahaq yolu qananlar,
Məəttəlik bu divana – deyərsiz.

...Yanmaz gecə çox çıraqlar qaralar,
Gərdiş eli bir-birindən aralar.
Pozular bağçalar, güllər saralar,
Səfər edib biyabana – deyərsiz.

Şəriət elmlərini dərindən mənimsəməsi, klassikləri mükəmməl öyrənməsi həyata baxışını dəyişdiyindən yaradıcılığındakı novatorluq, şeirlərindəki informasiya, ilahi təb Novrəs İmanı gənc yaşlarında ustad mərtəbəsinə qaldırdı.

Onu yazılı ədəbiyyatda əziz sələfi Seyid İmadəddin Nəsimiyə, bir də nəsildaşı Mikayıl Müşfiqə oxşatmaq, ya da onlarla müqayisə etmək olar. Həm də ona görə ki, Novrəs İman aşıqdan çox şairdir, aşiqdir, düşüncə və fikir adamıdır. Saz onun üçün sadəcə bir vasitədir. Sazın qüdrəti ilə yazdıqlarını məclis-məclis cəmiyyətə yayır, yatmışları oyatmağa çalışırdı.

Novrəs İman ustadı Nəsimi kimi əqidə adamı idi. Həyatda Haqqı müdafiə edər, əhli-beytin, xüsusən Həzrət Əlinin, İmam Hüseynin mübarək şücaətini, əqidəsini sıx-sıx şeirlərində dilə gətirər, təbliğ edərdi. Bu mənada Novrəs İman cismindən çox, ruhu ilə yaşayan seçilən, fərqlənən bir əfsanəydi. Zamandaşı Müşfiq kimi isə ilhamlı bir şair, qeyri-adi yaddaş sahibi və romantik bir dünyanın adamı idi. Müşfiq Dilbərin, İman isə sevgilisi Şəkərin eşqi ilə poeziyada yeni bir dünya yaratmışdı. Hər üçünün yaradıcılığında oxşarlıq olduğu kimi, xarakter və talelərində də oxşarlıq var. Nəsimi edam olundu, Müşfiq sürgün edildi, Novrəs İman itkin düşdü…

Novrəs İman xalq şeirinin sonuncu dədəsi Aşıq Ələsgərin qardaşı oğlu olmaqla, nə qədər şərəf daşıyırdısa, saz çalıb, söz qoşuduğuna görə başqalarından fərqli olaraq ikiqat məsuliyyət daşıyırdı. Dədə Ələsgər kimi dühanının meydanına saz və sözlə çıxmaq, özünü bir sənətkar kimi təsdiq etmək olduqca müşkül məsələydi. Çünki Ələsgər o qədər ucadır ki, o ucalıq imkan vermir adi istedadlar görünsün. Təkcə Göyçə çuxurunda nə qədər istedadlı adamlar Dədə Ələsgərin əzəmətinin kölgəsində qaldı. Bəlkə də Aşıq Ələsgər olmasa onlar ədəbiyyatda, aşıq şeirində çox böyük yer tuta bilərdilər. Ancaq müasirlərindən fərqli olaraq Novrəs İman poeziyamızda yer tuta bildi. Özü də dədənin sağlığında!

Ona görə Aşıq Ələsgərdən sonra aşıq şeirinin sonuncu magikanı Novrəs İmanı saymaqda poeziya xiridarları haqlıdır.

Novrəs İman bəsirəti açıq olduğundan özündən çox, həmişə Tanrının sözünü yazıb. Şeirlərindəki metafizik enerji, mistik güc, onun qeyri-adi bir istedad sahibi olmasının təsdiqidir.

Novrəs İman şəxsi taleyindən yazanda da mütəal Allahın varlığı orada qeyri-adi bir ifadə tərzi ilə təcalla edir.

Tanınmış tədqiqatçı, ilahiyyatçı Hacı Həsən Hüseyni mübarək bir işə imza ataraq Novrəs İmanın yaradıcılığına müraciət edib, "Nakam aşiq" adlı yeni bir dəyərli kitab yazıb.

Hacı Həsənin təqdimatında qarşımıza yeni bir Novrəs İman çıxır:

Şəriət elmlərini dərindən bilən Novrəs İman;

Mütəal Allahın qayda-qanunları ilə yaşayan mömin Novrəs İman;

Əhli-beyt (ə.m) aşiqi Novrəs İman;

Həzrəti-Əlinin (ə) fikir və düşüncələrini həyat devizinə çevirən Novrəs İman;

İrfan alimi Novrəs İman;

İslam ədəbiyyatının cahanşümul şairi Novrəs İman.

Ümumiyyətlə, Novrəs İmanın polifonik yaradıcılığı Hacı Həsən tərəfindən şəriət qanunları ilə incələnərək fərqli bir təqdimatla təqdim olunur. Bu kitabda Novrəs İmana yeni bir baxış sərgiləndiyindən, çox gizli mətləblərin üstü açılır, nakam şairin hansı ilahi eşq ilə yaşadığı irfan alimlərinin dili ilə anladılır. Beləliklə, şair-aşiqin yaradıcılığına işıq tutulur.

Ümid edirəm bu kitab Novrəs İmanı yaradıcılığının gələcək tədqiqatçıları və çoxsaylı oxucular üçün həm dəyərli mənbə, həm də töhfə olacaq.

***Qılman İman***
*Şair-publisist*

# REDAKTORDAN

Ulu Tanrının adı ilə!

Novrəs İman. Bu adı ilk dəfə Şiruyə əmimin – Sərraf Şiruyənin evində eşitmişdim. Orta məktəbin aşağı siniflərində oxuyurdum, onlara getmişdim. Böyük otağın baş tərəfində divardan asılmış iri bir şəkil gördüm. Başında iri tüklü bir papaq, sərrast baxışı vardı. Soruşdum ki, əmi, bu kimin şəkilidir? Cavab verdi ki, atam Həsən Xəyallının şair dostu İmanın, Novrəs İmanın. Atamla, bir də Bəhmən Göyçəli ilə birlikdə Nərimanlı kəndindəki mədrəsədə oxuyublar.

Sonralar böyüdükcə bu adı tez-tez eşidərdim. Rəhmətlik əmim Molla Əmirxan isə Novrəs İmanı demək olar ən yaxşı bilənlərdən idi. Yeri gəldikcə Novrəs İmanın həyatından maraqlı əhvalatlar nəql edər, şeirlərini də, xüsusən, “Ağlama” qoşmasını da söhbətinin dadına, duzuna qatardı.

Zəlilü natəvan, əlacsız yazıq,
Sən olasan mənim canım, ağlama!
Artırma dərdimi həddən ziyada,
Qoy mən eşq oduna yanım, ağlama!

O ağlar gözünə olum sadağa,
Ahusan, səyyadam, gəl çıxaq dağa.
Leylisən, Məcnunam, enək bulağa,
Söylə mətləbini qanım, ağlama!

Dünyadan əl üzüb İman aşkara,
Neyləyim bu dərdə mən bəxti qara.
Səni ağladanlar düşsün azara,
Ömürdən beş qalıb sanım, ağlama!

Hazırda türk dünyasında sevilə-sevilə oxunan Dədə Ələsgərdən Novrəs İmanı heç də az oxuyub, az tanımırlar. Qeyri-adi istedadı, savadı öz yerində, nakam, müəmmalı bir ömür yaşaması onu daha da sevdirib, xalq arasında haqqında əfsanələrin gəzib-dolaşmasına yol açıb. Təsadüfi deyil ki, tədqiqatçı dostum Hacı Həsən Hüseyni də Novrəs İmanın yaradıcılığından bəhs edən yeni kitabını "Nakam aşiq" adlandırıb.

Hacı Həsən keçən il böyük ustadımız Dədə Ələsgərdən bəhs edən "Əhli-beyt (ə) aşiqi Dədə Ələsgər" kitabını oxucularına təqdim etdi. 14 elmi məqalədən ibarət kitab ustadın 200 illik yubileyinə ithaf olunmuşdu. Bu il isə ustadın qardaşı oğlu Novrəs İmanın 120 illik yubiley ilidir.

Hacı Həsənlə tez-tez görüşlərimizdə, telefon danışıqlarımızda hər zaman ustadlardan söz salanda heç vaxt Novrəs İmanı unutmaz, onun dini şeirlərindən dönə-dönə söhbət açar, bəzi hissələri təhlil edərdi. Hacı 2019-cu ildə mənə yenicə çap olunmuş "Sığın Haqq dərgahına" adlı kitabını hədiyyə edəndə baxdım ki, burada digər aşıq və şairlərlə yanaşı Novrəs İmandan da bəhs edən "Novrəs İman yaradıcılığında Həzrət Əli (ə.) və Əhli-beyt (ə.) sevgisi" (səh.72–83) və "Novrəs İmanın bir qoşması" (səh.178–188) adlı məqalələri var. Hacı Həsəndən nə vaxtdan Novrəs İman haqqında yazdığını soruşduqda o belə cavab verdi:

"Mən Novrəs İman haqqında hələ gənclik illərimdən maraqlanmışam. O, İslam dininin mahir bilicisi olmuş və bunu da şeirlərində dönə-dönə ifadə etmişdir. Amma yaradıcılığı barədə 2010-cu ildən yazmağa başlamışam. 2011-ci ildə ilk məqaləm "Əhli-beyt (ə) aşiqi Novrəs İman" adlanırdı. Bu məqalədə onun əqidə, əməl və əxlaq barədə olan şeirlərini təhlil etdim. Həmin yazı "Nəbz" qəzetində çap olundu. Məqalə oxucuların çox xoşuna gəldiyindən "Qızıl

Zəngilan" jurnalı da həmin məqaləni dərc etdi. Sonralar, 2016-cı ildə həmin məqalə "Əhli-beyt (ə) şairi Aşıq Novrəs İman" adı ilə "Xəzan" jurnalının ilk sayında (səh.97–102) da çap olundu. Bundan sonra nakam aşıq-şair haqqında Gürcüstanda Azərbaycan dilində nəşr olunan "Qarapapaqlar" aylıq elmi-kütləvi dərgisində "Novrəs İman yaradıcılığında islam fəlsəfəsi və Əhli-beyt (ə) eşqi" (№ 2 (105), iyul-dekabr 2018, səh.28–33) adlı növbəti məqaləm də işıq üzü gördü. "Novrəs İmanın bir qoşması" adlı elmi məqaləm isə Türkiyənin Giresun şəhərində 21–23 iyun 2019-cu ildə keçirilən "2. Uluslararası Dergi Karadeniz Sosyal Bilimler Sempozyumu"nun "Sempozyum Bildiriler Kitabı"nda nəşr olunub".

Hacı Həsən Hüseyninin Novrəs İmanın yaradıcılığından bəhs edən yeni kitabında 10 elmi məqalə cəm edilib. Bu məqalələrdə müəllif aşıq-şairin dini səpkili şeirlərini geniş təhlil etmişdir. Belə ki, şeirlərdə olan ifadələrə, fikirlərə Qurani-Kərimin surələrindəki ayrı-ayrı ayələrdən sitatlar gətirmiş, hədis və digər müəlliflərin fikirlərindən də istifadə edərək fikirlərini aydın çatdırmışdır. Müəllif bəzən Novrəs İmanın söylədiyi fikirlər ilə üst-üstə düşən onun müasirlərinin, sələflərinin və xələflərinin də şeirlərindən nümunələr vermişdir. Bu da məqalələri daha da mükəmməldirmiş, zəngin etmişdir.

Ümumən müəllifin buradakı bütün məqalələrini bir redaktor kimi məqbul hesab edir, Novrəs İmansevərlərin də bəyənəcəyinə əminəm.

***Araz Yaquboğlu***
*"Dədə Ələsgər Ocağı" İctimai Birliyi*
*idarə heyətinin üzvü, Tədqiqatçı-jurnalist,*
*Azərbaycan Jurnalistlər Birliyinin və*
*Azərbaycan Aşıqlar Birliyinin üzvü*

*Sidq-dildən sığınmışam, kirdigardan danışaq;*
*Möminlərin dadirəsi Şahsuvardan danışaq;*
*Ənbiyalar sərvəridi ol Məhəmməd Mustafa,*
*Nitqə gəlib onun kimi tacidardan danışaq.*

*Xəlq eyləyən məxluqatı, qərar qoydu bir xudam;*
*İnsü cünnü küll-aləm, tapdılar ondan nizam.*
*Məhəmmədin ümmətinə göydən endi xoş kəlam,*
*Eynimizdə gizli deyil, aşikardan danışaq.*

*Yalan deyən hesab günü olacaqdı lal kimi;*
*Dili tutmaz, başı çəkər onda qilü-qal kimi;*
*Ölən vaxtı qarşımızda bizə var sual kimi;*
*Bağlı dildən, odlu gürzdən, dar məzardan danışaq.*

*Bir gün olar, əcəl gələr, ağrı yetişər sərə;*
*Hər əməlin öz nəfinə yazılacaq dəftərə;*
*Vay halına bu dünyada qarışan böhtan-şərə;*
*İman deyər, doğru yoldan, düz ilqardan danışaq.*

# NOVRƏS İMANIN "DANIŞAQ" RƏDİFLİ DİVANİSİNDƏ DİNİ-MƏNQƏBƏVİ DÜŞÜNCƏLƏR

*Bismillahir-Rəhmanir-Rəhim!*
*Ya Allah ya Rəsul ya Əli səndən mədəd!*

Hamımıza bəllidir ki, bu il ötən əsrdə yaşayıb-yaratmış, tanınmış Aşıq Novrəs İmanın 120 illik yubileyidir. Keşməkeşli, ağrılı-acılı həyat yolu keçmiş Novrəs İmanın yaradıcılığı zəngin və rəngarəngdir. Uşaqlıq dövründə dini təhsil aldığı barədə bilgilər vardır [21, s.3]. Buna görə də şairin yaradıcılığında dini-mənqəbəvi (xatirat) mövzularda yazılmış əsərlər çoxdur. Bunlardan biri də "Danışaq" rədifli divanisidir:

*Sidq-dildən sığınmışam, kirdigardan danışaq;*
*Möminlərin dadirəsi Şahsuvardan danışaq;*
*Ənbiyalar sərvəridi ol Məhəmməd Mustafa,*
*Nitqə gəlib onun kimi tacidardan danışaq [3, s.127].*

Birinci misrada şair Uca Yaradanımıza, onun böyüklüyünə, əzəmətinə sığınır. Sanki, poetik şəkildə "Bismillah" demiş olur. Bu da həm divan ədəbiyyatımız, həm də aşıq yaradıcılığımız üçün səciyyəvi bir haldır.

Məsələn:

*Dərs alanda mən dil açdım ol Qurana "Bismillah"*
*Şəriətdə şərtdi bizə müsəlmana "Bismillah".*
*Aç yükünü, göstər görüm, nədir mətahın sənin,*
*Söylə görüm, bələdsənmi, yol-ərkana "Bismillah"*
*[3, s.126].*

***

*İbtida, dilimdə olub "Bismillah",*
*Sığınmşam ol Xudaya, gəlmişəm.*
*Mənim əzbərimdi "La fəta İlla",*
*Əxz eyləyib yüz min ayə, gəlmişəm [3, s.49].*

"Möminlərin dadirəsi Şahsuvar" – dedikdə şair böyük ehtimalla İmam Əlini (ə) və onun saysız-hesabsız fəzilətlərini nəzərdə tutur. Bu fəzilətlərin bəziləri Qurani-Kərimdə əks olunmuşdur ki, onlar barəsində də müxtəlif yazılarımızda geniş məlumat vermişik ("Maidə", 55). Burada yalnız bir neçə ayənin tərcüməsi ilə kifayətlənirik: "Sizin hamınız ancaq Allah, onun Peyğəmbəri və iman gətirənlərdir. O kəslər ki, (Allaha) namaz qılır və rukuda olduqlaru halda zəkat verirlər" ("Maidə", 55).

"Ya Peyğəmbər! Rəbbin tərəfindən sənə nazil ediləni (Quranı) təbliğ et. Əgər (bunu) etməsən, (Allahın) risalətini, (sənə hələlə etdiyi elçilik, peyğəmbərlik vəzifəsini) yerinə yetirmiş olmazsan. Allah səni insanlardan qoruyacaq. Həqiqətən, Allah kafir camaatı düz yola yönəltməz!" ("Maidə", 67)

"...Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi (Məkkənin fəthi) islamın mövqeyinin möhkəmlənməsi, cahiliyyət dövrünün bir sıra zərərli adətlərinin aradan qaldırılması və i.a. tamamladım və sizin üçün din olaraq İclamı bəyənib seçdim..." ("Maidə", 3).

"İnsanlarin eləsi də vardır ki, Allahın razılığını qazanmaq yolunda (Allah rizası üçün) öz canını fəda edər. Allah öz bəndələrinə qarşı çox mehribandır" ("Bəqərə", 207).

"Mallarını gecə və gündüz, gizli və aşkar (yoxsullara) sərf edənlərin Rəbbi yanında böyük mükafatları vardır. Onların (Axirətdə) heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər" ("Bəqərə", 274).

"İman gətirib yaxşı əməllər edənlər isə yaradılmışların ən yaxşılarıdır. Səhərə qədər oyaq qalıb ibadət etmək lazımdır!" ("Bəyyinə", 7).

Həzrəti-Əlinin (ə) məşhur fəzilətlərinə dair bir neçə gözəl hədisi də burada xatırlatmağı lazım bildik:

1. Həzrət Peyğəmbər (s) buyurmuşdur: Allah-Təala buyurur: "Əlinin (ə) vilayəti mənim möhkəm və alınmaz qalamdır; hər kəs Mənim qalama daxil olsa, cəhənnəm odundan amanda qalar."

2. Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Əlinin vilayəti Allahın vilayətidir; Ona məhəbbət bəsləmək Allaha ibadət etmək və ona tabe olmaq isə vacib əməlləri yerinə yetirməkdir."

3. "Hər kəsdə Əlinin vilayətinin Bəratı olmasa, Siratdan keçə bilməz."

4. "Əlinin vilayəti Allahın vilayətidir, onu sevmək ibadətdir" "Əlinin vilayəti Mənim vilayətim, Mənim vilayətim isə Rəbbimin vilayətidir."

5. "Mən elmin şəhəriyəm, Əli onun qapısıdır". Elm öyrənmək istəyən qapıya gəlsin.

6. "Əgər bütün insanlar Əliyə (ə) məhəbbət bəsləsəydilər, Allah-Təala cəhənnəm odunu yaratmazdı."

7. "Övladlarınıza Əli ibni-Əbu Talibə (ə) məhəbbət bəsləməyi əmr edin."

8. "Ya Əli! Bir gün Cəbrail (ə) mənim yanıma gəlib dedi: "Ey Məhəmməd! Allah sənin səhabələrinə nəzər saldı, Əlinin (ə) sənin ən yaxşı dostun olduğunu görüb, onu sənin

canişinin və sənin tərəfindən xəbərləri çatdıran bir şəxs qərar verdi”.

9. “Mən və Əli bu ümmətin atasıyıq. Bizim bu ümmət üzərində olan haqqımız onların həqiqi atalarına qarşı olan hüquqlarından artıqdır.Çünki onlar bizə itaət etsələr, biz onları cəhənnəm odundan (xilas edib) Behiştə və səadətə doğru hidayət edərik”.[1]

10. “Ya Əli! Sən mənim canişinim və ümmətimin rəhbərisən. Sənə tabe olan şəxs xoşbəxtdir”.

11. İmam Museyi Kazım (ə) buyurmuşdur: “Əlinin (ə) vilayəti bütün peyğəmbərlərin kitablarında qeyd olunmuşdur. Hər bir peyğəmbər yalnız Mühəmmədin (s) nübüvvətinə və Əlinin (ə) imamətinə dair əhd-peyman aldıqdan sonra peyğəmbərliyə seçilmişdir.”

12. Peyğəmbər (s) buyurub: “Sizlərdən hər kəs, Allahı və Əli ibn Əbu Talibin (ə) vilayətini qəbul edib razı olsa, Allahın əzabından amanda qalacaq”.[2]

13. İmam Zeynal-Abidin (ə) buyurub: “Əgər bir nəfər Nuh (ə) qədər ömür sürsə və gündüzləri oruc tutub, gecələri ibadət etsə, lakin biz imamların vilayətini qəbul etmədən dünyadan getsə, gördüyü əməllərin ona heç bir faydası olmaz”.[3]

14. İmam Sadiq (ə) buyurub: “Əgər yer üzünün bütün insanları Əlinin (ə) vilayətini inkar etsələr, Allah-Təala onları cəzalandırar və cəhənnəmə aparar”.[4] [23, s.79–80].

---

[1] “Səfinətul-Bihar”. cild 2. səh. 688
[2] “Biharul-Ənvar”. cild 41. səh. 351
[3] Mühəddis Hüveyzi. “Təfsiri-nurus-səqəleyn”
[4] “İqabul-əmal”. səh. 450

Oxucuların marağını cəlb edəcəyini düşündüyümüzə görə bir neçə Qərb aliminin İmam Əli (ə) haqqında fikirlərini sizə də təqdim edirik:

**Cübran Xəlil Cübran – Livan alimi:** Həzrət Əlinin (ə) haqqında bu xaçpərəst yazıçı yazır: "Mənim əqidəmcə, Əbu Talibin övladı ilk ərəbdir ki, Ruhi-Küllün yaxınlığını, zəruriliyini və insanla qırılmaz əlaqəsini əsas kimi götürmüşdür. Əli (ə) həmin ruhla gecələr ünsiyyət saxlayır və sirdaşlıq edirdi. O ilk ərəb idi ki, Ruhi-Küllün ahəngini xalqın qulağına pıçıldayırdı, xalq isə bundan qabaq belə bir nəğmə eşitməmişdi. Beləliklə, adi xalq onun işıq saçan bəlağət yollarının ortasında öz keçmişlərinin qaranlıqlarına görə heyran qaldı. Hər bir kəs ona könül bağladı, ona heyran oldu, cahiliyyət və nadanlıq övladları isə ona düşmən kəsildilər."

**Corc Cordaq – yazıçı:** Bu xaçpərəst yazıçı 5 cildlik bir əsərdə Əlinin (ə) şəxsiyyəti və fədakarlığı haqda təhlillər aparmış, Əli (ə) barəsində belə yazmışdır: "Tarixin yanında həqiqət və gerçəklik bu cürdür ki, istər onu tanıyasan, istərsə də tanımayasan, fərq etməz. Adlı-sanlı şəhid, şəhidlərin böyük atası Əli (ə) ibni-Əbu Talib (ə) insan ədalətinin səsidir. Şərqin əbədi şəxsiyyətidir. Bu həmin Əli ibn Əbu Talibdir (ə) ki, ölüm və döyüşün tamamı ilə başqa mənasını dərk etmiş və anlamışdır. O, başqa niyyət və qəsdlə vuruşmurdu, bu niyyət başqalarından fərqli idi. Səmimi zövq və halallıqla cihad yolunu seçdi, çarəsizlərə və kimsəsizlərə məhəbbət göstərməklə qalaları fəth etdi, ədalət və insaf düşmənlərinin sarayını yerlə yeksan etdi. O, əxlaqi kəramət və ali insani sifətlər baxımından yüksək kamil bir zirvəyə yetişmişdi. "Ey dünya! Nə olardı ki, bütün qüdrət və gü-

cünü işə salaydın və həmin ağılla, həmin qəlblə, həmin dillə, həmin Zülfüqarla aləmə təzə Əli (ə) bağışlayaydın.”

**Tomas Karlayl – alim-yazıçı:** Bu, məhşur ingilis filosofu və alim-yazıçı Əlinin (ə) şəxsiyyəti və tarixi əzəməti haqqında yazır:

“Lakin Əli (ə)... haqqında bizə təkcə bu qalır ki, onu sevək, ona məhəbbət bəsləyək. O, böyük və alicənab şəxsiyyət idi. Onun vicdan çeşməsindən xeyir və yaxşılıq qaynayırdı, ürəyindən qəhrəmanlıq və təlatüm şölələri alovlanıb qalxırdı. O, aslandan da şücaətli idi, lakin bu şücaət lütf, səfa və rəhmət dolu bir ruhla qarışmışdı, incə, insani buyruqlar həlimlik və yüksəklik hissləri ilə dolu idi. “O, Kufə şəhərində qəflətən vuruldu, hiylə ilə şəhadətə yetirildi. Bu cinayətin törəməsi onun ədalətinin hədsiz dərəcədə çox olması ilə bağlı idi, çünki o, hər bir kəsi özü kimi adil hesab edirdi. Ölüm yatağına düşdüyü zaman qılıncla onu yaralayan adam haqqında dedi: “Sağ qalsam, özüm bilərəm, nə edərəm, ölsəm, özünüz bilərsiniz, əgər qisas istəsəniz, bir qılınc zərbəsinin müqabilində siz də təkcə bir zərbə vurun. Ümumiyyətlə, qisasdan keçsəniz, təqvaya daha yaxındır.”

**Şibli Şüməyyil – ərəb alimi:** Materialist filosofdur, kommunist məntiqinə malikdir, ateistdir, metafizikanı inkar edir. O, Əli (ə) haqqında belə deyir:

“İmam Əli ibni-Əbu Talib (ə) böyüklərin böyüyü, zamanın yeganə şəxsiyyəti idi. Qərb və şərq dünyasında, keçmişdə və indiki vaxtda öz əslinə tam bənzər olan ikinci belə bir şəxsiyyət görünməmişdir.”

**Volter – XVIII əsr görkəmli fransız yazıçısı, filosofu və dramaturqu:** “Qədir-Xum” barədə söylədiklərindən: “Xalqların adət-ənənələri haqqında” adlı kitabında müəllif

Əlinin (ə) haqqında mühüm sənədlərə toxunaraq yazır: "İslam Peyğəmbərinin sonuncu istək və iradəsi yerinə yetmədi. O, ölüm yatağında olarkən Əlini öz canişini seçmişdi, lakin onun vəfatından sonra bu istək həmin əsrin bir sıra nüfuz sahibləri tərəfindən nəzərə alınmadı."

Müəllif bu kitabında Həzrət Əlinin (ə) xəlifəliyinin qanunilik baxımından sənədləşdiyini göstərmişdir. Eyni zamanda, yazıçının əqidəsinə görə, İslam Peyğəmbəri əmisi oğlu və kürəkəni olan Əlinin canişinliyini açıq-aydın və qətiyyətlə vəsiyyət etmişdir. Hətta ölüm yatağında olarkən öz səhabəsindən qələm və mürəkkəb istəmişdir ki, yazılı surətdə Əlini canişin kimi təqdim və təsdiq etsin.

**Süleyman Kəttani – yazıçı:** Bu xaçpərəst yazıçı ömrünün ən gözəl illərini o böyük azadlıq rəhbərinin həyatını tədqiq etməyə, bu nadir şəxsiyyətin tanıdılmasına sərf etmişdir. Onun "Əl imam Əli" adlı dəyərli kitabı Əlinin tərifinə həsr olunmuşdur. Bu kitab tarixilik və elmilik baxımından böyük dəyəri ilə yanaşı, bədiilik nöqteyi-nəzərindən də əsrimizin ən gözəl əsərlərindən biridir. Bu əsərin peşəkar bədii üslubu elə səviyyədədir ki, yalnız mahir ərəb ədəbiyyatçıları, fəzilətli hünər sahibləri, alim-ədiblər və bu fənnin mütəxəssisləri, bəlkə, onun dərin mənalarını anlamağa qadir olarlar. Bu xaçpərəst yazıçı yazır:

"İmam Əli (ə) barəsində söz söyləmək – Tanrıya mənəvi yaxınlıq baxımından ibadət mehrabında dayanmaqdan heç də əskik deyil."

"Ey mənim sərvərim! Heç rəvadımı ki, sənin xidmətində hazır olmaq əvəzində sənin barəndə ixtilaf etsinlər?!

Onlardan bəzisi səni əldən verdi və səni tanımadı... Bir dəstə səni əldən verdi və tapdı.Bir dəstə səni tapdı, sonra əldən verdi. Şübhəsiz, bu, çox təəccüblü və heyrətamizdir."

**İlya Pavloviç Petruşevski – Sankt-Peterburq Universitetinin tarix üzrə professoru:** “Məhəmmədin yetirməsi olan Əli ona və İslam dininə dərindən bağlı və vəfalı idi. Əli Sadiq və imanlı idi, əxlaqi məsələlərdə cox diqqətli idi, şöhrətpərəstlikdən, şəhvətpərəstlikdən uzaq idi, şübhəsiz, həm döyüşkən idi, həm də şair idi və Allah övliyalarının bütün lazımi sifətləri onda cəmlənmişdi” [23, s.227–230].

Birinci bəndin son iki misrasında (Ənbiyalar sərvəridir, ol Məhəmməd Mustafa, Nitqə gəlib onun kimi tacidardan danışaq) isə əzəmətli Islam Peyğəmbərinin (s) fəzilətləri ön plana çəkilir. Bu misraları oxuyarkən ilk növbədə “Əhzab” surəsinin 40-cı ayəsi yada düşür: “Rəsulum aranızdakı kişilərdən heç birinin atası deyildir. (Oğul odur ki, kişinin öz belindən əmələ gələ!). Lakin o, Allahın rəsulu (elçisi) və peyğəmbərlərin sonuncusudur. Allah hər şeyi biləndir!” (“Əhzab”, 40)

A.M.Şirazi yazır: “...Bu ayə peyğəmbərlik missiyasının islam peyğəmbəri ilə başa çatdığını və ondan sonra heç bir peyğəmbər gəlməyəcəyini göstərir. Hədislərin birində Peyğəmbər (s) belə buyurmuşdur: “Mənim digər peyğəmbərlərlə olan müqayisəmi bir misalla belə izah edə bilərəm: Bir kişi gözəl bir ev tikir. Camaat evin ətrafına toplaşıb “Bundan gözəl bina yoxdur, yalnız bir kərpici çatmır”, deyirlər. Bax, həmin boş yeri dolduran sonuncu kərpic mənəm” [2, s.423].

Ustad Möhsün Qiraəti bu ayənin şərhində yazır ki, “Xatəm (sonuncu)” dedikdə üzərinə şəxsin adı həkk lunmuş və möhür kimi istifadə olunan üzük nəzərdə tutulur. Uyğun söz ərəbcə mətndə “xatəmən-nəbiyyin” (pyğəmbər-

lərin sonuncusu) Həzrəti-Məhəmmədin sonuncu peyğəmbər olmasına işarədir.

Həzrəti-Məhəmmədin (s) dininin cahanşumul və əbədi olduğunu bir çox ayələr (aləmdəkiləri qorxudan "Furqan"1, sizi və onun çatdığı hər bir kəsi qorxudan" "Ənam" 19, bütün insanlara – "Səba" 28 və mütəvatir hədislər "Məndən sonra nəbi yoxdur", "Məhəmmədin (s) halalı əbədi olaraq Qiyamətə qədər halaldır") təsdiqləyir. Yazır ki, ayə uyğun həqiqətin ən aydın dəlilidir.

Bu ayə yeganə ayədir ki, həm peyğəmbərin (s) adı çəkilir, həm də "rəsul" və "nəbiyy" olması göstərilir. [5, s.306–307]. Sonra "Nur" təfsirinin müəllifi bir neçə mübahisəli və qaranlıq görünə biləcək suallara aydınlıq gətirir:

**Sual 1.** Nə üçün İslam Peyğəmbərindən (s) sonra bəşəriyyətin yeni bir peyğəmbərə ehtiyacı yoxdur?

**Cavab:** Peyğəmbərlərin gəlişini zəruri edən iki səbəb vardı: Öncəki din və səmavi kitabın təhrif olunması və bəşəriyyətin təkamül yolu keçib yeni qanunlara ehtiyac duyması. Amma İslam Peyğəmbərindən (s) sonra nə onun gətirdiyi kitab təhrif olunmuşdur, nə də Qiyamət gününədək başqa qanunlara ehtiyac duyulur. Bircə kəlmə sözü dəyiçməmiş Quran Allahın elmi əsasında bəşəriyyətin bütün ehtiyaclarina cavab verir.

**Sual 2.** İnsanların dəyişən ehtiyacları peyğəmbərliyə nöqtə qoyulması ilə bir araya sığırmı?

**Cavab:** İnsan öz təhsilində ictihad və doktorluq dərəcəsinə çatanadək müəllimə ehtiyac duyur. Sonra elə bir mərhələ başlayır ki, o, öz ehtiyaclarını öncə əldə etdiyi biliklər hesabına təmin etməli olur. İctihad qapısı açıqdır. İnsan mövcud ümumbəşəri ilahi qanunlardan ehtiyacına uy-

ğun çıxarışlar edə bilər. Əlbəttə ki, bu iş fəqihlərin çıxarış üçün nəzərdə tutduğu prinsiplər əsasında həyata keçməlidir.

**Sual 3.** Nə üçün bəşəriyyətin qeyb aləmi ilə rabitəsi qırıldı?

**Cavab:** Vəhy nazil olmasa da, qeyblə rabitə yerindədir. Məsum imam (ə) var, ilahi mələklər ona nazil olur. Ləyaqətli insanlar hazırda da qeybi yardımlardan faydalanır. Hətta adi fərdlər təqvalı olarsa, ilahi nur əldə edər və Allah bir yolla doğru yolu onlara göstərər [5, s.307].

Həzrəti-Məhəmmədin (s) əqidəvi, mənəv-əxlaqi fəzilətlərini, ictimai-tarixi özünəməxsusluqlarını göstərən Quran ayələri çoxdur. Bunlardan bəzilərini göstərmək olar: "Doğrudan da sən böyük bir əxlaq sahibisən! Böyük bir din üzərindəsən!" ("Qələm", 4)

"Həqiqətən, Allahın rəsulu Allaha, Qiyamət gününə ümid bəsləyənlər (Allahdan, Qiyamət günündən qorxanlar) və Allahı çox zikr edənlər üçün gözəl nümunədir! ("Əhzab", 21) "Həqiqətən, Allah və Onun mələkləri peyğəmbərə salavat göndərirlər (xeyir-dua verirlər) Ey iman gətirənlər! Siz də ona salavat göndərib (onun üçün salavat deyib) layiqincə salamlayın! (Allahun məsəlli əla rəsulunin və ali rəsulun; Əs sələm əleyk əyyuhən nəbiyy və rəhmətullah və bərəkatuhu – deyin!)" ("Əhzab", 56).

"Ya Peyğəmbər! Həqiqətən, biz səni (ümmətinə) bir şahid, bir müjdəçi və bir qorxudan kimi göndərdik" "(Biz səni) Allahın izni ilə ona tərəf çağıran və nurlu bir çıraq olaraq göndəririk!" ("Əhzab", 45–46)

"(Ya Rəsulum!): "Siz Allahı sevirsinizsə mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın. Allah bağışlayandır, mərhəmətlidir!" ("Ali-İmran", 31).

"Səni də (ya Rəsulum!) aləmlərə (bütün insanlara və cinlərə) ancaq bir rəhmət olaraq göndərdik. (Sən təkcə insanlara deyil, eyni zamanda cinlərə də peyğəmbər göndərilmisən. Bütün aləmlər əhli, o cümlədən göydəki mələklər, yerdəki insanlar və cinlər sənin vücudunla şərəfə nail olurlar. Sənin sayəndə günahkarlara möhlət verilmiş, hətta, səni inkar edənlərin belə cəzası Qiyamətə qədər təxirə salınmışdır. Möminlər isə sənə iman gətirməklə dünyada böyük savab qazanıb Axirətdə böyük dərəcələrə, əbədi səadətə nail olacaqlar)" ("Ənbiya", 107)

"Bəzi ayələrimizi (Qüdrətimizə dəlalət edən qəribəlikləri və əcaiblikləri) göstərmək üçün bəndəsini (Peyğəmbəri (s) bir gecə (Məkkədəki) Məscidül-Həramdan ətrafını mübarək etdiyimiz (bərəkət verdiyimiz) Məscidül-Əksaya (beytül müqəddəsə) aparan Allah pak və müqəddəsdir. O, doğrudan da (hər şeyi) eşidəndir, görəndir!" ("İsra", 1)

"O, kefi istəyəni (havadan) danışmır; Bu, ancaq (Allah dərgahından) nazil olan bir vəhydir" ("Nəcm", 3–4)

Həm Novrəs İmanın, həm də digər ustad aşıqlarımızın və divan ədəbiyyatı nümayəndələrimizin əsərlərində bu ölməz və əvəzsiz ruhi-mənəvi keyfiyyətləri özündə əks etdirən poetik parçalar istənilən qədərdir:

*Allah dünya xəlq eləyib peyğəmbərdə ötəri;*
*Ona Quran göndəribdi bu bəşərdən ötəri;*
*Biz bəndəyik, şükr eyləyək dinə dürdən ötəri;*
*Çünki, onun hörməti var, bağışlayar ümməti;*
*Ümmət Onu unutmasın simü zərdən ötəri. [3, s.140].*

*(Novrəs İman)*

***

*Cəlili-əla, ya Məhəmməd,*
*Bir ismin yasindimi?*
*Şəninə gəlibdi ayat,*
*Sureyi – "Yasin"dimi?*
*Mədəni-vücudi-səxa*
*Zikr olur dildə səməd:*
*Bir ustaddan dərs almışam,*
*"Əlif"di, ya "sin"dimi?*

*Şəfaətin kəsmə bizdən,*
*Ya Rəsul, sağ əlin,*
*Mən sənin aşiqinəm,*
*Gələndə bədri-ünün.*
*"Kaf", "Lam" kəlmə içində*
*Oxunur şahi-səfin.*
*Mən sənin ismi-şərifin,*
*Noheyi-yasindimi?*

*Novrəs İman əndəlibdi,*
*Gülşəndə fəqan edər;*
*Zərrəcə görsə camalın,*
*Can sana qurban edər;*
*Ruzi-məhşər olanda,*
*Şafeyi-üsyan edər;*
*Ömür gəldi başa yetdi,*
*Aqibət ya sindimi? [3, s.148].*

***

*Ey olan merac, bürhani-ülüvvi-şan sana,*
*Yerə enmiş göydən, istiqbal edib fürqan sana.*
*(Məhəmməd Füzuli)*

*(Merac sənin ülviliyinin, ucalığının dəlili, fürqan isə, islam dinini idarə etmək üçün sənə göndərilən qanun kitabıdır).*

*Baqiyi-möcüz nə hacət, əmri-həq isbatına,*
*Aləm içrə möcüzü-baqi yetər Quran sana.*
*(Məhəmməd Füzuli)*

*(Allah-təalanın əmrlərini insanlara çatdırmaq və onların həqiqiliyini sübut etmək üçün, başqa möcüzə göstərməyə ehtiyac yoxdu. Sənin əbədi və daimi möcüzən Qurandır).*

***

*Ya Nəbi, lütfün Füzuludən kəm etmə ol zaman,*
*Kim, olur təslim miftahi dəri ğufran sana [8, s.47].*
*(Məhəmməd Füzuli)*

*(Ya Rəsulullah (s) Onda ki, şəfaət etmək, günahları bağışlamaq hüququ və cənnət qapılarının açarlarının ixtiyarı sənə verildi, o zaman Füzulidən də yaxşılığını əsirgəmə).*

***

*Ol məqamın kim, mələk yetməz süqufi-nəlinə,*
*Ayağın altında ol bir xaki-padır, ya Nəbi! [6, s.167].*
*(Şah İsmail Xətai)*

*(Mələklərin çata bilmədiyi o uca dərəcəndə yüksək şan-şöhrətin – nəleyninin (başmaq) üstü sənin hər gün taptaladığın, üzərində hər gün sərbəst gəzib hərəkət etdiyin adi qara torpaqdan başqa bir şey deyildir).*

*Qaldı sidrəl müntəha, keçdin fələkdə ta zəmin,*
*Kim yetər bu qədri-həqqə, müntəhadır, ya Nəbi!*

*(Sənin merac gecəndə "Sidrətül-Müntəha" arxada qaldı. Yer kürəsindən ucalaraq göyün bütün qatlarını keçdin, gəzib gördün. Bu bəşər övladının, insan oğlunun ucala biləcəyi ən yüksək zirvədir. Axı bundan daha yüksəyə ucalmaq heç bir kəsin şəninə şayəstə deyildir).*

***

*Xosrovi-hüsnün əzizim! Sən imişsən taci,*
*Xublər cümlə sənin dərgahinin möhtaci.*

*Qabi-qövseyn qaşın, leylətül– əsra zülfün,*
*Tapmısan mərtəbeyi-hüsndə sən meraci.*

*Gecə-gündüz səri-kuyində sızıldar Sabir,*
*Neyləsün, qovma qapından kəsilüb illacı [9, s.372].*
*(Mirzə Ələkbər Sabir)*

***

*Göylərə xəbər oldu,*
*Hər yan sevinclə doldu,*
*Dedilər Əhməd gəldi,*
*Bəzəndi səkkiz uçmaq.*

*Məhəmmədə bir gecə,*
*Tanrıdan endi büraq,*
*Cəbrail dedi, səni*
*Meraca çağırdı* Haqq.

*Gör Məhəmməd neylədi,*
*Göyləri seyr eylədi,*
*Ümmətinə söylədi,*
*Ərşə açınca qucaq.*

*Neçə min illik yola,*
*Bir dəmdə enib gələ.*
*Yunis deyər, kim ola,*
*Məhəmməddir o mütləq* [4, s.37].
*(Yunis İmrə)*

***

*Leylətül-qədrdə Merac evində*
*Doxsan aldı yetmiş iki dilində.*
*Qırxlardan yazıldı, Kövsər əlində,*
*Məhəbbətin intəhası Muhəmməd.*

*Həmrahlıq eylədi, Cəbrail– əmin,*
*Yeddi müəllaya xətməl-mürsəlin.*
*Pərdeyi-ismətdə gördü Heydərin,*
*Oldu bəzmin həm sədası Məhəmməd.*

*Çağıraram, ya Məhəmməd Mustafa!*
*Lütfü qıl qəlbimə verginən səfa.*
*Sənə baş endirir ətz ilə səma,*
*Möminlərin Müqtədası Məhəmməd.* [22, s.386].
*(Seyyid Murad Musəvi. (Cənubi Azərbaycan))*

Novrəs İman divaninin ikinci bəndini Uca Yaradanımızın xaliqiyyət (yaratmaq) sifətini və bu yaranışdakı sarsılmaz nizam-intizamın bədii tərənnümü ilə başlayır:

*Xəlq eyləyən məxluqatı, qərar qoydu bir xudam;*
*İnsü cünnü küll-aləm, tapdılar ondan nizam.*
*Məhəmmədin ümmətinə göydən endi xoş kəlam,*
*Eynimizdə gizli deyil, aşikardan danışaq [3, s.127].*

Söz yox ki, bu misralardan boy göstərən dini-fəlsəfi dünyabaxışının kökləri müqəddəs kitabımızdadır. Bu kitabın hər ayəsini oxuduqca insan həmişə diri, qüdrətli olan, elmi və hikməti ilə bütün varlıq aləmini əhtə edən əzəmət sahibinin qüsursuz və mükəmməl yaradılış sənətinə, bu yaradılışdakı sarsılmaz və pozulmaz ardıcıllığa, nizam-intizama heyran qalmaya bilmir. Bu mövzu ətrafında saatlarla, günlərlə söhbət açmaq olar. Ancaq nə qədər gözəl yazsaq, nə qədər gözəl danışsaq Uca Tanrımızın bir kəlməsini belə əvəz etməyə qadir deyilik. Ona görə də üzümüzü yenə Qurani-Kərimə tutaq.

"O, göyləri və yeri (yoxdan) var edəndi. Allahın necə övladı ola bilər ki, Onun heç bir yoldaşı (zövcəsi) yoxdur. Hər şeyi o yaratmışdır. O, hər şeyi biləndir!" ("Ənam", 101)

"Məgər kafir olanlar göylə yer bitişik ikən Bizim onları ayırdığımızı, hər bir canlını sudan yaratdığımızı bilmirlərmi?! Yenə də iman gətirməzlər? Göylər ilk yaradılışda bir-birinə bitişik bir təbəqə olduğu halda, onların arası hava ilə açılıb yeddi təbəqəyə ayrılmış, yenə də bir təbəqəykən sonra yeddi təbəqəyə bölünmüşdür. Bu, Allahın qüdrətini, əzəmətini sübut edən ən tutarlı dəlillərdəndir" ("Ənbiya", 30).

“Yeddi (qat) göyü və bir o qədər də yeri yaradan Allahdır. Allahın hər şeyə qadir olduğunu, Allahın hər şeyi elm (öz əzəli elmi) ilə ehtiva etdiyini biləsiniz deyə, (Allahın) əmri onların arasında (mövcud olan bütün məxluqata) nazil olar” (“Təlaq”, 12) “Halbuki o, sizi cürbəcür, (və ya müxtəlif mərhələlərlə – əvvəl nütfə, sonra laxtalanmış qan, sonra bir parça ət və nəhayət, insan şəklində) xəlq etdi; Məgər görmürsüz ki, Allah yeddi göyü (bir-birinin üstündə) qat-qat necə yaratdı?!; Orada ayı bir nur, günəşi də çıraq etdi” (“Nuh”, 14–16)

“İnsanı (Adəmi) saxsı kimi (toxunduqda səs çıxaran) quru palçıqdan O yaratdı; (Cinlərin əcdadı) canını da tüstüsüz (təmiz) oddan O xəlq etdi” (“Ər-Rəhman”, 14–15).

“Mən cinləri və insanlari yalnız Mənə ibadət etmək üçün yaratdım” (“Zariyat”, 56).

“Günəş də (qüdrət əlamətlərimizdən biri kimi) özü üçün müəyyən olunmuş yerdə seyr edər. Bu, yenilməz qüvvət sahibi olan (hər şeyi) bilən Allahın təqdiridir (əzəli hökmüdür); Biz ay üçün də mənzillər müəyyən etdik. Nəhayət, o, (həmin mənzilləri başa vurduqdan sonra) dönüb xurma ağacının qurumuş əyri budağı kimi (hilal şəklində) olar; Nə günəş aya çatar (yetişər), nə də gücə gündüzü ötə bilər. (Günəş, ay və ulduzların) hər biri (özünəməxsus) bir göydü (öz hədəqəsində, öz dairəsində üzər)” (“Yasin”, 38–40).

Bu və ya digər ölçüdə gətirdiyimiz ayələrlə səsləşən bəzi hədisləri də sizə təqdim edirik:

Peyğəmbəri (s) buyurur: “Hər şey sudan yaradılmışdır”.[1]

---

[1] Kənzul-Ummal. hədis 15119

Allahın Peyğəmbəri (s): “Allah-taala dünyanın səmasını ram edilmiş dalğadan yaratmışdır”.[1]

Həbbeye Orəni: “Günlərin birində Həzrət Əlinin (ə) belə and içdiyini eşitdim: “And olsun səmanı tüstüdən Yaradana”.[2]

“Allahın yaratdığı ilk şey qələmdir. Sonra ona əmr verdi və qələm yaranmalı olan hər bir şeyi yazdı”.[3]

“Allah hər şeydən əvvəl əqli yaratdı”.[4]

“Allah hər şeydən əvvəl mənim nurumu yaratdı”.[5]

“Allah-taalanın yaratdığı ilk varlıq bizim ruhlarımız olub. Sonra onlara özünün tövhidini və tərifini söylətdirdi, daha sonra mələkləri yaratdı”.[6]

Biharul-ənvar: “İmam Əlidən (ə) Allahın yaratdığı ilk məxluq haqda soruşduqda buyurdu: “Nuru yaratmışdır”.[7]

İmam Baqir (ə): “Allah-taalanın birinci yaratdığı və sonradan bütün varlıqların mənşəyi olan şey su olub”.[8]

***Aləmin yaradılışı***

Quran: “Məgər kafirlər düşünmürlərmi ki, səmalar və yer bir-birinə bağlı idi, biz onları açdıq və hər bir canlını sudan yaratdıq. Görəsən, bundan sonra da iman gətirməyəcəklərmi?” (“Ənbiya”, 30).

İmam Əli (ə): “Əşyaları əzəli bir maddədən və əbədi nümunələrdən yaratmadı. Əslində yaratdığını yaratdı,

---

[1] Kənzul-Ummal. hədis 1518
[2] Biharul-Ənvar. c. 58. səh. 104. hədis 35
[3] Kənzul-Ummal. hədis 15115
[4] Biharul-Ənvar. c. 1. səh. 97. hədis 8
[5] Biharul-Ənvar. c. 1. səh. 97. hədis 7
[6] Uyune Əxbare Rza (ə). c. 1. səh. 262. hədis 22
[7] Biharul-Ənvar. c. 57. səh. 73. hədis 49
[8] Ət-Tovhid. səh. 67. hədis 20

hüdudları (ölçülərini) təyin etdi, surət verdiyinə, surət verdi və surətlərini ən gözəl şəkildə yaratdı”.[1]

İmam Baqir (ə): “Allah-taala varlıqları yaratdı, amma hansısa bir şeydən yox. Kim desə ki, Allah-taala varlıqları (hansısa bir) şeydən yaratdı, o, kafirdir”.[2]

Gözlərimizdən gizli olan aləmin təmtərağı və əzəməti İmam Əli (ə): “Ey Pak olan Allah! Sənin yaratdıqlarından gördüklərim necə də əzəmətli və təmtəraqlıdır! Hər bir böyük, Sənin qüdrətin müqabilində necə də kiçikdir! Sənin mələkutundan gördüklərimiz necə də vahiməlidir! Bizim gördüklərimiz Sənin gözə görünməyən qüdrət və səltənətinin müqabilində necə də kiçikdir!”.[3]

İmam Baqir (ə): “Bəlkə elə fikirləşirsən ki, Allah-taala təkcə bu aləmi yaratmış və sizdən başqa bir bəşər xəlq etməmişdir? And olsun Allaha, O, min-min aləm və min-min Adəm yaratmışdır ki, sən o aləmlərin və Adəmlərin ən sonuncususan”.[4]

Bir çox ustad sənətkarlarımız da Novrəs İman kimi kainatın və insanın yaradılması və xilqətdəki nizam-intizam mövzusuna müraciət etmişlər.

*Ol dəm ki, urub binayi-möhkəm,*
*Çəkdin rəqəmi-nizami-aləm.*
*Həqqa ki, xoş intizm verdin,*
*Arayişini təmam verdin.*
*Etdin gərəyin gər az, gər çox,*

[1] Nəhcül-Bəlağə. xütbə 163
[2] İləluş-Səraye. səh. 607. hədis 81
[3] Nəhcül-Bəlağə. xütbə 109
[4] Ət-Tovhid. səh. 277. hədis 2

*Bir nəsnə gərəkdi yox ki, ol yox.*
*Bir növ ilə eylədin mühəyya,*
*Kim, gəldi qüsurdan mübərra.*
*Əşyada əgər ki, raz çoxdur,*
*Ol kim, ola razın onda yoxdur.*
*Əşya necə səndən olsun agah,*
*Əl-qüdrəti vəl-bəqaü lillah [11, s.25].*

*(O an ki, sarsılmaz bünövrə qoyub dünya düzəninin yazısını yazdın, doğrudan da xoşagəlimli bir quruluş verdin, bəzəyini mükəmməl etdin. Az-çoxluğundan asılı olmayaraq aləmə gərək olanları etdin. Elə bir gərəkli nəsnə yoxdur ki, olmamış olsun. Aləmi elə bir yolla hazırladın ki, qüsursuz ortaya çıxdı. Nəsnələrdə sirr çox olsa da, özündə sənin sirrini saxlayan nəsnə yoxdur. Nəsnələr səndən necə xəbərdar olsun? Güclü və qalarqı, əbədi olan yalniz Tanrıdır).*

Divaninin sonrakı iki misrasında isə müəllif Qurani-Kərimin nazil olması və onun əzəməti məsələsinə toxunur.

“Məhəmmədin ümmətinə göydən endi xoş kəlam, Eynimizdə gizli deyil, aşikardan danışaq” – hamımıza aydındır ki, Qurani-Kərim islam dininin ən böyük və başlıca mənbəyidir. Digər tərərfdən Quran səmavi kitabların sonuncusudur və mükəmməlliliyi, möcüzəvi xüsusiyyətləri, məna və məzmun dolğunluğu, insanı heyrətdə qoyan ruhi-mənəvi ağırlığı və əzəməti baxımından başqa heç bir kitabla müqayisə edilə bilməz. Şair “xoş kəlam” ifadəsi ilə bütün bu gözəllikləri və əzəməti çatdırmağa çalışmışdır.

Qurani-Kərimin necə nazil olması əhəmiyyəti və əzəməti haqqında ən gözəl açıqlamalar və biliklər elə Quranın

özündədir: “(Ya Peyğəmbər!) Həqiqətən, biz Quranı sənə tədriclə, (ayə-ayə, surə-surə) nazil etdik” (“İnsan”, 23).

“(Ya Peyğəmbər!) Əgər biz Quranı bir dağa nazil etsəydik sən onun Allahın qorxusundan (kiçildiyini) parça-parça olduğunu görərdin. (Halbuki, ağıl və ruh sahibi olan insan onun öyüd-nəsihətlərindən ibrət almır). Biz bu misalları insanlar üçün çəkirik ki, bəlkə düşünələr” (“Həşr”, 21).

“Həqiqətən, bu Quran (bütün bəşəriyyəti) ən doğru yola (İslama) yönəldir, yaxşı işlər görən möminlərə böyük bir mükafata nail olacaqları ilə müjdə verir” (“İsra”, 9).

“...Biz Quranı sənə hər şeyi (dini hökmləri, halal-haramı, günahı və savabı) izah etmək üçün müsəlmanlara (və ya Allahın vəhdaniyyətini qəbul edən bütün insanlara) da bir hidayət, mərhəmət və müjdə olaraq nazil etdik!” (“Nəhl”, 89).

“Əgər bəndəmizə (Rəsuluma) nazil etdiyimiz (Qurana) şəkkiniz varsa, siz də (fəsahət və bəlağətdə) ona bənzər bir surə gətirin və əgər (“bu, bəşər kəlamıdı” sözünü) doğru deyirsiniz, onda Allahdan savayı (bütün) şahidlərinizi (bütlərinizi, şair və alimlərinizi bu işdə köməyə) çağırın; Madam ki, belə bir işi bacarmırsınız, heç bacara da bilməzsiniz, o halda kafirlər üçün hazırlanmış, yanacağı (günahkar) insanlardan və kibrit daşlarından ibarət olan oddan (Cəhənnəmdən) həzər edin!” (“Bəqərə”, 23–24)

“(Sizə oxunan) Bu, (kəlam) çox qiymətli Qurandır; (O, Allah dərgahında) qorunub saxlanılan bir kitabdır (lövhü məvhuzdadır, yaxud lülələnib bükülmüş kağızlardadır); Ona yalnız pak olanlar toxuna bilər!” (“Vaqiə”, 77–79).

“Özlərinə Quran gəldiyi zaman onu yalan hesab edənlər (mütləq cəzalarına çatacaqlar) O, (Quran) şübhəsiz ki,

çox dəyərli (qiymətli) bir kitabdır; Nə öncə, nə də sonra batil ona yol tapa bilməz. (Şeytan onun bir sözünü, bir hərfini belə dəyişə bilməz). O, hikmət sahibi, şükrə (tərifə) layiq olan (bütün işləri bəyənilən Allah) tərərfindən nazil edilmişdir" ("Fussilət", 41–42).

Belə bir şanlı və möcüzəvi kitab qarşısında nəinki islam alimləri, müxtəlif dinə, millətə və irqə mənsub olan bir çox elm sahibləri öz heyrətlərini gizlədə bilməmiş, acizliklərini etiraf etmişlər. Bunu da qeyd edək ki, N.İman təhlil etdiyimiz son misralarında (Məhəmmədin ümmətinə göydən endi xoş kəlam, Eynimizdə gizli deyil, aşikardan danışaq) sanki bir ictimai etirazı da dilə gətirmişdir. Belə ki, Sovet hakimiyyəti İslam dininə və onun ehkamlarına, məscidlərə, möminlərə, ziyarətgahlara, Qurani-Kərim başda olmaqla bütün dini kitablara qarşı amansız mübarizə aparıb. Bu təbliğatla xalqımızın milli-dini dəyərlərini gözdən salmağa, aradan aparmağa çalışırdı. Zənnimizcə "Eynimizdə gizli deyil, aşikardan danışaq" – çağırışı bu təbliğata, bu mənasız mübarizəyə qarşı gənc bir aşığın etiraz səsi və qətiyyətli çıxışıdır.

Qurani-Kərimin əzəməti və ölməzliyi mövzusu bir çox sənəntkarlarımızın bədii yaradıcılığında əksini tapmışdır:

*Haqqdan, ədalətdən yaranıb Quran,*
*Yaşayıbdır, yaşayacaq hər zaman.*
*Milyon-milyon şahlar köçüb dünyadan,*
*Nə irsi yaşayır, nə də qanunu.*

*Əhməd, Qurandadır ədli-ədalət,*
*İnayət, şəfaət, mehri-məhəbbət.*

*Ustadlara rəhmət, şeytana lənət,*
*Qurandan müqəddəs bir qanun hanı? [13].*
*(Aşıq Əhməd Rüstəmov)*

***

*Əbcədi Allah yardıb "Be"yi binadan gözəl,*
*Səlavatın sahibidir nur üzü nurdan gözəl,*
*Kəlmə-kəlmə ayə enib, həqq Rəsulun şəninə,*
*Şər-İslamın tərbiyəsi, otuz cüzv Quran gözəl.*

*Oxuduqca nur çiləyir ayələrin danəsi,*
*Hesabatda dörd altıdır, yüz on dörddü xanəsi,*
*Böylə bir elmi dəryanın nurdandı pərşanəsi,*
*Onu münəvvər yaradıb, böyük Yaradan gözəl.*

*Ay Kamandar! Şər-İslamın tər dünyası kimdə var?*
*Turi-Sinanın hikməti, möcüzəsi kimdə var?*
*Merac evinin səfəri, Şah Mirzəsi kim də var?*
*Övliyalar, Ənbiyalar, Ol Qadir Sübhan gözəl.*
*(Aşıq Kamandar)*

***

*Dünya öz qoynunda tapandan nicat,*
*Allahın hökmüylə qurulmuş həyat.*
*Bu yer, bu asiman, külli-kainat,*
*Quranın otuz cüzv ayəsindədir [14].*
*(Kərəm Kürqıraqlı)*

***

*Gündə beş vaxt səcdəyə get, Şiruyə, eylə vəfa,*
*Məhşər günü sayə salar, eylər dərdinə dəva.*
*Yetəndə Merac evinə Məhəmməd əl-Mustafa,*
*Yeddinci qat göydə qoydu məleykəni Məhəmməd.*
*(Sərraf Şiruyə) [24, s.157]*

***

*Quran ayələrin Alah göndərdi,*
*Bu yolda qeyrətlə durdu Muhəmməd,*
*Diliylə söylədi incilər, dürlər,*
*Əliylə min naxış urdu Muhəmməd [14].*
*(Kərəm Kürqıraqlı)*

***

*Cani-mömin şadiman əz xandəni Quran buvəd,*
*Xandəni Quran bezahir canira canan buvəd [15, s.20].*
*(Şeyx Bəhayəddin Amuli)*

(Möminin canı, ruhu Quran oxumaqla şad olar. Quranı aşkar üzdən oxumaq cana can verər, aşiqi-məşuqə yetirər).

(Sətri tərcümə:
Quran oxumaqla möminlərin canı şad olar,
Quran oxumaq bədənin zahirinə də nur verər.
Hər kim öz övladına Quran öyrədə,
Qiyamət günü onun Behiştə getməyi asan olar).

***

*Heyf ola, səd heyf ola biz əhli Quran olmuşuq,*
*Bir quru addır, yalandan biz müsəlman olmuşuq.*
*(La ədri)*

***

*Quran sefate– caho-cəlale-Məhəmməd əst,*
*Ehkame-şər-şərhe kəmale-Məhəmməd əst.*
*(Məhəmməd Füzuli)*

*(Quran büsbütün Məhəmmədin (s) əzəmətini səciyyələn-dirdiyindən, şəriət hökmləri də onun kamilliyinin açımından ibarətdir).*

***

*Gah nəleyni – Muhəmmədlə verər ərşə bəzək,*
*Gah onun məsnədinə bir neçə heyvan gətirər.*
*(Hacı Zeynalabdin Şirvani)*

"Təmkin" təxəllüslü şair "Fələknamə"sinin bu beytində çatdırır ki, sonsuz qüdrət sahibi olan Allah-təala kainatın günəşi olan Həzrəti-Muhəmmədi meraca apararkən gah onun nəleyni (başmağı) ilə ərşi bəzəyir, gah da onun əyləşdiyi minbərə bəni-Üməyyənin (min ay (83 il 4 ay) ərzində hakimiyyətdə olmuş və "İsra" surəsin 60-cı ayəsində lənətlənən 14 bəni-Üməyyənin – xəlifəsi nəzərdə tutulur) xəlifələrini əyləşdirir.

***

*Xuda vəhy eylədi hər bir kəlamı Müstəfa üçün,*
*Dedi: Təfsir elə, elmin əsil meydanıdır Quran!*

*Bütün möminlərin qəlbindəki canandır Quran!*
*Nüzuli-həqdir çün, ümmətin dərmanıdır Quran!*

*Günəşdir ki, salıb nuri-kəlamın cümlə yer üzrə,*
*Cahan gülzarının ən ətrbar reyhanıdır Quran!*

*Açır hər hikmətin sirin bəşərçün sureyi – "İqrə",*
*Hər elmin, sənətin ən başlıca ünvanıdır Quran!*
*[16, s.27].*
*(Axund Hacı Soltan Hüseynqulu oğlu)*

Novrəs İman "Danışaq" rədifli divaninin üçüncü bəndində heç də yuxarıdakı məsələlərdən əhəmiyyətsiz olmayan mühüm mətləblərə toxunur:

*Yalan deyən hesab günü olacaqdı lal kimi;*
*Dili tutmaz, başı çəkər onda qilü-qal kimi;*
*Ölən vaxtı qarşımızda bizə var sual kimi;*
*Bağlı dildən, odlu gürzdən, dar məzardan danışaq*
*[3, s.127].*

Göründüyü kimi, burada Qiyamət günündən, Axirət aləmindən, sorğu-sualdan, qəbir əzabından söhbət açılır. Şair xüsusən, yalan, iftira söyləyən insanların daha çox əzaba düçar olacaqlarını göstərir. Söz yox ki, bu düşüncə tərzi birbaşa ayə və hədislərimizdən irəli gəlir: "...Belə olduğu təqdirdə, murdar, (başdan-ayağa murdarlıq olan) bütlərdən qaçın, yalan sözlərdən də (Allaha şərik qoşmaqdan da) çəkinin" ("Həcc", 30).

"Yalanı ancaq Allahın ayələrinə inanmayanlar uydururlar. Onlar əsl yalançılardırlar!" ("Nəhl", 105).

"...Allah yalançı, nankor olan kimsəni doğru yola müvəffəq etməz!" ("Zümər", 3).

“İsanın Allahın qulu və peyğəmbəri olması barədə sənə göndərilən elmdən (məlumatdan) sonra buna (İsanın əhvalatına) dair səninlə mübahisə edənlərə de: “Gəlin biz də oğlanlarımıza, siz də oğlanlarınıza; biz də qadınlarımıza, siz də qadınlarınıza; biz də özümüzü, siz də özünüzü (bura) çağıraq! Sonra (Allaha) dua edib yalançılara Allahın lənət etməsini diləyək!” (“Ali-İmran”, 61).

“...Əgər yalan deyirsə, Allah ona lənət eləsin!” (– deməlidir)” (“Nur”, 7).

“Ey iman gətirənlər! Etməyəcəyiniz bir şeyi niyə deyirsiniz? (Bəzi müsəlmanlar: “Hansı əməllərin Allaha daha xoş getdiyini bilsəydik, onları edər, malımızı və canımızı onların yolunda qoyardıq!” – deyirdilər. Lakin cihad əmri nazil olduqda bu, bir çox möminlərin xoşuna gəlmədi); Etməyəcəyiniz bir şeyi demək Allah yanında böyük qəzəbə səbəb olar” (“Səff”, 2–3)

Novrəs İman yalanın və yalançının timsalında bütün günahkarların ağır və çətin sorğu-suala çəkiləcəklərini təkidlə bildirir, insanları qəbir əzabı və axirət aləminin dəhşətli, dözülməz fiziki və ruhi-mənəvi cəza üsulları ilə qorxudaraq tərbiyə etməyə, azğınlıqdan, yalandan, zülmdən çəkindirməyə çalışır. Bu gücü, bu mənəvi qüvvəni isə ona verən yenə də müqəddəs kitabımızdır və onu göndərən Uca Yaradanımızdır. Nakam aşiq Novrəs İmanın bu ülvi niyyəti, bu narahat qəlb çırpıntıları müqəddəs kitabımızın qayəsi ilə necə də üst-üstə düşür:

“Bu gün heç kəsə heç bir haqsızlıq edilməyəcəkdir. Siz ancaq etdiyiniz əməllərin “cəzasını çəkəcəksiniz!” (“Yasin”, 54) “Bu gün Allaha and olsun ki, biz müşrik, kafir deyilik” – dediklərinə görə onların ağızlarını möhürləyərik.

Etdikləri əməllər (qazandıqları günahlar) barəsində onların əlləri bizimlə danışar, ayaqları isə şəhadət verər" ("Yasin", 65).

"Nəhayət, (müşriklərdən) birinin ölümü gəlib çatdığı zaman o, belə deyər: "Ey Rəbbim! Məni geri, (dünyaya) qaytar!" "Bəlkə, (indiyə qədər) zay etdiyim ömrümün müqabilində yaxşı bir iş görüm! (Yaxud bu günə qədər tərk etdiyim imana qayıdıb saleh bir əməl edim!) Xeyr, bu onun dediyi boş (faydasız) bir sözdür. Onların önündə dirilib (haqq-hesab üçün Allahın hüzurunda) duracaqları günə (Qiyamət gününə) qədər maneə, (öldükdən sonra Qiyamətə qədər qalacaqları bərzəx aləmi) vardır" ("Muminun", 99–100).

"İnsanların haqq-hesab vaxtı (qiyamət günü) yaxınlaşır. Onlar isə hələ də qəflət içindədirlər və (qiyamətə inanmaqdan) üz döndərirlər. (Qiyamət insanlar üçün nə qədər uzaq isə, Allah dərgahında bir o qədər yaxındır. Fani dünyaya, şan-şöhrətə meyl, varlanmaq həvəsi insanların başını elə qatmışdır ki, qiyamət günü barəsində əsla fikirləşmirlər).

Bu ayənin ətraflı təfsiri üçün "Nur" təfsirinə müraciət edək: "İnsanların əksəri məad və Qiyamət hesabından qəflətdə olduğu üçün Allah bu qəfləti bütün xalqa (insanlara) aid edir. Əlbəttə ki, bütün hallarda insanların bir qismi istisnadır. Hazırkı surənin 97-ci ayəsində insanlar qəflətdə olduqlarını öz dilləri ilə etiraf edirlər:

1. Bütün insanlar sorğu-suala çəkilər: odur ki, şübhəsiz, Biz həm Peyğəmbərlərin göndərildiyi kəslərdən soruşacağıq, və həm də peyğəmbərlərdən soruşacağıq" ("Əraf", 16).

2. Bütün əməllər hesaba çəkilər: "Və siz əməlləriniz barədə də mütləq sorğu-sual olunacaqsınız" ("Nəhl", 93).

3. Bütün hallar nəzərdən keçirilər: "Qəlbinizdə olanı aşikar etsəniz də, gizlətsəniz də Allah sizinlə onun hesabını aparacaqdır" ("Bəqərə", 284).

4. İnsanın hər bir bədən üzvü sorğuya çəkilər: "Qulaq, göz və ürəyin hər biri sorğu-suala tutulacaqdır" ("İsra", 36).

5. İlahi nemətlər haqqında soruşular: "Və siz əməlləriniz barəsində mütləq sorğu-sual olunacaqsınız" ("Nəhl", 93).

6. Bütün işlər harada olur-olsun, nə ölçüdə olur-olsun – səhnəyə gətirilər: "Bir xardal dənəsi ağırlığında olub, bir daşın içində, yaxud göylərdə və ya yerin təkində olmuş olsa" ("Loğman", 16).

Öncə namaz haqqında soruşular. Gənclik, ömür, qazanc yolu, xüsusilə rəhbərlik və vilayət kimi mühüm məsələlərin hesabı aparılar. Elə bircə bu yetər ki, Allah özü hesab aparsın. "Bizim haqq-hesab çəkən olmağımız kifayətdir" ("Ənbiya", 47).

Xalqla (insanlarla) hesab aparılması qəti bir məsələdir. Qiyamət və hesab vaxtının uzaq olmasını düşünməyək. Hesab bütün insanlara aiddir. Nizam və hesab kamil həyat şərtləridir. (İnsan təsadüfən yaranmayıb, məqsədli şəkildə vücuda gətirilib). İnsanların diqqətini cəlb etmək üçün bəzən sərt və hədələyici halda danışmaq lazım gəlir. İnsanlar qiyamət sorğusundan qəflətdə olsalar da bu sorğu özü onların sorağına gəlir. Etinasızlıqdan doğan qəflət təhlükəlidir [5, s.351–352].

Bu ayələrdən doğan ədəbi-bədii duyğu və düşüncələrə Aşıq Ələsgərin yaradıcılığında, həm də başqa şairlərimizin şeirlərində rast gəlmək olur:

*Xaliqindən utan, məndən utanma,*
*Şəcərətil-mövti heç səhl sanma.*
*Miyata qail ol, qafil dolanma,*
*Haqdı mizan, Sirat, qəbir əzabı [7, s.49].*
*(Aşıq Ələsgər)*

***

*Sirat-sual qabaqdadı, nə damaqdı dünyada?!*
*Kəlmeyi-şəhadət lazımdı ölən vaxtı dünyada.*
*Tut orucun, qıl namazın, şükr eylə Allaha,*
*Gül olma dünya malına, qaladaqdı dünyada [7, s.194].*
*(Aşıq Ələsgər)*

***

*Dünyada bina cahi-cəlal eyləmək olmaz,*
*Qəmxana olan mülkidə hal eyləmək olmaz.*

*Bidar olusan qəbrdə qəflət yuxusundan,*
*Onnan sora dünyanı xəyal eyləmək olmaz.*

*Seyyid, hərəmi-həşrdə Xaliq əməl istər,*
*Məhşərdə durub cəngi-cidal eyləmək olmaz [19, s.47].*
*(S.Ə.Şirvani)*

***

*Vaxt olar Əzrayıl alar canını,*
*Can çıxar cəsəddən sinaya sin, sin.*
*Vədə başa gələr, ömür qurtarar,*
*Düşərsən nəfəsdən sinayə sin, sin.*

*O dəmdə millətin olmaz nəfəsi,*
*Səs gələr: "Kim mənlə eylərdi bəhsi",*
*Bütün kainatın mənəm yiyəsi,*
*Rəbbiniz bil, mənəm sinayə sin, sin [20, s.54].*
*(Xəstə Qasım)*

Bu məsələlər Əhli-beyt (ə) xətti ilə bizə gəlib çatan hədislərdə də geniş yer tutur. Hədislərin birində deyilir ki, Əbu Bəsir İmam Sadiqin (ə) xidmətinə gəlir və Həzrətdən (ə) soruşur: "Kimsə qəbir əzabından qurtula bilərmi?". İmam (ə) cavabında buyurur: "Qəbir əzabından Allaha pənah aparıram. Ancaq az bir insan bu əzabı görməzlər". Qəbir aləminin ən mühüm hadisələrindən biri də qəbir əzabıdır. Belə ki, hədislərimizdən oxuyuruq ki, qəbir əzabı hamıya aiddir, ancaq çox az insandan başqa. Bəziləri üçün kəskin və bəziləri üçün mülayimdir. Qəbir əzabı günahların kəffarəsidir. "Məni yad etməkdən üz döndərən kəs üçün isə (qeyb aləmindən qırıldığı, nəfsi qane olmadığı, gözü doymadığı, arxalandığı dayaqlar süst olduğu və hadisələrdən qorxduğu üçün, var-dövləti çox olsa belə) mütləq sıxıntılı həyat olacaqdır və Qiyamət günü onu Məhşərə kor gətirərik" ("Taha", 124).

İmam Sadiq (ə) buyurur: "Allaha and olsun ki, mənim sizin üçün ən çox qorxduğum şey – Bərzəxdir". Əlbəttə

bəzi insanlar – Həzrəti-Peyğəmbər (s), İmamlar (ə) və möminlər qəbir əzabından istisnadırlar. Bəzi hədislərdə deyilir ki, yer möminlərin müştağındadır, həyatda olan zaman Allahın günahına batmırlar, Allahı özlərinə razı edirlər. Yer onları qəbul etməyə hazırdır. Onlara qarşı anadan da mehribandır. Bu cür insanlara qəbir əzabı olmaz. Hətta həqiqi möminlərin ki, ruhu alınmışdır, yeni mənzilə qədəm basıblar, razı və xoşhaldırlar. Allah, Peyğəmbər (s) və İmamlar (ə) ondan razıdırlar. Mələklər ona müjdə verərlər. "Ey (təqvanın kamalı sayəsində) arxayın olmuş nəfs (elə bir məqama yetişmiş nəfs ki, həvayi-həvəslər və şeytanlar onu azdırmağa qadir deyildir), Dön Rəbbinə, sən Ondan, O da səndən razı olaraq! Mənim bəndələrimin zümrəsinə daxil ol! Və Mənim Cənnətimə daxil ol!" ("Fəcr", 27–30). [18, s.127].

Novrəs İman "Danışaq" rədifli divaninin möhürbəndində də bu mühüm mövzunu davam etdirir:

*Bir gün olar, əcəl gələr, ağrı yetişər sərə;*
*Hər əməlin öz nəfinə yazılacaq dəftərə;*
*Vay halına bu dünyada qarışan böhtan şərə;*
*İman deyər, doğru yoldan, düz ilqardan danışaq*
*[3, s.127].*

İl iki misrada diqqəti çəkən əsas motiv "əməl dəftəri" (nameyi-əmal) anlayışıdır. İslami baxışlara görə hər bir insanın bu dünyada bütün yaxşı və pis əməlləri onun əməl dəftərinə qeyd olunur və Qiyamət günü sorğu-sual zamanı hazır şəkildə ona təqdim edilir. Əməl dəftərinin maddi və mənəvi mahiyyət, məzmun daşıması barəsində din alimləri

arasında da fərqli fikirlər mövcuddur. Lakin, burada əsas məsələ insanın yaxşı və pisliyindən asılı olmayaraq bütün əməllərini Allah dərgahında toplanması və müvafiq şəkildə dəyərləndirilməsidir.

Bu anlayışla bağlı müqəddəs kitabımızda olan ayələrdən bir neçəsini əziz oxucularımızın diqqətinə çatdırırıq: “Əməl dəftəri sağ əlinə verilən kimsə deyəcəkdir: Alın, əməl dəftərimi oxuyun!; Mən (dünyada ikən Qiyamət günü) öz hesabıma yetişəcəyimə (möhkəm) inanmışdım” (“Haqqa”, 19–10)

“Əməl dəftəri sol əlinə verilən isə deyəcəkdir: Kaş əməl dəftərim mənə verilməyəydi!; Hesabımın nə olduğunu bilməyəydim!” (“Haqqa”, 25–26).

“Kimin əməl dəftəri sağ əlinə verilmişsə, onunla yüngül haqq-hesab çəkiləcək və o, (Cənnətdəki) ailəsinin (yaxınlarının) yanına sevinclə qayıdacaqdır! Kimin əməl dəftəri arxa tərəfdən sol əlinə verilmişsə, o: “ay öldüm” – deyə şivən qoparacaq və Cəhəhnnəmə vasil olacaqdır” (“İnşiqaq”, 7–12).

“Biz hər bir insanın əməlini onun boynundan asır və Qiyamət günü (bütün əməmllərini) açıq kitab kimi qarşısına qoyarıq; (və ona belə deyərik:) Oxu kitabını. (Əməl dəftərini). Bu gün sən haqq-hesab çəkməyə, öz-özünə (özün öz əməllərinin şahidi olmağa) kifayətsən!” (“İsra”, 13–14).

“(Ya Peyğəmbər! O gün) Hər ümməti diz çökmüş, (yaxud bir yerə yığılmış) görəcəksən, hər ümmət öz (əməl) dəftərinə tərəf çağırılacaqdır. (Onlara belə deyiləcəkdir:) “Bu gün sizə (dünyada) etdiyiniz əməllərin əvəzi (mükafatı və ya cəzası) veriləcəkdir! Bu bizim kitabımızdır (sizin

əməl dəftərinizdir) O, sizin əleyhinizə haqqı deyər. Biz sizin etdiyiniz əməlləri (orada mələklərə bir-bir) yazdırmışıq!” (“Casiyə”, 28–29).

“Qiyamət günü hər kəsin əməl dəftəri qarşısına qoyulacaq. (Ya Rəsulum! O zaman) günahkarların orada (yazılmış) olanlardan qorxduqlarını görəcəksən. Onlar belə deyəcəklər: “Vay halımıza! Bu necə bir kitab imiş! O, bizim heç bir kiçik və böyük günahımızı nəzərdən qaçırmadan hamısını sayıb yazmışdır ki!” Onlar (dünyada) etdikləri bütün əməllərin (öz qarşılarında) hazır durduğunu görəcəklər. Rəbbin heç kəsə haqsızlıq etməz! (Hər kəs öz əməlinin cəzasını alacaqdır!)” (“Kəhf”, 49).

Ayəni şərh edərkən A.M.Şirazi yazır: Qiyamətdəki üç kitab. Quran ayələrinin məcmusundan belə qənaətə gəlmək olar ki, Qiyamətdə insanların üç cür kitabı (əməl dəftəri) olacaq. Birincisi, xilqətin əvvəlindən sona qədər bütün insanların əməllərinin qeyd olunduğu vahid bir kitab. “Kitab qoyulacaq!” cümləsi bütün insanların hesab-kitabının qeyd edildiyi vahid bir kitabın olacağından xəbər verir. İkinci kitab ayrı-ayrı ümmətlərin əməllərinin qeyd edildiyi kitabdır. “Casiyə” surəsinin 28-ci ayəsində hər bir ümmətin öz kitabına doğru çağırılacağı buyurulmuşdur. Üçüncü kitab ayrı-ayrılıqda hər bir insan üçün olan kitabdır. “İsra” surəsinin 13-cü ayəsində belə buyurulmuşdur: “Hər bir insanın əməllərini öz boynundan asdıq. Qiyamət günü o onun üçün qarşısında açıq şəkildə görəcəyi bir kitab çıxararıq”. Əlbəttə, nəzər nöqtəsi olan ayələr insanın əməllərinin bu kitablarda qeyd edildiyini göstərmələ yanaşı, onların əməllərinin təcəssüm edəcəyindən və görünəcəyindən xəbər verir. Bu dünyada dağınıq enerjilər formasında məhv olmuş

əməllər, əslində məhv olmamışdır. Müasir elmdə heç bir enerji maddənin yox olmadığını, davamı olaraq bir haldan başqa hala keçdiyini sübuta yetirir. Həmin gün bu itmiş enerjilər maddəyə çevriləcək və uyğun şəkillərdə təzahür etdiriləcəkdir. Gözəl əməllər gözəl şəkillərdə, pis əməllər isə çirkin və utanc verici şəkildə təzahür edib bizimlə birlikdə olacaq  [2, s.299].

Əməl dəftəri anlayışının poetik əksi ilə bağlı bədii parçalardan da misal gətirmək burada yerinə düşərdi:

*Dəftəri əmalimin xətti-xətadəndir siyah!*
*Qan tökər çeşmim, xəyal etdikcə hövli-məhşəri*

*Məhşəri əşkim verər seylabə, gər ruzi-cəza,*
*Olmasa məqbuli-dərgahin sirişkin gövhəri*

*Cövhəridir eşq bəhrinin, Füzuli, abi-çeşm;*
*Leyk bir gövhər ki, lütv-Həqq onadır müştəri.*

*[8, s.303].*
*(Məhəmməd Füzuli)*

*(Mənim əməl dəftərim günahlarımın yazısı qara olduğuna görə üzü qaradır. Odur ki, mən qiyamət qorxusunu düşündükcə gözümdən yaş deyil, qan tökülür. Əgər qiyamət günü mənim inci göz yaşlarım Sənin qatında heç bir dəyər qazanmasa, durmadan axıtdığım göz yaşlarım məhşər səhrasını selə-suya qərq edər. Füzuli, sevgi dənizinin incisi göz yaşıdırş Ancaq bu elə bir incidir ki, onun alıcısı Tanrı mərhəmətidir).*

və ya

*Biz düşdük öz əməllərimizdən bu günlərə,*
*Qoyma həmişəlik belə artsın məlalımız [8, s.29].*
*(Məhəmməd Füzuli)*

Sonuncu beyt "İnsanların öz əlləri ilə etdikləri pis əməllər üzündən suda və quruda fəsad, pozuntu əmələ gələr ki, Allah onlara etdikləri bəzi günahların cəzasını daddırsın və bəlkə onlar qayıtsınlar" (Rum, 41) ayəsi üzərində qurulmuşdur. Ayə isə çoxqatlı və çoxşaxəli səbəb-nəticə ardıcıllığı üzərində qurulduğundan poetik fikrin ifadəsi üçün olduqca əlverişlidir. Belə ki, ayədə suda və quruda əmələ gələn pozğunluğun insanların öz əlləri ilə qazandıqları günah səciyyəli və cinayət tərkibli əməlləri, bu əməllərin bəzi suçlulara görə verilmiş ilahi cəza, bu cəzanın isə son nəticədə Allaha – haqq yola qayıdışa yönəltmə ilə izah edilməsi, doğrudan da az-çox bədii istedadı olan şəxsi bir-birindən dərin, iti duyğu və düşüncələrin ağuşuna atmaya bilməz [12, s.228].

Son iki misrada isə

*Vay halına bu dünyada qarışan böhtan şərə;*
*İman deyər, doğru yoldan, düz ilqardan danışaq*

– əməl dəftərini necə saf-pak saxlamağın yolu göstərilir. Böhtan, şər, iftira kimi mənfi xüsusiyyətlər barəsində "Mənəvi gözəlliklər çeşməsi" adlı məqaləmizdə geniş məlumat vermiş, məsələnin dini-mənəvi köklərinə toxunmuşuq.

Burada həmin məsələnin başqa bir tərəfinə işarə etmək istəyirik.

Məlum olduğu kimi kütləvi informasiya vasitələrinin (KİV) misilsiz inkişafı əsrində yaşayırıq. Sözsüz ki, öz-özlüyündə bu müsbət bir haldır, son dərəcə faydalıdır. Ancaq, bəzi televiziya, radio və internet kanallarında söz azadlığı anlayışından istifadə edənlər böhtan, iftira, qeybət, yalan, başqalarına şər atmaq kimi qeyri-insani xüsusiyyətləri geniş yayır, sanki, bunu təbliğ etməyə çalışırlar. Bu, bir sıra hallarda milli, dini, mənəvi-əxlaqi dəyərlərimizin aşınmasına, nəinki ailələrin dağılmasına, hətta, cəmiyyətin mənasız və məqsədsiz söz -söhbətlərə görə parçalanmasına, əsl ictimai-tarixi problemlərdən uzaq düşməsinə səbəb olur. Bu baxımdan Novrəs İmanın yuxarıdakı fikirləri bu gün də aktuallığını itirməmişdir. Təsadüfi deyil ki, aşıq böhtan və şərə qarşı “doğru yol”u və “düz ilqar”ı qoyur. Şairə görə həqiqi islam və insanlıq yolunu tutan, verdiyi sözə, kəsdiyi çörəyə, imzaladığı sənədə xəyanət etməyən şəxslər Allahın mərhəmətinə və insanların sevgisinə layiq ola bilərlər. Bu duyğu aləmi və düşüncə tərzi çağdaş Azərbaycan gəncliyinin doğru-düzgün tərbiysi, həyatın ən çətin anlarında ağı qaradan, xeyri şərdən seçə bilmələri üçün son dərəcə əhəmiyyətlidir. Novrəs İmanın və digər sənətkarlarımızın da görmək istədikləri əsl Azərbaycan gəncliyi budur.

**Ədəbiyyat:**

1. Qurani-Kərim. (Ərəb dilindən tərcümə edənlər: Z.M.Bünyadov, V.N.Məmmədəliyev). Bakı, 2005
2. Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017
3. Novrəs İman. "Seçilmiş əsərləri". (toplayıb tərtib edəni: İslam Ələsgər). Bakı, "Səda", 2004
4. Yunis İmrə. "Güldəstə". Bakı, "Yazıçı", 1992
5. Möhsün Qiraəti. "Nur təfsiri". XII cild. (tərcümə: Hacı Arzu). Bakı, "Nurlar", 2015
6. Şah İsmail Səfəvi (Xətai) külliyyatı. Qəzəllər, qəsidələr, nəsihətnamə, dəhnamə, qoşmalar. (Tərtibatçısı: Mirzə Rəsul İsmailzadə). Bakı, Əlhuda, 2004
7. Aşıq Ələsgər. Əsərləri, dastan-rəvayətlər, xatirələr. Bakı, "Şərq-Qərb", 1999
8. Məhəmməd Füzuli. "Seçilmiş əsərləri". Bakı, "Yazıçı", 1984
9. Mirzə Ələkbər Sabir. "Hophopnamə". Bakı, "Yazıçı", 1982
10. Hacı Ələmdar Mahir. "Füzuli qəzəllərinin şərhi". 3 cilddə. I cild, Bakı, "Elm və təhsil", 2012
11. Vərağa Almasov. "Füzuli "Leyli və Məcnun"un islami mahiyyəti". Bakı, "Elm", 2006
12. Vərağa Almasov. "Həzrəti-Əli (ə) aşiqi Füzuli". Bakı, "Çaşıoğlu", 2010
13. Aşıq Əhməd. "İtən sazım". Bakı, 1995
14. Kərəm Kürqıraqlı. "Sayası Haqdan, mayası eldən". Bakı, 1994
15. Şeyx Bəhayəddin Amuli. "Tənbiyhil-Ğafilin" (Yatmışları oyadan).
16. Axund Hacı Soltan Hüseynqulu oğlu. "Məsumnamə". Bakı, "Ozan", 1999

17. Axund Hacı Soltan Hüseynqulu oğlu. "Azərbaycan dərvişləri və rövzəxanları". Bakı, "Boz Oğuz", "Nicat", 1995
18. Hacı Həsən Hüseyni. "Əhli-beyt (ə) aşiqi Dədə Ələsgər". Bakı, "İmza", 2022
19. S.Ə.Şirvani. "Seçilmiş əsərləri". 3 cilddə, I cild. Bakı, 1967
20. Xəstə Qasım. "46 şeir". Bakı, "Gənclik", 1975
21. İslam Ələsgər. "Novrəs İman" // Novrəs İman. "Seçilmiş əsərləri". (toplayıb tərtib edəni: İslam Ələsgər). Bakı, "Səda", 2004
22. Axund Hacı Soltan Hüseynqulu oğlu. "Gizli xəzinələrdən incilər". Bakı, "Tural-Ə" NPM, 2002
23. Hacı Həsən Hüseynov. "Həzrət Əli (ə) müxtəlif baxışlarda". Bakı, "Nərgiz", 2011
24. Sərraf Şiruyə. "Susma, ürək...". Bakı, "SkyG", 2015

*Hamı xəlq olunub bir qətrə sudan,*
*Hər yetən gədaya xan demək olmaz.*
*Yatıb, qəflətdədi, qalxmaz yuxudan,*
*Nalayiq insana can demək olmaz.*

*Gün xoş keçsə, ömür başın tacıdı,*
*Taleyim kəc gəldi, bəxt qıyqacıdı.*
*Bir tənə söz zəhrimardan acıdı,*
*Qanmayan nadana qan demək olmaz.*

*Düz çıxar həmişə mərdin ilqarı,*
*Müxənnətin olmaz heç etibarı,*
*Yığar qaynağına şah mardan arı,*
*Çəkməsə nizama, şan demək olmaz.*

*Əyri olan bilməz yolu, ərkanı,*
*Saxlayar könlündə şəri, böhtanı,*
*Bədəsil tanımaz yaxşı, yamanı,*
*Namərd süfrəsinə nan demək olmaz .*

*İman yad ellərdə candan usanı,*
*Hərcayi sözlərdən hər dəm utanı.*
*Hər gündə cəsədi bir qədər yanı,*
*Ləhzədə alışıb yan demək olmaz.*

# MƏNƏVİ GÖZƏLLİKLƏR ÇEŞMƏSİ

*Bismillahir-Rəhmanir-Rəhim!*
*Ya Allah ya Rəsul ya Əli səndən mədəd!*

XX əsrin ilk yarısında yaşayıb-yaratmış tanınmış aşıqlarımızdan biri də Novrəs İmandır. Onun yaradıcılığını nəzərdən keçirərkən əsas etibarilə aşağıdakı mövzulara toxunduğunu görürük: Mənəvi-əxlaqi fəzilətlər və rəzalətlər; Həzrəti-Məhəmmədin (s) və onun pak Əhli-beytinin (ə.m) tərənnümü, Tövhid, Qiyamət, Quran, Nübuvvət, Merac və başqa bir çox dini anlayışların ədəb-bədii açılışı, öz nakam taleyindən və zəmanənin sosial-ictimai problemlərindən şikayətlənmə və c. Bu məqaləmizdə şairin daha çox insanın ruhi-mənəvi və sosial-əxlaqi üsütünlüklərindən bəhs edən "Demək olmaz" rədifli qoşması haqqında söhbət açacağıq:

*Hamı xəlq olunub bir qətrə sudan,*
*Hər yetən gədaya xan demək olmaz.*
*Yatıb, qəflətdədi, qalxmaz yuxudan,*
*Nalayiq insana can demək olmaz [3, s.35].*

Novrəs İman qoşmaya insanın yaradılışı barəsində islami görüşləri önə çəkməklə başlayır. Burada "bir qətrə su" dedikdə "nütfə" (sperma) nəzərdə tutulur. Bu dünyagörüşünün söykəndiyi yer söz yox ki, müqəddəs kitabımız Qurandır: "Həqiqətən, Biz insanı (sonrakı mərhələdə ata-anasının toxumundan ibarət) qarışıq bir nütfədədn yaratdıq. Biz onu (dünyada özünü necə aparacağı, hər şeyin Xaliqi olan Allaha itaət edib-etməyəcəyi ilə) imtahana çəkəcəyik. Biz onu eşidən, görən yartdıq" ("İnsan", 2).

“Biz, həqiqətən, insanı tər-təmiz (süzülmüş) palçıqdan yaratdıq. (Biz Adəmi torpaqdan, Adəm övladını isə süzülmüş xalis palçıqdan – nütfədən xəlq etdik); Sonra onu (Adəm övladını) nütfə halında möhkəm bir yerdə (ana bətnində) yerləşdirdik”; Sonra nütfəni laxtalanmış qana çevirdik, sonra laxtalanmış qanı bir parça ət etdik, sonra o bir parça əti sümüklərə döndərdik, sonra sümükləri ətlə örtdük və daha sonra onu bambaşqa (yeni) bir məxluq olaraq yaratdıq. Yaradanların ən gözəli olan Allah nə qədər (uca, nə qədər) uludur!” (“Möminin”, 12, 13, 14)

“Elə isə insan nədən yaradıldığına (bəsirət gözü ilə) bir baxsın. O, axıb tökülən bir sudan (nütfədən) yaradılmışdır; (O, su kişilərin) Bel sümüyündən (qadınların isə) köks sümüyündən şıxar!” (“Tariq”, 5, 6, 7).

“(Bu təkəbbür onda haradahdır? Allah) Onu hansı şeydən yaratdı? (Allah onu bir qətrə dəyərsiz) nütfədən yaratdı, ona biçim verdi” (“Əbəsə”, 18, 19).

Bir çox görkəmli sənətkarların əsərlərində bu ayələrin bədii əksini görə bilərik:

*Qətreyi-abi – mənin, dər səbəti hər nigar,*
*Dürrü süxən quşəvət, qüdrəti Pərvərdigar [5].*
*(Sədi Şirazi)*

*(Bir qətrə su bir nigarın bətnində gəli söz danışan bir dürrə çevrilir. Bu Allahın qüdrətidir).*

***

*Allah səni unutmadı, öz ananın bətnində,*
*Ki, huşsuz və hissis olan bir nütfeydin o zaman.*
*Belə yazıq vəziyyətdə, qaranlıq bir güşədə,*
*Əta etdi sənə: əql, nitq, şüur, camal, can.*

*Əllərində yaradı o, xoş düzülmüş on barmaq,*
*İki güclü qol düzəldib asdı iki yanından.*
*Ey himmətsiz indi necə xəyalına gəlir ki,*
*Gün keçdikcə unudacaq səni Böyük Yaradan! [5].*
*(Sədi Şirazi)*

Novrəs İman bütün insanların bir damla sudan, (nütfədən) yaradıldığını söyləməklə həm də onların arasında bərabərliyin, ictimai ədalətin vacib olduğuna da işarə etmişdir. “Hər yetən gədaya xan demək olmaz” – misrası yaradılış baxımından eyni olan insanların bir-birinə münasibətdə təkəbbürə, zülmə, özbaşınalığa yer verməsini ilahi ədalətdən kənar olduğunun ədəbi-bədii təsdiqidir. “Gəda” və “xan” antonimlərindən istifadə bu fikrin daha güclü poetik əksinə imkan yaradır. Son iki misradakı “Yatıb, qəflətdədi, qalxmaz yuxudan, nalayiq insana can demək olmaz” – cəhalət, qəflət yuxusuna getmiş nalayiq insan obrazı da bu fikirlərin fərdi və ictimai həyatımızdakı canlı mücəssəməsidir. Şair demək istəyir ki, cahil və etinasız, ləyaqətsiz şəxslərdən fərqli olaraq düşünüb-daşınan, bəsirətli, ləyaqət sahibi insanlar yalnız əzizlərini, öz şəxsi maraqlarını deyil, cəmiyyətin, yaşadıqları Vətənin, daha geniş götürsək, bütün bəşəriyyətin mənafeyini – ictimai ədaləti, iqtisadi bərabərliyi, mənəvi-psixoloji nizamı bərpa etməli, qorumalıdırlar.

*Gün xoş keçsə, ömür başın tacıdı,*
*Taleyim kəc gəldi, bəxt qıyqacıdı.*
*Bir tənə söz zəhrimardan acıdı,*
*Qanmayan nadana qan demək olmaz [3, s.35].*

İlk iki misrada Novrəs İman dillərdə dastan olmuş acınacaqlı taleyindən, keşməkeşli ömür yolundan söz açır: Deyilənlərə görə, gənc aşıq sevdiyi bir qızla nişanlanır, ancaq, qardaşı Qurbanın ölümü onun həyatını büsbütün dəyişir. Atası Məşədi Salehin və əmisi Aşıq Ələsgərin təkidli məsləhətləri ilə nişan geri qaytarılır və gənc İman qardaşının xanımı Gülnisə (o, Aşıq Ələsgərin qızı idi) ilə evlənməyə vadar edilir. Bunu özü üçün şərəfsizlik, ləyaqətsizlik bilən İman dəfələrlə evdən qaçır, lakin zorla geri qaytarılır. Rəvayətlərə görə, onu sonuncu dəfə 1932-ci ildə Kərbəlada görənlər olmuşdur. O zamandan etibarən Novrəs İman barəsində heç bir məlumat yoxdur və qəbrinin yeri də məlum deyil [16, s.11].

Bu ağır, faciəvi taleyin bədii əks-sədası aşığın bir çox başqa şeirlərində də görünür:

*Əziz ata, itkin düşən fərzəndin,*
*Ağla hey düşəndə yada, doyunca.*
*Mənim gərdənimdə çarx kəməndini,*
*Dolandırar bu dünyada, doyunca.*

*Məndən dost-qohuma azca gileylə,*
*Dalımca na qarğa, nə hədyan söylə.*
*Əl götür duaya, münacat eylə,*
*Bəlkə yetəm bir murada, doyunca.*

*Halal qıl İmanı, qohum-qardaşım,*
*Çeşmim ağlar, qaranlıqdır günəşim.*
*Əgər bir İlahi düzəltsə işim,*
*Şad olaram Kərbalada, doyunca [3, s.39–40].*

***

*Əzəl gündən bu qurqular qurulub,*
*Yad ellərdə nə bir hakim sorulub.*
*Ürəyimə yaman yara vurulub,*
*Məlul könlüm onçu ahu zar eylər.*

*Dərd gəlməsin heç iyidin başına,*
*Toxunmasın qəlbi zülmət daşına!*
*İman necə dözsün qəm ataşına,*
*Yaxından məskənin dar məzar eylər [3, s.44].*

***

*Arif əhli, bir söz deyim, qınama,*
*O zaman ki, bu dünyanı gəzirdim,*
*Həsrət oldum elə, ata-anama,*
*Dolandırıb yazıx canı gəzirdim.*

*Nagahdan bəlaya tuş oldu sərim,*
*Axtarmadı, qohum-qardaş, ellərim,*
*Könül qəmli, qanlı yaşlı gözlərim,*
*Seyr eyləyib gülüstanı gəzirdim [3, s.51–52].*

İkinci bəndin son misralarında (Bir tənə söz zəhrimardan acıdı, qanmayan nadana qan demək olmaz) başqalarına istehza etmək, onları məsxərəyə qoymaq, nadanlıq, cəhalət kimi mənfi xüsusiyyətlər tənqid olunur. Hamımıza bəllidir ki, islam humanizm, insanpərvərlik, mənəvi ləyaqət, diqqət və qayğıkeşlik dinidir. Məhz, buna görə də şanlı Quranımızda başqalarını lağa qoymaq, tənə etmək, kiməsə yuxa-

rıdan aşağı baxmaq kimi əxlaqi çatışmazlıqlar dönə-dönə pislənilir.

"Ey iman gətirənlər! Bir qövm digərini lağa qoymasın. Ola bilsin ki, onlar (lağa qoyulanlar) o birilərindən (lağa qoyanlardan Allah yanında) daha yaxşı olsunlar. Qadınlar da bir-birinə (rişxənd eləməsinlər) bəlkə onlar (rişxənd olunanlar) o birilərindən (rişxənd edənlərdən) daha yaxşıdırlar. Bir-birinizə tənə etməyin (ayıb tutmayın) və bir-birinizi pis ləqəblərlə (ey kafir, ey fasiq, ey münafiq və i.a.) çağırmayın. İman gətirdikdən sonra fasiq adını qazanmaq necə də pisdir. Məhz, tövbə etməyənlər zalimlərdir. (Özlərinə zülm edənlərdir!)" ("Hucarat", 11).

"Könüllü surətdə (bollu) sədəqə verən möminlərə tənə edənlərin və güc-bəla ilə əllərinə düşənləri təsəddüq edən kəsləri məsxərəyə qoyanları Allah Özü məsxərəyə qoyacaqdır. Onlar şiddətli bir əzaba düçar olacaqlar" ("Tövbə", 79)

"(Dalda) Qeybət edib (üzdə) tənə vuran hər kəsin vay halına!" ("Huməzə", 1)

İlk ayənin "Hucarat"–11 təfsirində oxuyuruq: "Başqalarına çirkin adlar qoymaq və bu vasitə ilə onları təhqir etmək, şəxsiyyətlərinə ləkə gətirmək, bu vasitə ilə onlardan intiqam almaq keçmiş və indiki dövrün əxlaqdan kənar adamlarına xas xüsusiyyətlərindəndir. Əgər bir adam keçmişdə pis bir iş tutubsa, sonra tövbə edib tamamilə təmizlənibsə, islam onun keçmişdəki əməlini ifadə edən adla çağırılmasını, ona "sən filan günah əməlin sahibi idin" deyilməsini, ata və analarının səhvlərinə görə məzəmmət edilməsini, "sənin atan və ya anan filan əməlin sahibidir" deyilməsini, müsəlmanın təhqir edilməsinə səbəb olacaq ən ki-

çik eyhamın işlədilməsini qadağan edir. Hədislərin birində deyilir ki, Xeybər döyüşündən sınra islamı qəbul etmiş və Peyğəmbərin (s) zövcəsi olmuş Səfiyyə binti Həyy ibn Əxtəb bir gün ağlaya-ağlaya Peyğəmbərin yanına gəlir. Peyğəmbər (s) nə baş verdiyini soruşduqda, o: "Aişə mənə rişxəndlə: "Ey Yəhudi balası!" – dedi! " – deyə şikayətlənir. Peyğəmbər (s) ona deyir: "Nə üçün demədin ki, atam Harun, əmim Musa, həyat yoldaşımdır Məhəmməd". Bu zaman sözügedən ayə nazil olur [2, s.516].

Ustad A.M.Şirazi "Tövbə" surəsinin 79-cu ayəsinin aşıqlanmasında da müəyyən qədər bu məsələyə toxunur: "Mənbələrin yazdığına görə Peyğəmbər (s) islam ordusunu düşmənlə mübarizəyə (ehtimal ki, Təbuk döyüşünə) hazırladığı vaxt camaatın köməyinə ehtiyac duyulduğunu görür. Buna görə də fikrini camaata elan etdikdə imkanı olanlar islam ordusuna zəkat adı ilə və ya heç bir əvəz olmadan küllü miqdarda yardımlar göstərdilər. Gəlirləri az olan bəzi müsəlmanlar da az da olsa, bu böyük islam proqramına yardım göstərdilər. Lakin münafiqlər hər iki dəstəyə eyb tuturlar. Çox yardım göstərənləri riyakar adlandırır, az yardım edənləri isə məsxərəyə qoyaraq "islam orusunun belə bir yardıma ehtiyacımı var?" – deyə istehza edirlər. Bu və sonrakı ayə nazil olur və onları ciddi şəkildə qınayır" [2, s.199].

İstehza etmək, eyb axtarmaq, məsxərəyə, lağa qoymaq və bu kimi mənəvi rəzalətlər hədislərdə və el-oba deyimlərimizdə də kəskin ifşa olunur:

Həzrəti-Peyğəmbər (s) buyurur: "Xoş olsun o kəsin halına ki, öz eybi, mömin qardaşlarının eybini axtarmaqdan saxlayar".

İmam Əli (ə) buyurur: “Eyb axtarmaq – ən çirkin eyblərdən və ən pis günahlardandır”. “Sənin üçün ən mənfur insan, ən uzaq insan o kəs olmalıdır ki, hamıdan çox insanların eybini axtarar”.

“Ən üstün insan – o kəsdir ki, öz eybləri onu başqalarının eyblərini axtarmaqdan saxlayar”.

“O kəs ki, başqalarının eyblərini axtarmaq ardıncadır, gərək özündən başlasın”.

“Ən aqil insan o kəsdir ki, öz eyblərinə qarşı ayıq, başqalarının eyblərinə qarşı kor olar”.

“O kəs ki, öz eybini görər, başqalarının eybini axtarmaqdan dayanar”.

“Hər kim öz büdrəməsini görər, başqalarının büdrəməsi onun nəzərində kiçik olar”.

İmam Sadiq (ə) buyurur: “Nə zaman görsəniz ki, bəndə başqalarının eyblərini axtarır və öz günahlarını yadından çıxartmışdır – bilin ki, İlahi məkrə giriftar olmuşdur”.

“İnsan üçün ən faydalı şey odur ki, başqalarından daha tez öz eyblərini islah etməyə çalışar”.

İstər Novrəs İmanın öz şeirlərində, istərsə də bir çox başqa sənətkarlarımızın əsərlərində bu çirkin sifətlərin poetik ifası ilə qarşılaşırıq:

*Üz vermə nadana, sirr vermə pisə,*
*Bir gün nəzərindən salacaq səni.*
*Özgənin malına gözünü dikmə,*
*Dərin dəryalara dalacaq səni.*

*Halalı unudub, harama qaçma,*
*Haqqın düz yolunu unutma, çaşma,*

*İman deyər, şər-böytana qarışma,*
*Qarışsan da bir gün tapacaq səni [3, s.87].*
*(Novrəs İman)*

***

*Halal ye, tərlantək halal ov ara,*
*Bənzəmə leş üstə qonan quşlara.*
*(Nizami Gəncəvi)*

***

*Namərd ilə yoldaş olma,*
*Uzun ağrı çəkər başın.*
*Halal ilə ərsəyə çat,*
*Daş-qalalar sökər başın [17, s.28].*
*(Miskin Abdal)*

***

*Nakəs adam danışıqnan saz olar,*
*Kərəmdən kəm, səxavətdən az olar.*
*Nütfədən qarışan şeyitbaz olar,*
*Mərd də sığışdırmaz, nahaq qan eylər [10, s.31].*
*(Aşıq Ələsgər)*

"Qanmayan nadana qan demək olmaz" – deyərkən Novrəs İman bir tərəfdən nadanlığı, cəhaləti tənqid edirsə, digər tərəfdən əqli inkişafa, elmi dünyagörüşünə çağırır. Qurani-Kərimdə oxuyuruq: "Tövrata əməl etməyə mükəlləf olduqdan sonra ona əməl etməyənlər (Tövrata yükləndikdən sonra onu daşımayanlar, Tövrata iman gətirdikdən, onu oxuyub öyrəndikdən sonra hökmlərini lazımınca yerinə

yetirməyənlər) belində çoxlu kitab daşıyan(lakin onların içində nə yazıldığını bilməyən, onlardan faydalanmağı bacarmayan) ulağa bənzərlər. Rəsulun (s) həqiqi peyğəmbər olmasına dair bu (Allahın ayələrini yalan sayanlar barədə çəkilən məsəl necə də pisdir!) Allah zalım (kafir) qövmü doğru yola yönəltməz" ("Cümə", 5).

"Məgər axirətdən qorxan, Rəbbinə, (Allahın mərhəmətinə) ümid bəsləyən, gah səcdəyə qapanıb, gah da ayaq üstə durub gecə saatlarını ibadət içində keçirən (müti bəndə kafirlə birdirmi?)! De: "Heç bilənlərlə bilməyənlər (alimlə cahil) eyni ola bilərmi?! (Allahın ayələrindən dəlillərindən) yalnız ağıl sahibləri ibrət alar!" ("Zümər", 9).

"Yadınıza gətirin, o vaxt ki, Musa öz qövmünə: "Allah sizə bir inək kəsməyinizi əmr edir!" – dedi. Onlar isə: "Bizi məsxərəyəmi qoyursan?"– dedilər. Musa da: "Allah özü məni cahil olmaqdan saxlasın!" – dedi ("Bəqərə", 67).

"İnsanların, (Yer üzündə gəzən) heyvanların və davarların da bu cür müxtəlif rəngləri vardır. Allahdan öz bəndələri içində ancaq alimlər qorxar. (Onlar elm sahibləri olduğu üçün Allahın vəhdaniyyətini, heybət və əzəmətini daha yaxşı başa düşür və Ondan daha çox qorxurlar) Həqiqətən, Allah yenilməz qüvvə sahibidir, (möminləri) bağışlayandır" ("Fatir", 28).

"Heç kəs Allahın izni olmadan iman gətirə bilməz (Buna görə də əbəs yerə özünü yorma). Allah (Özünün öyüd nəsihətlərini, hökmlərini) anlamayanları əzaba (kəsavətə) düçar edər" ("Yunis", 100).

Din böyüklərimizin bir çox kəlamları da bu ayələrlə yaxından səsləşir:

Peyğəmbər (s) buyurur ki, müdriklər deyiblər: "Elmin əvvəli sükutdur, sonra dinləməkdir. Sonra yadda saxlamaqdır; sonra əməl etmək, sonra yaymaq və nəşr etməkdir. Hər elm yazılmasa, zay olar".

Elmin əvvəli Allahı tanımaqdır, sonu isə işləri Allaha tapşırmaqdır.

Bir nəfər 7 yaşlı uşağını Peyğəmbərin (s) yanına gətirib deyir: "Ya Rəsulullah (s), buna elm öyrət".

Peyğəmbər (s) soruşur: "Bu uşağın neçə yaşı var?"

Həmin şəxs cavab verdi: "7 yaşı var"

Peyğəmbər (s) buyurdu: "7 il gecikmisən, Mən demişəm, elmi beşikdən ta qəbr evinəcən tələb edin".

Həzrəti-Əli (ə) buyurur: "İnsanlar 4 taifəyə bölünür:

1. Üməra – hökmdarlar,
2. Əğniya – dövlətlilər,
3. Füqəra – kasıblar,
4. Üləma – alimlər.

"Hökmdarların, dövlətlilərin, kasıbların alimlərə ehtiyacı var. Alimlər isə onlara möhtac deyil".

Bir gün Bəsrə və Kufə əhli arasında mübahisə düşdü. Bəsrə əhli dedi: "Elm mal-dövlətdən əfzəldir".

Kufə əhli dedi: "Mal-dövlət elmdən əfzəldir".

Bu iki dəstə Həzrəti-Əlinin (ə) yanına gəlib, ondan sual etdilər. Həzrəti-Əli (ə) buyurdu: "Elm iki dərəcə mal-dövlətdən üstündür:

1. Elm peyğəmbərlərdən, mal-dövlət isə Qeysər və Firondan mirasdır.
2. Elm sahibini qoruyar, malı isə sahibi qorumalıdır.
3. Elm sahibinin dostu, mal sahibinin düşməni çox olar.
4. Elm xərcləndikcə artar, mal isə azalar.

5. Elm sahibi şərəfli ünvan və möhtərəm adlar, mal sahibi isə "simic" və "xəsis" kimi adlar qazanar.

6. Elmin oğrudan qorunmasına ehtiyacı yoxdur, malın isə qorunması vacibdir.

7. Vaxt keçdikcə elm cilalanıb işıq saçar, mal, dövlət isə çürüyüb məhv olar;

8. Elm qəlbi qüvvətləndirər, mal isə zəiflədər;

9. Elm təvazökarlıq yaradar, mal isə məğrurluq.

10. Elm insanda mərhəmət yaradar, mal isə xəbislik.

11. Elm sahibi qiyamət günü Siratdan keçər, mal sahibini isə orada saxlarlar.

12. Heç bir elm sahibi Allahlıq iddiası etməz, amma mal sahibi Allahlıq iddiası edər, necə ki Firon etdi.

Bu məsələ haqqında mübahisə edən Kufə və Bəsrə əhli Mövla Əliyə (ə) təşəkkür edib, razılıqla oradan qayıtdılar.

Allah-təala bizə elm öyrənməyi və Ona itaət etməyi vacib buyurub, cahillikdən və günahdan uzaq olmağı əmr edib.

Şair gözəl deyib:

*Cahil qala bir kəs, necə insafə rəvadır,*
*Cahil qalanın hər işi nöqsanü xətadır.*
*Aləmdə işıq alimin elmilə ziyadır,*
*Həm rahi-hidayətdə qalanlar üləmadır.*

Doğurdan da, aləmdə çox şeylər elmin işığı ilə icad olub. Alimin elmi ilə (elektrik) yaranıb, təxminən 300 il bundan əvvəl hələ elektrik kəşf olunmamışdan neçə əsr əvvəl yaşamış, möminlər ağası Həzrəti-Əli (ə) elektrik haqda özünün "Divani-Əmir"ində bizə xəbər verir.

Bir gün bir yəhudi alim (riyaziyyatçı) Həzrəti-Əlinin (ə) yanına gəlib, sual etdi. "Ey bütün elmləri dirildə bilən İmam! Elə bir ədəd de ki, 1-dən 10-a qədər bütün rəqəmlərə bölünsün və qalıqsız qalsın."

Həzrəti-Əli (ə) ondan soruşdu ki, əgər verdiyin sualın cavabını desəm, İslamı qəbul edərsənmi?

Yəhudi alim cavab verdi : Əlbəttə, qəbul edərəm.

Həzrəti-Əli (ə) bir ayağı yerdə, o biri ayağı elə üzəngidə buyurdu:

Sən həftənin günlərini vur çevrənin tam dərəcəsinə. Və o biri ayağını da üzəngiyə keçirib atına süvar oldu.

Yəhudi alim 7-ni 360-a vurub 2520 ədədini aldı. Sonra yenə öz fikrində hesabladı.

2520 : 1 = 2520
2520 : 2 = 1260
2520 : 3 = 840
2520 : 4 = 630
2520 : 5 = 504
2520 : 6 = 420
2520 : 7 = 360
2520 : 8 = 315
2520 : 9 = 280
2520 : 10 = 252

Yəhudi alim heyrət içində qışqırdı: "Ey həqq olan alim, İmam, mən İslamı qəbul edib müsəlman oldum və şəhadət verirəm: "Əşhədu ənla ilahə illəllah və Əşhədu ənnə Muhəmmədən Rəsuləllah. Və əşhədu ənla əmirəl-muminun Əliyyən vəliyullah".

Həzrəti-Əli (ə) İslamı qəbul etmiş şəxsə yenidən buyurdu: “Dünyadə zahidlər o kəslərdir ki, etdikləri nəsihətə özləri də əməl edərlər, xalqı Allahın qəzəbindən çəkindirib, özləri də çəkinərlər, başqalarını şəriətə əməl etməyə çağırarlar, özləri də əməl edərlər. Düzgün nəsihət vermək özü də bir əməldir. Elm iki cürdür: biri dil ilə deyilir ki, onun sahibi üçün hüccət və dəlildir. O biri isə qəlb ilə ifadə olunur ki, o da ona əməl edən şəxsə xeyir verir. İman isə arzu ilə deyil, qəlbdə sabit olmaqla və bədən üzvlərilə əmələ gətirməklə hasil olur. Fəhmsiz (düşüncəsiz) o şəxsdir ki, öz elminə əməl etməz”.

İmam Əli (ə) buyurur: “Elm öyrənin və elmi helmlə, vüqarla birlikdə öyrənin. Həqiqətən, elm möminin dostu, helm isə vəziridir.

“Elm öyrəndiyiniz, həmçinin öyrətdiyiniz hər bir şəxsə qarşı təvazökarlıq edin”.

“Həyat (dirilik) elm ilədir”.

“(Allah qarşısında) təvazökarlıq elmin səmərəsidir”.[1]

“Elm haqqa doğru yol göstərir”.

“Elm öyrənin, təki onunla tanınasınız və elmə əməl edin, təki elm əhlindən olasınız”.

“Elm iki həyatdan biridir”.

“Xeyir – mal dövlət və ya övladın çoxluğu deyil, əksinə, elmin artması, helm və dözümlülüyünün (qəlbdə) böyüməsi və insanları Allahın bəndəliyinə çağırmaqdır.”

“İki şəxs doymaz: 1. Elm tələb edən ; 2. Dünya tələb edən.”

[1] “Qürərül-Hikəm”.

“Münafiqin biliyi dilində, möminin biliyi isə əməlindədir”.[1]

Həzrəti-Əli (ə) buyurdu: “Ürəyiniz hər nə istəyirsə, məndən soruşun.” Əmirəlmömininindən sonra bir neçə şəxs bu hədisi özlərinə nisbət verib deyirdilər: “Məndən soruşun və cavabını alın”.

Bu fikirdə olanlaran biri də Bəsrənin fəqihi Qutadə idi. Bir gün minbər üstündə camaata dedi: “Hər nə istəyirsiniz, məndən soruşun”. Əhli-Sünnətdən olan Əbu Hənifə birisindən ondan bir sual etməyi təkid etdi. Həmin şəxs ayağa qalxıb dedi: “Həzrəti-Süleymanla söhbət edən qarışqa erkək idi, yoxsa dişi?”

Qütadə bu suala cavab verə bilmədi.

Amma Əli (ə) bir gün Malik Əştər, ya Əmmarla yoldan keçirmiş. Gördülər ki, kolluqdan çoxlu qarışqa çıxır. Əmmar dedi: “Çox böyük şəxsiyyət o adamdır ki, bu qarışqaların sayını desin”.

Həzrəti-Əli (ə) onlara baxdı və dedi: “De ki, böyük o şəxsdir ki, bunları yaradıb. De: “Allah böyükdür. Mən bunların sayını bilirəm. Hətta erkək-dişi olmaları ilə bərabər, onların xüsusiyyətlərini də bilirəm. İstəsən, sənə deyə bilərəm” [14, s.245–248].

Qurani-Kərimdə 18 yerdə “fikir”, 47 yerdə “Əql”, 779 yerdə “elm”, 180 yerdə “tanımaq” kəlmələri işlənmişdir. Peyğəmbərə (s) nazil olan ilk surə – “Ələq” surəsi “Oxu” ilə başlanır. İlk nazil olan bu surənin 5 ayəsindən 2-si “İqra” – “Oxu” ilə başlanır.

1-ci ayə:

---

[1] “Mizanil-Hikmət”. cild 1. səh. 170

اقْرَأْ بِاسْمِ رَبِّكَ الَّذِي خَلَقَ

“Oxu, Səni yaradan Rəbbinin adı ilə!”
3-cü ayə:

اقْرَأْ وَرَبُّكَ الْأَكْرَمُ

“Oxu və Sənin Rəbbin Kərimdir.

Göründüyü kimi hədislərdə və Qurani-Kərimdə elm gündüzə, cəhalət gecəyə bənzədilir. Müqəddəs İslam dininin hədəfi elm, iman, təqva və bilikdir. Hər şeyin mənası, məntiqi, hədəfi, dəyəri elm, iman və əməl ilə bilinir.

Elmi tərifləmək, nadanlığı pisləmək, cəhalətin, nadanlığın, mövhumatın tənqidi, elmə, təhsilə, əqli inkişafa çağırış, bütün tanınmış şairlərimizin yaradıcılığı üçün səciyyəvidir:

*Ayə-ayə oxusan Qurani,*
*Ədəbə dəvət edir insani.*
*Şərtdür elmdə, irfanda ədəb,*
*Hüsndür surəti-insanda ədəb.*
*Xiqətində bəşərin candır ədəb,*
*Mərifət əhlinə canandır ədəb.*
*Heç nəyə dəyməz ədəbsiz insan,*
*Nədədir fərqi onun heyvandan.*
*İstəsən fəlsəfəyə, məntiqə yol,*
*Ədəb əhliylə dolan, baədəb ol.*
*Dedim imanı elə əqlə bəyan,*
*Söylədi əql! Ədəbdir iman* [12, s.12–13]...

*(Şair Niyazi)*

***

*Elmin əgər olsa bi ümman qədər,*
*Nadansan, əməlin olmasa əgər [5].*

*(Sədi Şirazi)*

***

*Vaxt olar Əzrayıl alar canını,*
*Can çıxar cəsəddən sinaya sin, sin.*
*Vədə başa gələr, ömür qurtarar,*
*Düşərsən nəfəsdən sinayə sin, sin.*

*O dəmdə millətin olmaz nəfəsi,*
*Səs gələr: "Kim mənlə eylərdi bəhsi",*
*Bütün kainatın mənəm yiyəsi,*
*Rəbbiniz bil, mənəm sinayə sin, sin. [18, s.54].*

*(Xəstə Qasım)*

***

*Nadan ilə əyləşmə, gedib aqili axtar,*
*Bu cəhl ilə bir kəsb-kamal eyləmək olmaz.*

*Dünyada bina cahi-cəlal eyləmək olmaz,*
*Qəmxana olan mülkidə hal eyləmək olmaz.*

*Bidar olusan qəbrdə qəflət yuxusundan,*
*Onnan sora dünyanı xəyal eyləmək olmaz.*

*Seyyid, hərəmi-həşrdə Xaliq əməl istər,*
*Məhşərdə durub cəngi-cidal eyləmək olmaz [19, s.47].*

*(S.Ə.Şirvani)*

***

*Cahillərə təsir etməz nəsihət də, tədbir də*
*Doldursan da havayıdır, su qalarmı xəlbirdə.*
*(A.A.Bakıxanov)*

***

*Cahil qala bir kəs, necə insafa rəvadır,*
*Cahil qalanın hər işi nöqsanü xətadır.*
*Aləmdə işıq alimin elmilə ziyadır,*
*Həm rahi-hidayətdə qalanlar üləmadır.*
*(La Ədri)*

Novrəs İman "Demək olmaz" rədifli qoşmanın üçüncü bəndində də bəzi mənəvi-əxlaqi gözəlliklərə və çirkin sifətlərə işarə edir:

*Düz çıxar həmişə mərdin ilqarı,*
*Müxənnətin olmaz heç etibarı,*
*Yığar qaynağına şah mardan arı,*
*Çəkməsə nizama, şan demək olmaz [3, s.35].*

Şairin dünyagörüşündə və əxlaq fəlsəfəsində mərdlik və sədaqət daim yanaşıdır. Ayrılmaz qoşa qanaddır. Həqiqətən də, sözünə, əhdinə sadiqlik, vəfadarlıq insanın ən mühüm, ən gözəl əxlaqi fəzilətlərindən biridir. Buna görə də iman və əxlaq toplusu olan müqəddəs kitabımızda bu məsələyə dönə-dönə müraciət edilmişdir: "Ey İsrail oğulları! Sizə bəxş etdiyim nemətimi xatırlayın, (Tövratda axirəz zaman peyğəmbər barəsindəki) buyurduğumu yerinə yetirin

ki, mən də sizinlə (sizi cənnətə varid etmək barəsində) olan əhdə vəfa edim. Yalnız məndən qorxun" ("Bəqərə", 40).

"Müqavilə bağlandıqdan sonra sizə qarşı bir naqislik etməmiş (onun şərtlərini pozmamış) və sizin əleyhinizə heç kəsə yardım göstərməmiş müşrikər istisnadır. Onlarla əhdinizə axıra qədər (müddəti bitənədək) vəfa edin. Şübhəsiz ki, Allah müttəqiləri, (əhdi nahaq yerə pozmaqdan çəkinənləri) sevər!" ("Tövbə", 4).

"O möminlər ki, əmanətlərini və əhdlərini qoruyub saxlayarlar (onlara tapşırılmış əmanətə xəyanət etməz, verdikləri sözü yerinə yetirərlər!" ("Möminin", 8).

"Ey iman gətirənlər! Əhdlərə sadiq olun..." ("Maidə", 1)

Sonuncu ayənin ("Maidə", 1) şərhi ilə bağlı "Nümunə" təfsirində oxuyuruq: "Bu surə əhdə vəfalı olmaq tövsiyyəsi ilə başlayır. Təfsirçilər qeyd edirlər ki, "əhd-peymanlar və müqavilələr" deyilərkən insanların bağlaya və razılığa gələ biləcəyi bütün müqavilələr nəzərdə tutulur. Bu müqavilələr bəndənin Allahla, insanların peyğəmbər və imamlarla, şəxsin özünün özü ilə, insanların maliyyə, evlilik və s. bir-biri ilə bağladıqları müqavilə şəkillərinə şamildir. İnsan cəmiyyətlərinə diqqətlə nəzər saldıqda, cəmiyyətin ən kiçik forması olan ailə strukturundan tutmuş, dövlət kimi böyük strukturlara qədər müqavilə və sazişlərin cəmiyyətlərin əsasını təşkil etdiyini görürük. Buna görə də Quranda əhd-peymanlara vəfalı omağa israrla göstəriş verilmişdir. Hətta Məkkənin fəthi ilə iqtidar müsəlmanların əlinə keçdikdən və Quranda "müşriklər ya müsəlman olmalı, ya da qanları axıdılmalıdır!" hökmü verildikdən sonra belə, müqaviləsi olan müşriklərə müqavilə müddətləri başa çatana qədər

möhlət verilməsi ilə bağlı əmr edildi. ("Tövbə" surəsinin ilk ayələri) Əlbəttə, məlumdur ki, əhdə sadiq qalmaq qarşı tərəf o əhdi pozmayana qədər qüvvədə olur. Məsum rəhbərlər (ə.m) də əhdə sadiq qalmağı israrla tövsiyə etmişlər. Peyğəmbər (s) buyurmuşdur: "Öz əhdinə sadiq qalmayanın dini yoxdur".

İmam Sadiq (ə) buyurmuşdur: "Üç mövzuda Allah insanın öhdəlikdən boyun qaçırmasına icazə verməmişdir: 1) Yaxşı və pis adam olmasından asılı olmayaraq, hər kəsin əmanətini qoruyub saxlamaq; 2) Yaxşı və pis adam olmasından asılı olmayaraq, hər kəslə əhd bağlanmışsa, ona sadiq qalmaq; 3) Yaxşı və pis adam olmasından asılı olmayaraq, ata və anaya qarşı yaxşı olmaq" [2, s.106].

İkinci misrada isə (Müxənnətin olmaz heç etibarı) şair mərdliyin və sədaqətin əks qütbü xəyanətkarlıq və vəfasızlıq məsələsinə toxunur. Aşığın fikrincə mərdlik, mənəvi bütövlük, əhd-peymana riaət etmək, əmanətdarlıq kimi ruhi-mənəvi fəzilətlər insanı nə qədər ucaldırsa, xainlik, riyakarlıq, etibarsızlıq, başqalarının inamından sui-istifadə etmək, xalq arasında deyildiyi kimi "saman altından su yeritmək" kimi əxlaqi çirkinliklər insana həm Allah, həm də onun yaratdıqları qarşısında bir o qədər kiçildir. Onun mənəvi iflasına səbəb olur. Yenə Qurani-Kərimə diqqət yetirək: "Əgər (əhd bağladığın) bir tayfanın sənə xəyanət edə biləcəyindən qorxsan, (döyüşə başlamazdan əvvəl) onlarla olan əhdini pozduğunu açıq-aydın (mərdi-mərdanə) özlərinə elan et. Çünki, Allah xainləri sevməz!" ( "Ənfal", 58).

"Ey iman gətirənlər! Bilə-bilə Allaha, peyğəmbərə və aranızdakı əmanətlərə xəyanət etməyin! (Allahın əmrlərinə,

peyğəmbərin şəriətinə, dini vəzifələrinizə və borclarınıza sadiq olun!)" ("Ənfal", 27).

"Özlərinə, (bir-birinə) xəyanət edən şəxslərdən ötrü mübahisə etmə! Şübhəsiz ki, Allah günaha batmış xaini sevməz" ("Nisa", 107).

"Şübhəsiz ki, Allah iman gətirən kəslərdən (kafirlərin əzab-əziyyətini) dəf edər. Allah həqiqətən heç bir xaini, nankoru sevməz!" ("Həcc", 38).

A.M.Şirazi "Ənfal"–27-ci ayənin izahında yazır: "Xəyanət insanın hər hansı haqqı ödəyəcəyinə söz verib ödəməkdən boyun qaçırmasına deyilir. Bu sözün antonimi "əmanət" sözüdür. Əmanət deyilərkən adətən maliyə əmanətləri nəzərdə tutulsa da Quran məntiqində bu sözün çox geniş məna yükü var, həyatın bütün sosial, siyasi və əxlaqi sferalarını əhatə edir. Hətta, hədislərdə qeyd edilir ki, əgər bir məclisdə müəyyən bir mövzuda söhbət olarsa və sözü danışan adam bu söhbətin məclisdən çıxmasına razı olmazsa, həmin söz oradakılar üçün əmanət hesab edilir. Buna görə də islamın suyu və torpağı müsəlmanların əlində ilahi əmanətdir. Onların övadları da əmanətdir. Allahın iki böyük əmanəti hesab edilən Quran və ilahi rəhbərlər isə əmanətlərin ən üstünü hesab edilir. Hər halda əmanətə xəyanət əməllərin ən mənfuru, günahların ən çirkinidir. Əmanətə xəyanət edən münafiqdir. Peyğəmbər (s) buyurmuşdur: "Münafiqin üç əlaməti var: "Yalan danışar; verdiyi vədə xilaf çıxar; yanında nəyisə əmanət qoysan xəyanət edər. Oruc tutsa, namaz qılsa, özünü müsəlman hesab etsə belə, bu cür şəxs münafiqdir" [2, s.180].

Həm Novrəs İmanın, həm də digər sənətkarlarımızın əsərlərində bu məsələlərlə bağlı bədii parçalar tez-tez gözə dəyir:

*Nəfs aldatdı, hər yetənə xan dedim,*
*Bihudə kollara* gülüstan dedim.
*Əbəs yerə bivəfaya "can" dedim,*
*Zəhmətn çox çəkdim, karın görmədim [10, s.44].*
*(Aşıq Ələsgər)*

***

*Bu məktəbdə bir uşaq görməmişəm hələ mən,*
*Ki, "vəfa" ayəsini deyə bilsin əzbərdən.*
*Necə vəfa ayəsi unudular Quranda,*
*"Ufi biəhdi" sözü var ayə qurtaranda.*[1]
*(Xaqani Şirvani)*

***

*Mən cahan mülkündə mütləq doğru halət görmədim,*
*Hər nə gördüm, əyri gördüm, özgə babət görmədim,*
*Aşinalar ixtilatında sədaqət görmədim,*
*Beyətü-iqrarü imanü dəyanət görmədim.*
*Bivəfadan lacərəm, təhsili hacət görmədim.*

*Ya imam – insü vəl cinnü şahənşahi umur,*
*Getdi din əldən, bu gündən böylə sən eylə zühur.*
*Qoyma kim, şeytani-məlun eyləyə imanə zur,*

[1] Burada "Bəqərə" surəsinin 40-cı ayəsinə işarə olunur.

*Şöleyi-hüsnünlə bəxş et, tazədən dünyayə nur*
*Kim, şəriət məşəlində istiqamət görmədim [7, s.124].*
*(M.P.Vaqif)*

Novrəs İman sonrakı iki misrada ictimai-əxlaqi gözəlliyi ön plana çəkir:

*"Yığar qaynağına şah mardan arı,*
*Çəkməsə nizama, şan demək olmaz"*

Burada bal arısı obrazından istifadə edilməklə zəhmətkeşlik, əməksevərlik, başqalarına faydalı olmaq, öz yükünü özgələrin boynuna qoymamaq kimi gözəl insani keyfiyyətlərə diqqət çəkilmişdir. Bəlkə də şair bu misraları qələmə alarkən "Nəhl" surəsindəki məşhur ayələrdən ilham almışdır: "Rəbbim bal arısına belə vəhy (təlqin) etdi: "Dağlarda, ağaclarda və (insanların) qurduğu çadırlarda (evlərin damında, üzümlüklərdə) özünə evlər tik (pətəklər sal). Sonra bütün meyvələrdən ye və Rəbbinin sənə göstərdiyi yolla rahat (asanlıqla) get! (və ya: "Rəbbinin yollarını itaətlə tut!") (O arıların) Qarnından insanlar üçün şəfa olan müxtəlif rəngli (ağ, sarı, qırmızı) bal çıxr. Şübhəsiz ki, bunda da düşünüb dərk edənlər üçün bir ibrət vardır" ("Nəhl", 68–69).

Şair bu ayələrdən və bal arısı obrazından yararlanaraq demək istəyir ki, hər kəs Uca Yaradanın buyuruğuna əməl edərək, həm öz ruzisini, dolanışığını təmin etmək, həm də başqalarına fayda vermək üçün gecə-gündüz zəhmət çəkməli, yorulmadan əmək sərf etməlidir.

Bu cəhət yalnız fərdi xarakter daşımayıb, normal ictimai-iqtisadi həyatın davam etdirilməsi üçün son dərəcə önəmlidir. Yenə də Qurani-Kərimə nəzər salaq: "Namaz qılınıb qurtardıqdan sonra yer üzünə dağılın və Allahın lütvündən ruzi diləyib axtarın! (Yenə öz işinizə qayıdın) Və Allahı çox zikr edin ki, nicat tapıb səadətə qovuşasınız! (hər iki dünyada murada yetişəsiniz!)" ("Cümə", 10).

"İnsana ancaq öz zəhməti (səyi, çalışması, əməli) qalar!" ("Nəcm", 39).

İnsana yalnız çalışıb səy göstərdiyi aiddir. Əllamə S.M.Təbatəbai bu ayəni izah edərkən ("Nəcm", 39). "İnsana" ifadəsi ilə bağlı çox mühüm bir nüansa toxunmuşdur. Burada "lam" ön qoşması həqiqi sahibliyi, malikliyi bildirir. Yəni, insan təkcə, etdiyi yaxşı və pis əməlin sahibidir. Bu əməllər əbədi olaraq onunla bir yerdə olur. Ancaq insanın sahib və malik olduğunu düşündükləri – mal, vəzifə, övlad və s. hamısı bu dünyada insanla birlikdə olan xəyali varlıqlardır. İnsan bu dünyanı tərk edərkən onları bu dünyada qoyub gedir. Ancaq ayə və hədislərə əsasən o dünyada günahı olan möminlərə şəfaət ediləcəyi məsələsinə gəlincə, bu məsələ ilə təzad təşkil etmir. Səbəbi isə onların bu dünyada Allaha və Onun ayələrinə inanıb yaxşı əməllər etməsidir. Onlara şəfaət olunmasına məhz, həmin iman və əməlləri səbəb olur. Əgər imanları olmasaydı, onlara əsla şəfaət olunmazdı. Beləliklə, mömin öldükdən sonra digər möminlərin bağışlanma istəyindən və göndərdikləri hədiyyə savablardan faydalanırlar. Habelə, bu dünyada yaxşı və pis ənənə qoymuş insan öldükdən sonra həmin ənənəyə əməl edən insanların günah və savabına ortaq olurlar. Çün-

ki, həmin adam həmin ənənəni qoymaq üçün səy göstərmişdir [2, s.527].

Hədislərdə, ata sözləri və zərb məsəllərdə bu mövzu geniş yer tutur:

Peyğəmbər (s) buyurub: "İnsan əməksiz mövcud deyildir".

Həzrəti-Əli (ə) buyurur: "Cənnət əməlsiz arzu ilə deyil, əməllə qazanılır".

"Camaatı bir əmələ çağıran və özü öz çağırışına əməl etməyən adam, yaysız kamanla ox atan adama bənzər";

"İnsanlarla elə gəl-get edin ki, ölsəniz ağlasınlar, diriliyinizdə sizin vurğununuz olsunlar";

İmam Həsən Müctəba (ə) buyurur: "Yaxşılıq – əvvəlində laqeydlik olmayan və axırında minnət gətirməyən bir əməldir" [13].

"Əmək insanı ucaldar";

İş həyat çırağına yağ qatar (Q.V.Belincki)

İşləməyən dişləməz (Atalar sözü)

İşləmək – bu inqilabın qırmızı bayrağında yazılmışdır.

Əmək insanlara həyat verən, ağıl, iradə, qəlb tərbiyə edən müqəddəs əməkdir (O.Q.Biçer)

Zəhmətkeş arı çiçəklərdən bal toplaya bilir (A.Blok)

İş və həzz insan həyatının iki əsas şərtidir – Şəxsi və ictimai (N.E.Vvedenski).

Şair qoşmanın sonrakı bölümündə namərd, xəyanətkar, zatıqırıq şəxslərə məxsus bəzi çirkin sifətləri sayır, sanki onları əvvəlki bənddə sadaladığı mənəvi gözəlliklərlə qarşılaşdırır:

*Əyri olan bilməz yolu, ərkanı,*
*Saxlayar könlündə şəri, böhtanı,*
*Bədəsil tanımaz yaxşı, yamanı,*
*Namərd süfrəsinə nan demək olmaz [3, s.35].*

Müəllifə görə qəlbi, düşüncə tərzi, əxlaqı düz olmayan, doğru-dürüst düşünməyi və yaşamağı bilməyən, bacarmayan insanlar təkcə özləri üçün deyil, bütün cəmiyyət üçün təhlükəlidirlər. Onlar Quranda dəfələrlə buyurulduğu kimi "qəlblərində xəstəlik" olduğundan həm özərinə həm də başqalarına mərifətdən, ədəbdən, həqiqi islam və insanlıq yolundan uzaqlaşdırırlar. Kin-küdurətlə dolu olan bu insanlar ətrafa şər, böhtan satmaqdan çəkinməzlər. Bu isə müqəddəs kitabımızda və islami hədislərdə ən çox işlənilən əxlaqi rəzalətlərdəndir: "O zaman ki, siz münafiqlərin yaydığı yalanı dilinizə gətirir, bilmədiyiniz sözü ağzınıza alır, onu yüngül (asan, insana günah gətirməyən) bir şey sanırdınız. Halbuki bu, (peyğəmbərin əhli-əyalı haqqında nalayiq söz danışmaq) Allah yanında çox böyük günahdır!" "Məgər siz onu eşitdiyiniz zaman: "Bizə bunu (bu yalanı danışmaq yaraşmaz). Aman, (Allah) Bu çox böyük bir böhtandır!" – deməli deyildinizmi?" ("Nur", 15,16).

"Möminlər arasında (onları nüfuzdan, hörmətdən salmaq məqsədilə) pis söz yaymaq istəyənləri dünyada və axirətdə şiddətli bir əzab gözləyir. (hamının əməlini, yayılan şayiələrin, atılan böhtanların doğru olub-olmadığını) ancaq Allah bilir, siz bilməzsiniz!" ("Nur", 19).

"Zinadan xəbəri olmayan namuslu, ismətli mömin qadınları zinada ittiham edənlər dünya və axirətdə lənətə dü-

çar olarlar. Onları (Qiyamət günü) çox böyük bir əzab gözləyir" ("Nur", 23).

"Mömin kişiləri və qadınları etmədikləri bir işdən (günahdan) ötrü incidənlər şübhəsiz ki, öz üzərlərinə böhtan və açıq-aydın bir günah götürmüşlər!" ("Əhzab", 58).

Sonuncu ayədə ("Əhzab", 58) fiziki zərərlərə görə qisas nəzərdə tutulur. "Biz o kitabda onlar üçün qərar aldıq ki, canın müqabilində can, gözün müqabilində göz, burunun müqabilində burun, qulağın müqabilində qulaq, dişin müqabilində dişdir" ("Maidə", 45). Amma, psixoloji zərbələrə görə qisas almaq caiz deyil. Quran icazə vermir ki, böhtan atana böhtanla cavab verilsin. Bu günaha görə xəbərdarlıq olunub, zəruri hallarda həmin şəxs şəri (şəriət) hakim tərəfindən cəzalandırılır. Ayədən aydın olur ki, xilaf işə yol vermiş müsəlman qanun çərçivəsində cəzalandırıla bilər. Mömin qadın və mömin kişinin şəxsiyyəti möhtərəmdir. Onları ləkələmək böyük günahdır. (Şəxsiyyətin qorunmasında kişi ilə qadın arasında heç bir aidiyyat yoxdur). Ən pis əziyyət dil yarası və böhtandır [20, s.325–326].

Bu ayələr və hədislərlə səsləşən bir neçə poetik nümunəyə nəzər salaq:

*Bir gün olar əcəl gələr, ağrı yetişər sərə,*
*Hər əməlin öz nətinə, yazılacaq dəftərə.*
*Vay halına bu dünyada qarışan böhtan-şərə,*
*İman deyər, doğru yoldan, düz ilqardan danışaq [3, s.127].*
*(Novrəs İman)*

***

*Böhtan demə, böhtan tutar adamı,*
*Qul eylər, bazarda satar adamı.*
*Cəhənnəm odundan betər adamı,*
*Yoxsulluq yandırıb kül eylər-eylər.*

*Aqil insan deməz hər gördüyünü,*
*Daldalar düşməndən vay dərdiyini.*
*Görməzsən nakəsin pay verdiyini,*
*Versə də minnətin bol eylər-eylər [11, s.28].*
*(Xəstə Qasım)*

***

*Aldanıb dünyanın cəh-cəlalına,*
*Haram qarışdıran öz halalına,*
*Xəyanət eyləyən qonşu malına*
*Haqqın divanında qaldı da getdi [10, s.41].*
*(Aşıq Ələsgər)*

***

*Yalan deyib, qeybət etmə, rəhmin gəlsin canına,*
*Öz-özünə fəxrlənib baxma şövkət-şanına.*
*Əzrayıl əlində cəngəl gələcəkdir yanına,*
*Qəzəbindən gül rəngin solacaqdı dünyada [10, s.108–109].*
*(Aşıq Ələsgər)*

"Bədəsil tanımaz yaxşı-yamanı, namərd süfrəsinə nan demək olmaz" – misraları ilə şair demək istəyir ki, əsli-kökü bilinməyən namərd, xalq arasında zatıqırıq adlandırılan şəxslər nə yaxşı ilə pisi ayırd edə bilər, nə də onlara edilən

yaxşılıqların qədrini, qiymətini bilərlər. Ona görə də ən gözəl nemətlərlə bəzədilmiş olsa da onların süfrəsində əyləşmək olmaz. Çünki, bu mərdliklə, əsl-nəcabətli olmaqla, halal-haramı, yaxşı-yamanı tanımaqla bir araya sığışmaz. Deməli, şairin dünyagörüşündə halallıq, qədirbilənlik, mərdlik insanlığın, dindarlığın, doğru-düzgün yaşamağın nəhəng daşıdır, sarsılmaz büNovrəsidir.

Novrəs İman qoşmanı belə tamamlayır:

*İman yad ellərdə candan usanı,*
*Hərcayi sözlərdən hər dəm utanı.*
*Hər gündə cəsədi bir qədər yanı,*
*Ləhzədə alışıb yan demək olmaz [3, s.35].*

Şeirin ikinci bəndində olduğu kimi qıfıbənddə də şair keşməkeşli həyatından acılı ağrılı taleyindən şikayətlənir. Bunun səbəbləri barəsində yuxarıda əziz oxucularımıza məlumat vermişik. Buna görə də təkrarən o tarixi bilgilərə, el arasında dolaşan rəvayərlərə qayıtmırıq. Bu barədə geniş məlumata şairin “Seçilmiş əsərləri”nə İslam Ələsgərin yazdığı ön sözdə baxa bilərsiniz.

Yekun olaraq bunu söyləyə bilərik ki, Novrəs İman “Demək olmaz” rədifli qoşmasında müxtəlif mövzulara toxunmuşdur. İnsanın yaradılışı, əxlaqi gözəlliklər və çirkinliklər, taledən şikayət vəs. Lakin, şeri qiymətli, dəyərli edən əsas məsələ daha çox burada ruhi-mənəvi fəzilətlərin tərənnümü və insanların ictimai-əxlaqi çatışmazlıqlardan, eyblərdən islami istilahla desək, bir sıra böyük günahlardan çəkindirilməsidir. Aşıq mərdliyi, zəhmətsevərliyi bağladığınız əhd-peymana sadiq qalmağı, əmanətə xəyanət etmə-

məyi, sosial-ictimai ədaləti gözləməyi hər bir insan üçün şərəf mənbəyi sanır və əsl şəxsiyyətin, həqiqi müsəlmanın ömür yolunun tale kitabının ən böyük mənasını, məqsədini məhz, bu məsələlərdə görür. Bu baxımdan inamla deyə bilərik ki, Novrəs İman, Dirili Aşıq Qurbani, Aşıq Abbas Tufarqanlı, Xəstə Qasım Tikmədaşlı, Aşıq Alı, Aşıq Ələsgər, Molla Cümə, Bəhmən Göyçəli, Həsən Xəyallı, Dədə Şəmşir və başqa bu kimi ustadlar ruhi-mənəvi bütövlüyə qovuşmuş müqəddəs dəyərlər, uca məqsədlər uğrunda dönmədən qələm çalmışdır...

**Ədəbiyyat:**


1. Qurani-Kərim. (Ərəb dilindən tərcümə edənlər: Z.M.Bünyadov, V.N.Məmmədəliyev). Bakı, 2005
2. Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017
3. Novrəs İman. "Seçilmiş əsərləri". (toplayıb tərtib edəni: İslam Ələsgər). Bakı, "Səda", 2004
4. Möhsün Qiraəti. "Nur təfsiri". XII cild. Bakı, "Nurlar", 2015
5. Sədi Şirazi. "Gülüstan". Bakı, "Azərnəşr", 1987
6. Xaqani Şirvani. "Seçilmiş əsərləri". Bakı, "Yazıçı", 1987
7. Molla Pənah Vaqif. "Əsərləri". Bakı, "Şərq-Qərb", 2004
8. Seyid Əzim Şirvani. "Qəzəllər". Bakı, "Azərnəşr", 1960
9. Nəsimi. "Seçilimiş əsərləri". Bakı, "Azərnəşr", 1973
10. Aşıq Ələsgər. Seçilmiş əsərləri. Şeirlər. Bakı, "Yazıçı", 1988
11. Xəstə Qasım. Bakı, "Folklor İnstitutu", 2010
12. Axund Hacı Soltan Hüseynqulu oğlu Əlizadə. "Hidayət yolu". Bakı, "Ozan", 2000

13. Fəxrəddin Altan. "Könlü oxşayan sözlər". Qum, "Ənsaryan", 2005
14. Hacı Həsən Hüseynov. "Həzrət Əli (ə) müxtəlif baxışlarda". Bakı, "Nərgiz", 2011
15. Hacı Həsən Hüseyni. "Əhli-beyt (ə) aşiqi Dədə Ələsgər". Bakı, "İmza", 2022
16. İslam Ələsgər. "Novrəs İman" // Novrəs İman. "Seçilmiş əsərləri". Bakı, "Səda", 2004
17. Miskin Abdal. Bakı, "Səda", 2001
18. Xəstə Qasım. "46 şeir". Bakı, "Gənclik", 1975
19. S.Ə.Şirvani. "Seçilmiş əsərləri". 3 cilddə, I cild. Bakı, 1967
20. Möhsün Qiraəti. "Nur təfsiri". IX-X cild. Bakı, "Nurlar", 2015

*Nə zaman ki, dərd canımda çoxalır,*
*Ondan əvvəl, kirdigarı çağırram.*
*Hərdən bir Rəsula verirəm salam*
*İsmi Əhməd, ümidavari çağırram.*

*Əzalarım yeksər ağrar dəmadəm,*
*Tamami bəndləri çox gətirir qəm.*
*Oxuram hər gündə dilimdə mən cəm,*
*"Nadi-Əli Şahsuvari"çağırram.*

*Gahi xəstəhalam, gahi pərişan,*
*Gahi şad oluram, gah vaxtı giryan.*
*Hərdən darıxanda Novrəstə İman,*
*Dönüb bir də Ələmdarı çağırram.*

## USTAD AŞIĞIN HAQDAN İMDAD DİLƏMƏSİ

*Bismillahir-Rəhmanir-Rəhim!*
*Ya Allah ya Rəsul ya Əli səndən mədəd!*

Azərbaycan şifahi xalq ədəbiyyatının görkəmli simalarından biri də göyçəli Məşədi Salah oğlu İmandır.

Novrəs İman 1903-cü ildə Göyçə mahalının Ağkilsə kəndində Aşıq Ələsgərin qardaşı Məşədi Salah kişinin evində dünyaya göz açmışdır. Novrəs İman Məşədi Salahın ortancıl övladı idi. Kiçik yaşlarından İmanın dinə olan etiqadını görən atası onu Hüseynqulağalı (indiki Nərimanlı) kəndində Bala Molla adlı çox savadlı bir din xadiminin Kərbəlayi Qaranın evində açdığı mədrəsədə təhsil almağa qoyur. Mədrəsə uşaqları içində istedadı və qabiliyyəti ilə seçilən Novrəs İman müəlliminin və tələbələrin diqqətini tez bir zamanda özünə cəlb edə bilir. İmanla bir yerdə təhsil alanlardan biri Daşkəndli molla-şair Həsən Xəyallı, digəri isə Nərimanlı kənd sakini aşıq-şair Bəhmən Qarayev idi. Sonralar Bəhmən xatirələrində deyirdi: "İman gündəlik dərsdən əlavə bir neçə dərs əvvəli də öyrənirdi ki, bu da bizi və mollanın özünü də çox heyrətləndirirdi". Məktəbi bitirdikdən sonra bu yeniyetmə cavan kitablardan ayrıla bilmir. Yaxın qohumlarının verdikləri məlumata görə Novrəs İman əlinə düşən dini ədəbiyyatları, bədii və tarixi kitabların hamısını oxuyardı. Deyilənə görə, Qurani-Kərimi əzbər bilirmiş [21, s.9].

Biz Novrəs İmanın yaradıcılığına baş vurduqda bu deyilənlərin həqiqət olduğunun bir daha şahidi oluruq:

*Dərs alanda mən dil açdım ol Qurana, "Bismillah",*
*Şəriətdə şərtdi bizə – müsəlmana "Bismillah".*
*Aç yükünü, göstər görüm, nədir mətahın sənin,*
*Söylə görüm, bələdsənmi yol ərkana, "Bismillah".*

*İbtidadan dərs alanda oxumuşam yeddi "sin",*
*İki "lam"dı, səkkiz "cim"di, bir "əlif"di, yeddi "sin"*
*Arif olan, hesab eylə bu ayənin yeddisin,*
*Sərrafsansa, ləl seçməyə gir meydana "Bismillah"*
*[3, s.126].*

Novrəs İman yaradıcılığından bəlli olur ki, o da əmisi Aşıq Ələsgər kimi haqq aşiqi olmuşdur. Şairin yaradıcılığında ən geniş yayılmış mövzulardan biri də islami-əxlaqi və mənəvi-tərbiyəvi anlayışlardır. Biz bu məqsədlə ustad aşığın "Çağırıram" rədifli qoşmasının qısa izahını verməyə çalışacağıq:

*Nə zaman ki, dərd canımda çoxalır,*
*Ondan əvvəl, kirdigarı çağırram.*
*Hərdən bir Rəsula verirəm salam*
*İsmi Əhməd, ümidavari çağırram [3, s.31].*

Bəndin ikinci misrasındakı "Kirdigar" sözü Haqq Aşiqi olan Novrəs İmanın yaradıcılığında ən çox istifadə olunan kəlmədir. "Kirdigar" sözü fars mənşəli söz olub, "Xaliq", "Allah" deməkdir [17, s.291].

Bəndin üçüncü misrasında "Hərdən bir Rəsula verirəm salam" deyərkən İslam dinində müstəhəb (bəyənilmiş) əməllərdən sayılan "Salam" verməkdən və hər namazın sonunda İslam Peyğəmbəri olan Həzrəti-Muhəmmədlə (s)

Əhdi-peymanı (beyyəti) təzələməkdən söhbət gedir. Müqəddəs kitabımız "Qurani-Kərim"də 7 ayədə "Salam"dan söhbət açılıb. Bu barədə "Uyunu-Əxbarir-Riza" kitabında yazılıb: "Bəni-Abbas xəlifəsi Məmunun əmri ilə bütün alimlərin İmam Rzanın (ə) hüzuruna gəldikləri gün İmam (ə) onlardan soruşdu: "Qurani-Kərimdə "Ya-sin" kəlməsində kim nəzərdə tutulub?" Bəni-Abbas alimləri dedilər: "Ya-Sin"nən məqsəd Muhəmmədir (s) İmam (ə) buyurdu: "Allah-təala islam Peyğəmbərinə (s) bir üstünlük vermişdir ki, onu ağlı və düşüncəsi olmayanlar başa düşə bilməzlər. O üstünlük belədir. Allah-təala Qurani-Kərimdə Peyğəmbərlərdən (ə) başqa heç kəsi salamlamayıb. Belə ki, "Səffat" surəsinin 79-cu ayəsində "Salam olsun Nuh Peyğəmbərə (ə) bütün aləmlərdə", 109-cu ayədə "Salam olsun İbrahimə (ə), 120-ci ayədə "Salam olsun Musaya (ə.) və Haruna (ə), 130-cu ayədə "Salam olsun "Ali-Ya-Sin"ə, 182-ci ayədə "Salam on bütün Rəsullara". Allah-Təala "Salam olsun "Ali-Ya-Sin"ə buyurarkən "Ya-Sin" övladların nəzərdə tutur. Bir halda ki, "Ya-Sin" Peyğəmbərə (s) dəlalət edir, "Ali-Yasin" də Əhli-beytə (ə.) dəlalət edir [22].

Həmçinin onu da qeyd etmək lazımdır ki, "Salam" Allahın adlarından biridir. Şəhidlər Sərvəri İmam Hüseyn (ə.) buyurub: "Salamın 70 (yetmiş) savabı var. 69-u Salam verənin, biri isə Salamın cavabını alanındır".

Bildiymiz kimi, "Salam vermək" şəriətdə müstəhəbbdir (savabı olan əməl), Salamın cavabın almaq isə, vacibdir.

Haqq aşiqi Novrəs İman gündəlik 5 dəfə qılınan 17 rükət vacib namazın sonunda Peyğəmbərə (s) verilən Salamdan söhbət açır:

"Əssalamu Əleykə yə əyyuhən nəbiyyu və Rəhmətullahi və Bərəkatuh".

“Əssalamu Əleyna və əla İbadillahis-Salihin”

“Əssalamu Əleykum və Rəhmətullahu və Bərəkətuh”.

Namaz ruhi xəstəliklərin əlacıdır, onu qılan ölümdən qorxmaz. Tamam günahların kökü, mərkəzi insanın ürəyindəndir. İnsanın qiyamətə inamı olsa namaz qılar. Bir sözlə, “Namaz” – bütün yaxşı işlərin kökündür. O, bir vasitədir ki, möminə qol-qanad verir, onu yüksəkliyə Allaha tərəf aparır və təqvalı edir. Təqva sahibi o müsəlmandır ki, günah etmir.

Namazla hər əmələ qiymət verilir. Onsuz bizim qalan əməllərimiz sıfır dərəcəsindədir. Əgər namaz qəbul olmasa digər əməllər də qəbul olmaz.

Namazın dinimizdəki əhəmiyyətini anlamaq üçün peyğəmbərdən (s) və Əhli-beyt (ə) imamlarından gələn bir neçə hədisə diqqət yetirək: İslam peyğəmbəri (s) buyurur: “Namaz həqiqətən, dinin sütunudur və Adəm övladından soruşulan ilk şey – namaz olacaqdır. Namazı doğru olsa o biri əməllərinin hesabı aparılacaqdır, doğru olmasa, digər əməllərin hesabı aparılmayacaq”, “Hər şeyin siması var, sizin dininizin də siması namazdır”. “Namaz dinin sütunudur” “Namaz möminin meracıdır”.

İmam Əli (ə) buyurur: “Bir şəxs namaza dayananda Allahın bəndəni əhatə edən rəhmətini görən iblis paxıllıqla ona baxar”. Allahın rəsulundan (s) sual etdilər. Ya Rəsulullah (s) “Xuşu nədir?” Allah rəsulu (s) buyurdu: “Xuşu namazda mütilik və bəndənin sidq qəlbilə öz Rəbbinə üz tutmasıdır”. Söz yox ki, Qurani-Kərimdə də bu əzəmətli ibadətlə bağlı onlarla müxtəlif səpgili ayə vardır (“Ənkəbut”, 42; “Müzəmmil”, 14; “Möminun”, 1, 2, 10; “İsra”, 78; “Maun”, 5–6; və s.).

Deməli, dini saxlayan namazdır. Allahdan naümid olan namaz qılmaz. Namaz həm dini, həm ölkəni, həm də müsəlmanların birliyini saxlayır. Namaz nə qədər qüvvətli olsa, iman da bir o qədər qüvvətli olar. İnsan Allahı nə qədər yaxşı tanısa, namazı da bir o qədər aşiqanəliklə, arifanəliklə və ürəklə qılar. Peyğəmbərlər (s) və Məsum İmamlar (ə) Allahı hamıdan yaxşı tanıyıb, sevdikləri üçün hamıdan artıq ibadət edirdilər. Həmişə və hər halda onu düşünürlər, uzun səcdələri, davamlı rükuları, ağlar gözlə qıldıqları gecə namazları və ürəkdən etdikləri duaları vardır. Ustad aşığa görə hər bir insanın həqiqi dəyərini müəyyən edən başlıca amil gözəl əxlaq və cəlbedici ünsiyyətdir. Söz yox ki, şair bu dünyagörüşünü ilk olaraq Quran-Kərimdən və məsumların hədislərindən əxz etmişdir. Allah-təala Qurani-Kərimdə buyurur: "Bu kitabdan sənə vəhy olunanı tilavət elə. Və namaz qıl, çünki namaz adamı pis və yaramaz əməllərdən saxlar və Allahı yad etmək daha böyükdür, Allah gördüyünüz işlərdən agahdır" ("Ənkəbut", 45).

Bu ayədən aydın görünür ki, namaz insanı bütün çirkinliklərdən saxlayır. Namaz qılan oğurluq, zina, qeybət və s. kimi çirkin işlərə əl atmaz, yalan danışmaz, böhtan söyləməz və s.

Allah-təala Həzrəti-İsanın (ə) barəsində belə buyurur: "Və harada olsam, mənə bərəkət veribdir və yaşayanacan. Mənə namaz və zəkat vəsiyyət qalıbdır" ("Məryəm", 31).

Bu ayədən aydın olur ki, Allah-təala Həzrəti-İsadan (ə) namaz qılmağı tələb edir.

Peyğəmbər (s.) buyurmuşdur: "Elə ki, namaz vaxtları yetişir bir məlaikə Allahın hüzurunda durur və səslənir: Ey insanlar, durun o odlarnızın tərəfinə, o odlar ki, kürəynizdə yandırmısız, söndürün o odları namazla". İbadətlərin ən

əfzəli namazdır, insan kamala çatmaq üçün bu dünyaya gəlir. Kamala yetişmək Allaha yaxın olmaqla mümkündür. Biz nə qədər Allaha yaxın olsaq bir o qədər kamala çatmış olarıq.

Peyğəmbər (s) buyurur: "Allah namazı gözümün nuru etmiş, onun məhəbbətini ürəyimə salmışdır. Ac və susuz adam su içib, xörək yedikdə doyur, mömin isə namaz qılmaqdan heç vaxt doymur".

Həzrəti-Əli (ə) bir hədisdə namazın fəziləti haqda buyurur: "Əgər namaz qılan şəxs Rəbbinin sonsuz rəhmətinin onun halına necə şamil olduğunu bilsəydi, heç vaxt başını səcdədən götürməzdi".

İmam Sadiq (ə) buyurub: "Əgər sizlərdən birinin qapısından bir çay axsa və o şəxs hər gün orada beş dəfə yuyunsa, onun bədənində çirk qalarmı? Həqiqətən namaz belə bir çaya bənzəyir. Namaz qılan şəxsin namazı onun günahlarının kəffarəsidir".

İmam Rza (ə) buyurub: "Namaz hər təqvalı mömini Allaha yaxın edir" [23, s.45].

Peyğəmbər (s) və İmamlar (ə) namaz qılanda bildirdilər ki, nə iş görürlər və kimin hüzurunda dayanıblar, İmam Həsən (ə) dəstnamaz alıb, üzü qibləyə dayanıb namaz qılarkən həzrətin (ə) rəngi dəyişirdi. İnasanın qıldığı namaz onun imanının mizanıdır. Kim nə cür namaz qılsa, mərifəti, imanı, ədəbi də bir o qədərdi,namazda bu deyilənlərin hamısı bilinir. Namaz qılan qılmayandan yaxşıdır. Namaz qıldıqca adamın mərifəti çoxalır, mərifəti çoxaldıqca namaz gözəlləşir. Bəs namaz qılmayan necə? Bu sualın cavabı da Qurani-Kərimdə öz əksini tapmışdır. Belə ki, "Sizi Səqərə (Cəhənnəmə) salan nədir?" Onlar deyəcəklər: "Biz namaz

qılanlardan deyildik"; Yoxsulu da yedirtməzdik; Batilə dalanlarla birlikdə biz də dalardıq" ("Müdəssir", 41, 45).

Namaz elə bir ibadətdir ki, həm ayrı-ayrı şəxslərin, həm də hansısa bir cəmiyyətin həqiqi bel sütununa, mənəvi dirəyinə çevrilə bilər. Buna görə də ustad şair Novrəs İman sələfləri kimi namazdan uzaqlaşmağı cəmiyyət üçün təhlükə sayır.

Bu səpgili bədii parçalara həm şairin öz yaradıcılığında, həm də başqa sənətkarlarımızın əsərlərində tez-tez rast gəlirik:

*Dinin yarpaqları Firuiddindir,*
*Oruc tut, namaz qıl, ibadət eylə.*
*Beşdən bir xüms ver, ondan bir zəkat,*
*Zəlilə, müstərə inayət eylə [3, s.42].*

(Novrəs İman)

***

*Namaz qılan səcdəgaha,*
*Sübhana baş endirir,*
*Kəlmə kəsir həqiqətdən,*
*Ərkana baş endirir;*
*Niyyət tutur, qiyam edir,*
*Təkbir ilən həmd oxur,*
*"Qulh" deyir, salam edir,*
*Mərdana baş endirir [3, s.124].*

(Novrəs İman)

***

*Müsəlmanam deyən adam,*
*Şərti nədir bilsin gərək.*

*Tanrı buyruğunu tutub,*
*Beş vaxt namaz qılsın gərək [7, s.97].*
*(Yunis İmrə)*

***

*Sənə derəm, ey dostum,*
*Dur ertə namazına.*
*Əgər dirisən, oyan,*
*Dur ertə namazına!*

*Namaz qıl, yaraq olsun,*
*Axirətdə gərək olsun,*
*Qəbrində çıraq olsun,*
*Dur ertə namazına.*

*Namaz qıl imam ilə,*
*Yatma heç güman ilə,*
*Gedərsən iman ilə,*
*Dur ertə namazına [7, s.169].*
*(Yunis İmrə)*

***

*Dünyada əl çəkmə sövm-səlatdan,*
*Təmiz ver, qalmasın xüms zəkatdan.*
*Ələsgər, xof etmə, puli-siratdan,*
*İrəhbərdir cənab Əli qabaqda [5, s.15].*
*(Aşıq Ələsgər)*

***

*Namaz qılmayana borc vermə aman,*
*Aclıqdan şikayət etsə də haman.*

*O Allah borcunu vermirsə, əgər,*
*Bəndənin borcunu necə ödəyər [8, s.257].*
*(Sədi Şirazi)*

***

*Elə bir bəxşi-xudadır bizə dünyada namaz,*
*Verə əcrin nə ki, dünyada, həm üqbadə namaz.*

*Gör necə kamına çatdırdı Rəsulullahı,*
*Yeddi dərgaha qılıb "leylətül-əsrada" namaz.*

*Gözümün nuru namazdır, dedi Peyğəmbərimiz,*
*Bu səbəbdən qətidir hər günü fəryadə namaz.*

*Gör namaz üstə necə Həzrət Əli oldu şəhid,*
*Yazaraq ahı ilə ərşi-müəlladə namaz.*

*Kərbəlada boyanıb qanə Hüseyn təşnə susuz,*
*Qan ilə adı vüzu, qıldı o səhrada namaz [16, s.28].*
*(Hacı Soltan Əlizadə)*

Bəndin dördüncü misrasında "İsmi-Əhməd ümidvarı çağırram" – deyərkən şair peyğəmbərimizin Qurani-Kərimdə gələn mübarək "Əhməd" adından imdad diləyir. Qurani-Kərimdə əziz peyğəmbərimizin Muhəmməd (s) adı dörd dəfə çəkilir ("Muhəmməd", 2; "Əhzab", 40; "Fəth", 29; "Ali-İmran", 144). "Əhməd" adı isə cəmi bir dəfə çəkilir: "Onu da xatırla ki, bir vaxt Məryəm oğlu İsa belə demişdi: "Ey İsrail oğulları! Həqiqətən, mən özümdən əvvəl nazil olmuş Tövratı təsdiq edən və məndən sonra gələcək Əhməd adlı bir peyğəmbərlə (sizə) müjdə verən Allahın elçisiyəm"

Sonra (İsa, yaxud rəsulum (ə)) onlara aşkar möcüzələrlə gəldikdə onlar: “Bu açıq-aydın sehrdir!” – dedilər” (“Səff”, 6).

Ayədən göründüyü kimi Həzrəti-İsa (ə) islam peyğəmbərinin gələcəyini müjdə vermişdir. “Əhməd” İslam Peyğəmbərinin (s) məşhur adlarından biridir. O, həyatda olarkən bu ada şöhrət tapmışdır. Buna görə də sözügüdən ayələr nazil olanda düşmənlərin heç biri onun adının Əhməd olmasına etiraz etməmişlər. Çünki, bu ad artıq hamıya məlum idi [2, s.552].

*“Təfsiri nümunə”*nin sahibi *“Ənisül-əlam”* kitabından nəql edilərək yazır. *“Cənab Fəxrül”* – İslam müsəlman olmazdan əvvəl xristian dinində ən böyük keşişlərdən birinin tələbəsi və xidmətçisi olmuşdur. Bir gün ustadan xəstə olmasına görə tələbələrə dərs deməyə o gedir. Orada tələbələrin *“Farqalita”* adı üzərində mübahisə etdiyini görür. Evə qayıtdıqda mövzunu ustadına izah edərkən keşiş ağlayıb deyir. Bu kəlmə Yunan dilində Perklatus deyilən Siryani sözüdür. Keşiş ah çəkdi və dedi:

*“Bunu yalnız Alimlikdə sabitqədəm və möhkəm olanlar bilir.*”

Mən çox israr etdim ki, onun mənasını mənə açıqlasın və bunu sirr kimi saxlayacağıma and içdim. Keşiş dedi:

*“Bilsələr məni öldürərlər.”*

Söz verdim ki, adın gizli qalacaq. Otaqlardan birinin açarını verdi. Mən o otağın aşarını heç vaxt görməmişdim. İki kitab adı çəkdi. Biri yunan, digəri Siryani dilində yazılmışdı.

Hər iki kitabda Farqalita kəlməsi *“Əhməd və Məhəmməd”* mənalanmışdı. O dedi:

*“İstisnasız xristian Alimləri İslam peyğəmbərinin (s) Besətindən (Besət peyğəmbərlik məqamına çatması) öncə bu kəlməni belə mənalandırıblar ki, o Həzrətin (s) zühurunu gözləyirdilər, lakin zühurdan sonra öz rəisliklərindən əl çəkə bilməyiblər. Mən də onlar kimi”.*

Fəxrül-İslam sözünə davam verərək yazır:

Dedim: *“Elə isə indi təklif nədir?”*

İslam dinindən sonra başqa dinlər nəsx olunub (Bu cümləni 3 dəfə təkrar etdi).

Mən dedim: *“Bəs qurtuluş yolu hansı yoldur?”*

Dedi: *“Yalnız İslam peyğəmbərinə (s) itaət etmək”.*

Sonra ağladı.

Dedim: *“Ay ruhani Ata, İslam dininə daxil olmağıma icazə verirsənmi?”*

Dedi: *“Əgər axirət və qurtuluş istəyirsənsə, yalnız yolu budur. Mən də sənə duaçı olacağam. Bu şərtlə ki, qiyamət günü mənim də müsəlman olduğuma şahid olasan. Lakin fanatik insanların qorxusundan və habelə riyasətə xatir onu bəyan etməyə acizəm”.*

1. Həzrət İbrahimin (ə) Sühufu – (Fəsil: 3) [12].

a) Peyğəmbərlik onun vücudi ilə başa çatacaqdır. O öz zühuru ilə Allah-təalanın rəhmət və bərəkətini yer üzündə yayacaq.

b) Ey İbrahim,Məhəmməd (s) və onun vəsilərinə salavat və salam göndər.

2. Həzrət Musa (ə) Tövrat-Xilqət kitabı (Fəsil: 2–12) Allah İbrahimə dedi:

Sənin nəslindən böyük bir ümmət yaradaram və sənin adını ucaldaram. O Həra dağında sakin olacaq.

3. Həzrət Süleyman Peyğəmbərin(s) kitabı (Fəsil: 5–16) o Məhəmməddir ki, ağzı şirin olsun. Onun on iki

canişin, möcüzələri var və on ikincisi Allah-təalanın əmri ilə (Bir göy səsindən) sonda qiyam edəcək.

4. Əmbiya Peyğəmbərin kitabı

(Fəsil: 10–42) Allah-Təalanı yeni bir dinlə zikr edər və onun səltənəti özündən sonra başlanar, adı Əhməddir (s).

5. Həzrəti-İsa (ə) İncil-Bornaba (Fəsil: 33–41) Allah Adəmə (ə) bir yazı yolladı. Onda

*“La ilahə illəllah, Muhəmmədun Rəsulallah”*

– yazılmışdı [12, s.62–63].

Sonuncu Peyğəmbər olan Əhmədi-Mürsəli (s) Allah-təala bütün aləmlərə rəhmət olaraq göndərmişdir.

Bu səpgili bədii parçalara digər sənətkarlarımızın da yaradıcılığında tez-tez rast gəlirik:

*Bütün dərvişlərin şahı olubdur Əhmədi-Mürsəl,*
*Ki, “Nuni-Vəl-Qələm,” Quranda səbt etmiş, bu fərmani*
*[6, s.104].*
*(Xaqani Şirvani)*

***

*Din Məhəmməd dinidir, səlla əla sahib vüqar,*
*Kövsərin suyun verən şahım Əlidir şəhsüvar [14, s.59].*
*(Ş.İ.Xətai)*

***

*Ey Həbibullah ki, ismin yazılıbdır ərşdə,*
*Əhmədü Məhmud, Əbülqasim, Məhəmməd, Mustafa.*

“Həbibullah” Məhəmməd əleyhussəlamın ləqəblərindən biri olub, “Allahın sevimlisi, məhəbbət bəslədiyi” deməkdir. Məhəmməd əleyhussalamın ərşdə (göydə) yazılmış adları bu beytdə qeyd olunmuşdur.

“Əhməd” Allahın onu bəyənərək, özünə daha yaxın etdiyi üçün səma üzrə verdiyi ilk adıdır, mənası da “Allah bəyənən” deməkdir və bu ad mələklər arasında onun zikr olunan adıdır. Bu ad əvvəlcə Allah-təalanın “Kətmü ədəm”, yəni gizli olan zati aləmindən cəbərül (əzəmət) aləminə, oradan da lahut (Allahın sifətlərini zahir edən) ilahiyyat aləminə endirilmişdir və bu ad onu Allah-təalaya yaxınlaşdıran mühüm bir vəsilədir. Çünki, Allah-təalanın adlarından biri də “Əhəd” yəni “zatən bir olan”dır. Bu iki adın yazılışca arasında olan yeganə fərq “Əhməd” adındakı “mim” (yəni “m”) hərfindədir ki, onu atsaq “Əhəd” qalır və bu da yuxarıda qeyd etdiyimiz kimi, Allahın adlarından biridir. Necə ki, dərbəndli şair Mirzə Əbdül Kərim Şüayi (nətində) bu fikri tam təsdiqləyərək belə deyir:

*Ləfzi-Əhməddə əgər mabeyni – “ha”vü “dal”də,*
*“Mim” hail olmasa, eyni-xudasan, ya Nəbi.*

Yəni, əgər “Əhməd” sözündə olan “ha” və “dal” (“h” və “d”) hərfləri arasındakı “mim” (“m”) hərfi hail (pərdə, örtük) olmasa, ey Peyğəmbər, sən eynilə Allahsan. Yəni əgər “Əhməd” sözündən “m” hərfi atılsa, “Əhəd” də Allahın bir adıdır və yaxud indiyədək adı bizə məlum olmayan başqa bir şair yenə də Məhəmməd əleyhussəlamın tərifinə həsr etmiş olduğu bir nətində deyir:

*O Əhəddi, sən də Əhməd, götürülsə “mim” adından,*

*Aradan hicab açılsa, bir adın Xuda deyilmi?!*

Hicab ərəbcə "pərdə", "örtük", "çadra" deməkdir. "Məhmud" Peyğəmbər əleyhussəlamın ləqəblərindən biri olub, "gözəl sifətləri olan, tərifə layiq, bəyənilmiş" deməkdir.

Əbülqasim Peyğəmbər əleyhussəlamın künyəsidir. Künyə ləqəblərdən fərqli olaraq, hər hansı bir insanı onun böyük övladının adı ilə "filankəs atası" və yaxud "filankəs anası" – deyə çağırmağa deyirlər ki, Peyğəmbər əleyhussəlamı da onun böyük oğlu Qasimin adı Əbülqasim (Qasim atası) deyə çağırmışlar. Eləcə də Əli əleyhussəlama Əbülhəsən, Fatimeyi-Zəhraya isə Ümmülhəsən (Həsən anası) deyilmişdir. Bəzən də insanın hər hansı bir yaxşı və pis sifətə malik olması, yaxud hər hansı yaxşı və pis işlə məşğul olması təriqilə ərəblər onu həmin sifətin, yaxud həmin işin atası və ya anası deyə adlandırmışlar. Məsələn, Əbutalib, Əbuləhəb, Əbucəhl, Əbutürab, Əbu hüreyrə, Əbülbəşər, Əbülərvah və s.

Müstəfa isə ərəbcə "istifa" sözündən olub, "seçilmə sifətlərin ən seçilmişi" deməkdir. Necə ki, Şüayi yuxarıda qeyd etdiyimiz nətində deyir:

*İsmin Əhməddir, Məhəmməd, həm sifət Məhmud ilə,*
*Çün sifati-istifadən Müstəfasən, ya Nəbi...*

*[15, s.31–33].*

***

*"Xa" – birdi Xaliqi-əkbər,*
*"Dal" – doğru doqquz fələklər,*
*"Zal" – zikr eylə dildə əzbər,*
*"Ra" – rəsulumuz Əhməddi.*

*"Kaf" – "kun" ilə tutub qərar,*
*"Lam" – lal, necə hesab verər?!*
*"Mim" – möminə yol göstərər,*
*İsmi-pakı Muhəmməddi [4, s.41].*
*(Aşıq Ələsgər)*

***

*"Bu Qul, Nəbidən sonra mürşüd Əlini tapdım,*
*Əhməd şəhər idi, Əlini qapısı olaraq gördüm.*
*Həm nəbi, həm vəli, iki aləmin böyük zərrələri,*
*Baxdıqda yəqin olaraq Əlini gördüm".[1]*

***

*"Ey dil, yapış ol Əhmədi-Muxtar ətəyindən*
*Ta ki, nəfəsin var,*
*Səflər dağıdan Heydəri-Kərrar ətəyindən*
*Qəmdən bizi qurtar.*
*Tut silsileyi-seyyidi-əbrar ətəyindən*
*Onlardı dəhü çar[2]*
*Həftad dü tən yavəri-qəmxar[3] ətəyindən*
*Xoşxülq, xoş ətvar.*
*Hər xeyir tökülsə, tökülür var ətəyindən,*
*Bil vazehü aşkar.*
*Yox daneyi-ərzən qədəri şeri-qəzəldən,*
*Zakir, sənə çarə.*

---

[1] Mehmet Rihtim. "Seyyid Yəhya Bakuvi və Xəlvətilik".
[2] Dəhü çar – 14 Məsum, yəni Peyğəmbər (s), qızı Faimeyi-Zəhra (s.ə) və 12 İmam (ə).
[3] Həftad dü tən yavərü-qəmxar – 72 yavər, Kərbəla şəhidləri.

*Tut Ali-Əlinin genə naçar ətəyindən*
*Fəryad elə yalvar” [11, s.308].*
*(Qasım bəy Zakir)*

Qasım bəy Zakir bu şeirində vurğulayır ki, insanların bu dünyada və axirətdə səadətə, xoşbəxtliyə çatması üçün yeganə düzgün yol 14 məsumun ətəyindən tutmaları və 72 nəfər Kərbəla şəhidlərindən ibrət almalarındadır.

Qoşmanın ikinci bəndində haqq aşiqi Novrəs İman islam dinində məşhur olan “Nadi-Əli” duasından söhbət açır və insanları elmin qapısı olan Möminlər Ağası Həzrəti-Əlidən (ə) imdad diləməyə çağırır:

*Əzalarım yeksər ağrar dəmadəm,*
*Tamami bəndləri çox gətirir qəm.*
*Oxuram hər gündə dilimdə mən cəm,*
*“Nadi-Əli Şahsuvari”çağırram [3, s.31].*

“Nadi-Əli” duasının özünüməxsus xüsusiyyətləri vardır. Belə ki, on bir gün ərzində “Ya-Sin” surəsini oxuyub və surədəki hər “mubin” çatdıqda (“Ya-Sin” surəsində 7 yerdə “mubin” sozü işlənmişdir) bu duanı oxuduqda yuxuda Həzrəti- Əlini (ə) görmək olur. Müşkül bir iş üçün və övlad sahibi olmaq üçün bu dua yeddi dəfə oxunur, ruzi üçün sübh vaxtı 9 dəfə, borcu qaytarmaq üçün 15 gün ərzində 22 dəfə oxumaq məsləhət görülüb. Böyük təsirləri qeydə alınmış dualardan biri də, mübarək “Nadi-Əli” duasıdır. Bu dua 2 misradan ibarətdir:

نادِ عَلياً مَظهَرَالعَجائِب
تَجِدهُ عَوَناً لَکَ فِی النَوّائِب
كُلَّ هَمٍ وَغَمَّ سَيَنجَلی
بِوَلايَتِكَياعَلِیُّ ياعَلِیُّ ياعَلِیُّ

**Oxunuşu:**

*Nadi Əliyyən məzhərəl-əcaib!*
*Təcidhu əunən ləkə fin-nəvaib.*
*Kullu həmmin və ğəmmin səyəncəli,*
*Bivilayətikə, ya Əliyyu, ya Əliyyu, ya Əliyy!*

**Tərcüməsi:**

*Əcaibləri aşkara çıxaran Əlini(ə.) çağırır!*
*Onu sənə çətinliklərdə kömək edən görərsən!*
*Bütün qüssə və kədər çəkilib gedər,*
*Sənin vilayətinlə, ya Əli (ə), ya Əli (ə), ya Əli (ə)*
*[20, s.318].*

Novrəs İman kimi haqq aşiqi Abbas Tufarqanlı və Füzuli ədəbi məktəbinin layiqli davamçısı S.Ə.Şirvani də çətin anlarında "Nadi-Əli" duasını tilavət edərmişlər.

Belə ki, Aşıq Abbas Tufarqanlı çətin anlarda "Nadi-Əli" duasını oxuyar və bu duada adı zikr olan Möminlər ağası Həzrəti-Əlini (ə) dadına çağırardı və nicat tapardı. Deyildiyi kimi, Aşıq Abbas Tufarqanlı da haqq aşiqlərdən biri olub. O, haqq aşiqi olaraq səmimi qəlbdən Möminlər ağası Həzrəti-Əliyə (ə) bağlı olan şəxsdir. Aşıq Abbas dar günündə Həzrəti-Əlini (ə) dadına çağırır və Həzrəti-Əli (ə) Abbasın dadına yetişir, ona ən çətin məqamda nicat verir. Rəvayətə görə, Aşıq Abbas Tufarqanlı bağda yatır və yuxuda Mövla Əli (ə) ona eşq butası verir. Bundan sonra Abbası iki dəfə quyuya salırlar. Birinci dəfə Becan onu su quyusu-

na, ikinci dəfə isə Şah Abbas onu zəhər quyusuna saldırır. Hər iki halda Aşıq Abbas Həzrəti-Əlini (ə) dadına çağırır və hər ikisində də öz qəhrəmanına eşq badəsi içirən Həzrəti-Əli (ə) onu dardan qurtarır, özü isə qeybə çəkilir.

“Abbas və Gülgəz” dastanında həmin hissəyə diqqət yetirək.

Birinci dəfə Abbas quyudan xilas olmaq üçün Həzrəti-Əlini (ə) köməyinə çağırır və quyunun dibindən yanıqlı-yanıqlı belə oxuyur:

*İstərəm Şiri-Xudanı,*
*Ağamı, Şahi-Mərdanı.*
*Mən Abbası-binəvanı,*
*Ağlar qoyan hara getdi? [18, s.168].*

İkinci dəfə zəhər quyusundan xilas olmaq üçün yenə Mərdlər ağası Həzrəti-Əlini (ə) dadına çağırır:

*Müşküldə qalıb çağırram səni,*
*Yetiş bir dadıma, ay ağa, haray.*
*Pərvanətək yandım şəmi oduna,*
*Piltətək qovruldum o yağa, haray.*

*İpəki toxullar ələ yapışı,*
*Pərişan zülflərin ələ yapışı,*
*Mərdin qaydasıdı: ələ yapışı,*
*Namərdlər yapışar əyağa, haray.*

*Kəbədən gəlirdim,de,müşkülü nə,*
*Bülbül ərzi halın demiş gülünə,*
*Biçarə Abbasın de müşkülü, nə,*
*Özün dada yetiş, ay ağa, haray [18, s.168].*

Abbas bu sözləri quyunun dibində qəmli-qəmli oxuyarkən gördü ki, quyunun ağzındakı daş kənara getdi və quyunun içərisi işıqlandı. Aşıq Abbas başa düşdü ki, bu iş Həzrəti-Əlinin (ə) işidir. Çox sevincək olub dedi:

*Ağalar ağası Səlli Əla Muhəmməd,*
*Ərənlər sərvəri gəldi, ha gəldi.*
*Düldülün sahibi, Qəmbər ağası,*
*Cansıza can verən gəldi, ha gəldi.*

*"Quran"ı oxuram ayə üzündən,*
*Tökülür söz Peygəmbərin sözündən,*
*Binəmazlar düşüb haqqın gözündən,*
*Haqq aşığın görən gəldi, ha gəldi.*

*Abbas deyər, çağıraram yasağı,*
*Bizə qismət eylə Behişti, bağı,*
*Allahın Rəsulu minmiş Bürağı,*
*Cansıza can verən gəldi, ha gəldi.*

Bu zaman nurani bir şəxs quyunun başında hazır olub, Abbası səslədi və buyurdu: "Ey Abbas! Əlini uzat, əlimi tut". Abbas əlini uzadır, Həzrəti-Əli (ə) öz mübarək əlini ona uzadır və Abbası quyudan çıxarır, sonra buyurur: "Abbas məni tanıyırsan?" Abbas dedi: "Kor olsun o göz ki, səni tanımayır, qulaq as, gör tanıyıram, yoxsa tanımıram:

*Məzhərul-əcaib, tibbül ələtyab,*
*Behiştdə maliksən saqeyi-Kövsər.*
*Natiqi-Quransan,elmin bəyanı,*
*Sənin əlindədir hesabi-dəftər.*

*Sənin varlığınla yer tutdu qərar,*
*Sənin hökmündədir külli, hər nə var,*
*Sənə bəxş eylədi bir Pərvərdigar,*
*Fatimə, Zülfüqar, Düldül və Qənbər*
*[18, s.179].*

***

*Seyyid düşəndə möhnətə "Nadi-Əli" oxuyur,*
*Müşkülquça cahanda "şəhi-la fəta" imiş [9, s.275].*
*(S.Ə.Şirvani)*

S.Ə.Şirvani də bu beytlə bir daha Haqq Aşiqi Novrəs İman kimi "Nadi-Əli" duasından bəhrələndiyini vurğulayır. Qısaca bu beytin açıqlaması budur ki, Seyyid özünə və Həzrəti-Əlinin (ə) vilayətini qəbul edən insanlara çatdırır ki, yaşadığımız bu fani dünyada müşkül işləri həll edən möminlər ağsı Həzrəti-Əlidir (ə). Beytdə işlənilən "şəhi-la fəta" sözündən məqsəd "Ühüd" müharibəsində Allah-Təala tərəfindən vəhy mələyi cənabi Cəbrail (ə) vasitəsi ilə Həzrəti-Əliyə (ə) gətirilən "Zülfüqar" adlı qılıncın üstündə yazılan "la-fəta illa Əli, la seyfi illa Zülfüqar" – "Əlidən şücaətli igid, Zülfüqardan kəsərli qılınc yoxdur".

Ustad aşıq qoşmanın möhürbənddə deyir:

*Gahi xəstəhalam, gahi pərişan,*
*Gahi şad oluram, gah vaxtı giryan.*
*Hərdən darıxanda Novrəstə İman,*
*Dönüb bir də Ələmdarı çağırram [3, s.31].*

Bəndin üçüncü misrasında öncə "Novrəs", "Novrəstə" və "İman" sözlərinin məna açımına diqqət yetirək: "Novrəs" sözü fars mənşəli söz olub, iki mənası var: 1) təzə dəymiş meyvə; 2) cavan, gənc [17, s.483]. "Novrəstə" sözü isə, ərəb mənşəli olub, bir neçə mənanı bildirir. Yeni bitmiş, təzə hasilə gəlmiş, yeni yetişmiş, yeniyetmə və s. [17, s.484]. "İman" sözü isə ərəb mənşəli olub "inanma", "etiqad" mənalarını bildirir [17, s.240].

Zənnimizcə, Novrəs İman gənc yaşlarında ədəbiyyata və müqəddəs dinimizə bağlı olduğuna görə məhz "Novrəstə" təxəllüsünü götürmüşdür.

Qoşmanın "Dönüb bir də Ələmdarı çağırram" – misrasında şair "Hacətlər qapısı, Kərbəla Ələmdarı və İmam Hüseyn (ə) ordusunun sərkərdəsi Həzrəti-Əbülfəzl-Abbası" imdada çağırır.

Bildiyimiz kimi Həzrəti-Əlinin (ə) İmam Həsən (ə) və İmam Hüseyndən (ə) sonra şücaətdə adı çəkilən övladı Abbasdır.

Həzrəti-Əbülfəzl Abbas (ə) Hicri-Qəmərinin 26-cı ili Şəban ayının 4-də dünyaya gəlib. Atası möminlər ağası Həzrəti-Əli (ə), anası Ümmül-Banudur. Həzrətin (ə) ən məşhur ləqəbi Abbasdır. Həmçinin o Həzrətə Əbülfəzl, Əbülqürbə, Qəməri-bəni-Haşim, Babul-Həvaiç, Əbdüs-Saleh və Səqqa da deyirlər. Həzrət Abbas xoş üzlü və gözəl olduğu üçün ona ***"Bənü-Haşimin ayı"*** ləqəbini veriblər. Həzrəti-Abbas (ə) ucaboylu və güclü idi.

İmam Mehdi Sahibəz-Zamandan (əc.f) nəql olunmuş "Nahiyeyi-Müqəddəsə" ziyarətnaməsində o Həzrət (əc.f) Əbül-fəzlin (ə) barəsində belə buyurub: "Salam olsun Həzrət Əlinin (ə) oxlu Əbülfəzlinə. O elə bir kəsdir ki, canını qardaşına qurban verdi. Dünyanı axirətə çatmaq üçün vasitə

etdi. Və o, qardaşına fəda olan keşikçi idi. Və çox çalışdı ki, suyu susuz dodaqlara yetirsin. O bir kəsdir ki, iki qolları Allah yolunda kəsildi”.

İmam Zeynəlabidin (ə) buyurub: “Allah-təalanin yanında Həzrəti-Abbas(ə) üçün elə bir məqam vardır ki, qiyamət günü bütün şəhidlər ona qibtə edərlər”.

İmam Sadiq (ə) buyurur: “Bizim əmimiz Abbas (ə) dolğun təfəkkürlü və imanlı idi”.

Bu növ bədii parçalarla digər sənətkarlarımızın yaradıcılığında da rastlaşırıq:

*Su gətirən dəmdə kəsildi yolu,*
*Qələm oldu bədəndən bir cüt qolu.*
*Zəvvar olaq, Əlinin qəzəb oğlu,*
*Məşqi-ələmpərvəri yektayə biz.*

*Haqq yolunda Hüseyn təki dünyada*
*Yoxdu əhli-əyalın verən bada.*
*Şahi-şühədanı salanda yada,*
*Lənət deyək Şümri-bihəyaya biz [24].*
*(Aşıq Əhməd Rüstəmov)*

***

*Şücaət mülkünün saları kimdir? Həzrəti-Abbas,*
*Mənim şahim də ol meydan ara ol şəhsəvar olmuş,*
*Xoşa ol aşiqi-sadiq ki, olmuş vəhdətə layiq,*
*Tutub küncü-xifa bu xəlqi-aləmdən kənar olmuş [10].*
*(S.Nəbatı)*

***

*Hər aşiqə bu dəhridə ibrətdi Əbülfəzl,*
*Səqqaye-hərəm, miri-şücaətdi Əbülfəzl.*

*Söylərdi ki, ey şahım, Hüseyn, mən sənə çakər,*
*Can verməyə hazırdı nə müddətdi Əbülfəzl.*

*Gördü ona cəng etməyə vermirlər icazə,*
*Bildi ki, şəhid olmağa fürsətdi, Əbülfəzl.*

*Sidq ilə edib əhdə vəfa, yetdi vüsalə,*
*Dərk eylədi Soltan, necə hikmətdi Əbülfəzl [16, s.39].*
*(Hacı Soltan Əlizadə)*

Həzrəti-Əbülfəzl Abbasın (ə) bir çox kəramətləri olub. O kəramətlərdən bir neçəsini bu məqalədə oxucuların diqqətinə çatdırırıq.

*"Burdan çölə çıxın, yoxsa hamınızı öldürərəm!"*

Höccətul-islam vəl-müslimin Hacı Şeyx Əşrəf Kaşani bizə üç kəramət yazıb:

1. Bəndə Həzrəti-Əbulfəzl Abbasın (ə) kəramətini belə müşahidə etmişəm. Səkkiz yaşımda ikən valideynlərimlə birlikdə atamın anasından irs qalan evdə yaşayırdıq. Anamın atası Kaşan məntəqəsinin tanınmış rövzəxanalarından idi. Adı Seyyid Məhəmməd idi. Onun 6 övladı (4-ü oğul, 2-ci qız) vardı. Oğlanlardan ikisi ruhani idi. Böyük oğlu Seyyid Əbul Qasim rövzə oxumaqdan ötrü bir il Semnan məntəqəsinə gedir. Orada bəhailərlə qarşılaşır. Yolunu azmış bu məzhəbin üzvləri onu zəhərləyirlər. O, dəli olmuş halda Kaşana qayıdır. O vaxt mən 8 yaşında idim. Gördüm ki, günlərin birində o, evin üstünə çıxıb öz-özünə belə deyir:

*"Hamınız çıxın çölə, yoxsa sizləri öldürərəm!"*

Üç ilə yaxın bu divanəlik onda davam etdi. Bu vaxtda onun vəziyyəti elə qorxulu idi ki, bütün Kaşan əhalisi ondan qorxub çəkinərdilər. Nəhayət, məcbur olurlar ki, onu zəncirlə bağlasınlar. Sağalmasına da heç kim artıq ümid etmirdi. Üç ildən sonra zövcəsinin Həzrət Əbulfəzl Abbasa (ə) pənah aparması ilə şəfa tapdı. Onun təvəssülü hadisəsi belə olub:

Zövcəsinin atası zahid və mömin bir şəxs imiş. Dünyasını dəyişərkən qızına deyir:

Mən kasıb şəxsəm, əlimdə bir şey yoxdur ki, sənə verəm. Amma elə bir gövhər verirəm ki, min dəfə dünya malından üstündür. Nə vaxt biçarə oldun və nicat yolları üzünə bağlansa get qaranlıq bir otağa, iki rükət namaz qıl və bu iki beyt şeiri oxumağa başla:

*Ey mahi-bəni-Haşim, Xurşidi liqa Əbbas!*
*Ey Nuri-dili-Heydər, Şəmi-şühada Əbbas!*
*Ba mehnəto dərdi cəm, Mən ru be tu avərdəm!*
*Dəste məne məhzun gir, əz bəhri Xuda Əbbas!*

Tərcüməsi:

*Ey bəni Haşimin ayı, Günəşə oxşar Əbbas!*
*Ey Heydərin qəlbinin nuru, şəhidlərin şəmi Əbbas!*
*Dərdli və qəmli halda, sənə üz gətirmişəm!*
*Mən qəmlinin əlindən tut, Allah xatirinə Ya Əbbas!*

Seyyidin divanəliyindən üç il sonra bu vəsiyyət onun zövcəsinin yadına düşür. Aşağı otağa gedir. Heç bir işıq gəlməyən yer tapır. İki rükət namaz qılıb duanı oxumağa başlayır. Özünün dediyinə əsasən birdən görür ki, qaranlıq

otaq işıqlı olur. Başını qaldıranda başının üstündə kəsilmiş bir əlin durduğunu görür. Səs gəlir ki:

*“Dur get! Biz Seyyid Əbul Qasimə şəfa verdik!”*

Tez qalxıb tələsik çölə çıxır. Seyyidin başının üstünə gəldikdə görür ki, yuxudadır. Halbuki, o vaxta qədər gözlərinə yuxu getmirdi.

Kaşan əhalisi xəbərdar olurlar ki, Həzrəti-Əbulfəzl Abbas (ə) Seyyidə şəfa verib. Onlar bir aya yaxın Seyyidin görüşünə gəl-get edirlər. İş o yerə çatmışdı ki, onun əlinin suyundan xəstələrə aparırdılar ki, şəfa tapsınlar.

Harada “Rövzəxan”lıq məclisi olurdusa, birinci onu dəvət edirdilər [13, s.127–128].

***

Bir vaxtlar günortadan sonralar Həzrəti-Əbülfəzl Abbasın (ə) pak hərəmində, sübhlər isə İmam Hüseynin (ə) mübarək hərəmində mənbərə gedirdim. Həzrət Əbülfəzl Abbasın (ə) hərəminin kiliddarı Seyyid Həsən idi. Mən mənbərdə Həzrəti-Əbülfəzl Abbasın (ə) ziyarəti barədə söhbətə başladım. Günlərin birində mənbərdən düşərkən hərəmdə namaz qılan bir Seyyid məni çağırıb dedi:

Bu gün sizin söhbətlərinizi eşitdim. Gördüm, Həzrəti-Əbülfəzl Abbasın (ə) ziyarətinin fəziləti barəsində söhbət edirdiniz. Amma, mən özüm müşahidə etdiyim əhvəlatı sizə nəql edirəm siz də bunu minbərdən əhaliyə nəql edərsiniz. O əhvəlat bu idi.

Kərbəla ətrafında olan çobanlardan birisi bir neçə baş qoyunu bazarda satıb pulunu cibinə qoyub, qayıdırmış. Kərbəladan çıxanda oğrular onun yolunu kəsib, pulunu zorla alırlar. Kişi yarı yoldan Kərbəlaya qayıdır və Həzrəti-Əbulfəzl Abbasın (ə) hərəminə daxil olur.

Həzrətə (ə) xitab edərək buyurur:

*“Ya Babul Həvaic! Nəyim varsa aldılar! Səndən başqa mənim pənah yerim yoxdur”.*

Əhali onun ardınca hərəmə daxil oldular. O, çoxlu ağladıqdan sonra əlini zirehin pəncərəsindən içəri salıb bir neçə dəqiqədən sonra dedi:

*“Ya Əbulfəzl! Təşəkkür edirəm!”*

Pakistan camaatı onu dövrəyə alıb, soruşurlar ki, əlindəki nədir? “O əlini açır. Görürlər ki, əlləri qızıl pulla doludur. Onun əlində bir ədəd qızıl pul qalır. Alverçilər onu da almaq istəyirlər, lakin kişi cavab verir:”

“Əgər Kərbalanı da qızılla doldurub mənə versəniz. Həzrət Əbulfəzl Abbasın (ə) kərəmindən olan bu qızılı sizə verməyəcəm” [13, s.129–130].

Göründüyü kimi Novrəs İmanın yaradıcılığında dini şeirlər xüsusi yer tutur. Biz sadəcə buna ötəri olsa da toxunduq. Təbii ki, bu, ayrıca bir tədqiqatın mövzusudur, şübhəsiz, bu yöndə gələcəkdə də araşdırmalar davam etdiriləcəkdir.

## Ədəbiyyat:

1. Qurani-Kərim. (Ərəb dilindən tərcümə edənlər: Z.M.Bünyadov, V.N.Məmmədəliyev). Bakı, 2005
2. Ayətullah-üzma Nasir Məkarim Şirazi. “Qurani-Kərimin Azərbaycan dilinə tərcüməsi və izahı”. (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, “Nurlar”, 2017
3. Novrəs İman. “Seçilmiş əsərləri”. (toplayıb tərtib edəni: İslam Ələsgər). Bakı, “Səda”, 2004
4. Aşıq Ələsgər. Əsərləri, dastan-rəvayətlər, xatirələr. Bakı, “Şərq-Qərb”, 1999

5. Aşıq Ələsgər. Seçilmiş əsərləri. Şeirlər. Bakı, "Yazıçı", 1988
6. Xaqani Şirvani. Seçilmiş əsərləri. Bakı, "Yazıçı", 1987
7. Yunis İmrə. "Güldəstə". Bakı, "Yazıçı", 1992
8. Sədi Şirazi. "Gülüstan". Bakı, "Azərnəşr", 1987
9. S.Ə.Şirvani. "Seçilmiş əsərləri". Bakı, 1960
10. Seyid Əbülqasim Nəbati. "Seçilmiş əsərləri". Bakı, "Yazıçı", 1985
11. Qasım bəy Zakir. "Seçilmiş əsərləri". Bakı, "Yazıçı", 1984
12. Seyyid Kazım Pərpənci. "Üsuliddin". Bakı, 2003
13. Höccətül-İslam Əli Rəbbani Xalxali. "Qəməri-bəni-Haşim Həzrəti-Əbülfəzl Abbasın nurlu çöhrəsi" (Kəramətlər və mərsiyələr). (Mütərcim: Faiq Vəlioğlu), Bakı, 2003
14. Şah İsmayıl Xətai. "Keçmə namərd körpüsündən" (Şeirlər və poemalar). Bakı, "Yazıçı", 1988
15. Ramiz Faseh. "S.İ.Nəsiminin seçilmiş bəzi şeirlərinin şərhi". Bakı, "Şərq-Qərb", 2007
16. Axund Hacı Soltan Hüseynqulu oğlu. "Məsumnamə". Bakı, "Ozan", 1999
17. "Ərəb və fars sözləri lüğəti". ASSR EA İ.Nəsimi adına Dilçilik İnstitutu. Bakı, "Yazıçı", 1985
18. "Azərbaycan dastanları". Bakı, "Lider nəşriyyat", 2005
19. Hacı Həsən Hüseynov. "Sığın Haqq dərgahına", (məqalələr toplusu-I). Bakı, "Nərgiz", 2013
20. Hacı Həsən Hüseyni. "Əhli-beyt (ə) aşiqi Dədə Ələsgər". Bakı, "İmza", 2022
21. İslam Ələsgər. Novrəs İman // Novrəs İman. "Seçilmiş əsərləri". (toplayıb tərtib edəni: İslam Ələsgər). Bakı, "Səda", 2004
22. Hacı Həsən Hüseyni. "İmam Rza (ə) müxtəlif baxışlarda". Bakı, "Ekoprint", 2019
23. S.S.Babeveyx. "Uyuni-Əxbər-Əl-Riza" (İmam Rzadan (ə) nəql olunmuş hədislər toplusu). I-II cild. Bakı, 2014
24. Aşıq Əhməd. "İtən sazım". Bakı, 1995

*Qaldım bu qürbətdə, zindana düşdüm,*
*Qəbul eylə, bircə ərzim var, ağa!*
*Bu fani dünyada tufana düşdüm,*
*Məxluqa gen dünya, mana-dar, ağa!*

*Mən ha səni çox səslərəm dilinən,*
*Vəsfini oxuram aynan, ilinən.*
*İnsafdımı gəzəm bu müşgülünən,*
*Çəkir məlul könlüm ahu-zar, ağa!*

*Ağada mərhəmət, qulda xata var,*
*İş tənəzzül, gedib əldən ixtiyar.*
*Səndən qeyri kimsəm yoxdu, aşikar,*
*Qoyma qalam belə intizar, ağa!*

*Mənim səbrim yoxdu, huş gedib sərdən,*
*Sənin rəhmin çoxdu cəm bəhrü-bərdən.*
*Qorxuram üqbada narü-səqərdən,*
*Qəhr edə o gündə kirdigar, ağa!*

*…Gözüm açdım, mən yetişdim bəlaya,*
*Aşiq oldum elmi-əmri-Xudaya.*
*Novrəs İman üz tutanda üqbaya,*
*Şəfaətin üçün ümid var, ağa!*

## NOVRƏS İMANIN MÖVLA ƏLİ (Ə) SORAQLI DUYĞU VƏ DÜŞÜNCƏLƏRİ

*Bismillahir-Rəhmanir-Rəhim!*
*Ya Allah ya Rəsul ya Əli səndən mədəd!*

Həzrəti-Məhəmməddən (s) sonra bəşəriyyətin ən kamil şəxsiyyəti olan Həzrəti-Əli (ə) keçdiyi ömür yolu, əqidə və mübarizəsi ilə bütün dövrlərdə sənətkaların duyğu və düşüncələrini özünə doğru çəkmişdir. Zəngin Azərbaycan aşıq poeziyası da bu baxımdan istisna təşkil etmir. Çox nakam bir ömür yaşamış Novrəs İman isə əsl bir Əlisevər kimi həyatının hər bir anında o ulu din böyüyünün əlçatmaz, ünyetməz şəxsiyyətinə sığınmışdır. Aşağıdakı misraların səmimiyyəti bunun danılmaz dəlilidir:

*Qaldım bu qürbətdə, zindana düşdüm,*
*Qəbul eylə, bircə ərzim var, ağa!*
*Bu fani dünyada tufana düşdüm,*
*Məxluqa gen dünya, mana-dar, ağa!*

*Mən ha səni çox səslərəm dilinən,*
*Vəsfini oxuram aynan, ilinən.*
*İnsafdımı gəzəm bu müşgülünən,*
*Çəkir məlul könlüm ahu-zar, ağa!*

*Ağada mərhəmət, qulda xata var,*
*İş tənəzzül, gedib əldən ixtiyar.*
*Səndən qeyri kimsəm yoxdu, aşikar,*
*Qoyma qalam belə intizar, ağa!*

*Mənim səbrim yoxdu, huş gedib sərdən,*
*Sənin rəhmin çoxdu cəm bəhrü bərdən.*
*Qorxuram üqbada narü-səqərdən,*
*Qəhr edə o gündə kirdigar, ağa!*

*Kimi istər, ola dövlət-varınan,*
*Kimi doğru gəzər etibarınan.*
*Mənim bir əhdim var kirdigarınan,*
*Qılam ziyarətin aşikar, ağa!*

*Gözüm açdım, mən yetişdim bəlaya,*
*Aşiq oldum elmi-əmri-Xudaya.*
*Novrəs İman üz tutanda üqbaya,*
*Şəfaətin üçün ümid var, ağa! [3, s.19].*

Göründüyü kimi aşıq qoşmanın başlanğıcında ömrünün çoxunu qəm-kədər içində keçirməsindən və gen dünyanın başına dar olmasından, ikinci bəndində ürək dolusu "İmam ağa" dediyi Həzrəti-Əlinin (ə) müşgülguşalıq (çətinlikləri həll etmə) keyfiyyətinə sığınmasından, üçüncü bənddə bəlli atalar sözü üzərində qurduğu söz oyunu vasitəsilə Həzrəti-Əlinin (ə) şəfaət səlahiyyətindən, dördüncü bənddə el için-də "Əli rəhmi" deyilən anlayışın bütün varlığına hakim kəsilməsindən, beşinci bənddə öz duyğu və düşüncələrinin cəmiyyətin əmlak hərisliyi ilə ziddiyyət təşkil etməsindən, ömrünü Mövla-Əlinin (ə) itaətinə və ziyarətinə sərf etmək istəyindən, sonda isə axirətdə məmdudunun yardımı ilə ilahi mərhəmətinə qovuşmaq diləyindən söz açır, bütün bunları ustalıqla motivə çevirir. Odur ki, bu motivlərin üzərində qurulduğu bəlli məvhumların hər birindən ayrıca danışmaq olar.

Çünki, bu məvhumlar aşığın başqa şeirlərində də öz geniş bədii əksini tapmışdır:

*Meraci-nübuvvət, taci-zülkərəm,*
*Kövkəbi-əxtəran, nəcmi-möhtərəm.*
*Dərgahi-vilayət, şahi-vəlhərəm,*
*Ol Şahi-Mərdana bağışla məni!*

*Mən aşığam mərdana,*
*Dorğru gərək, mərdana.*
*Əfv qıl Mustafaya,*
*Əli Şahi-Mərdana! [3, s.24].*

***

*Dar gündə ümidim, ya Şahi-Mərdan,*
*Yusifi Misirdə qurtaran dardan.*
*Nitq ver meydanda qoyma sərgərdan,*
*Bir günahkar qulun bu İmana bax [3, s.27].*

***

*Əzalarım yeksər ağrar dəmadəm,*
*Təmami bəndləri çox gətirir qəm.*
*Oxuram hər gündə dilimdə mən cəm,*
*"Nadi – Əli" şahsuvarı çağırıram [3, s.31].*

***

*Keçib gərdənimə qəza kəməndi,*
*Gəzdirir aləmi, həm şəhri, kəndi.*
*Bir Şahi-Qəzənfər, dada yetəndi,*
*Vird edirəm Mürtəzanı dilimnən.*

*Sən ey şiri-Xuda, Heydəri-Kərrar,*
*İstəsən, ay ağa, bircə ərzim var:*
*Bu Novrəs İmanı müşgüldən qurtar,*
*Vəsf eyləyim bu sevdanı dilimnən [3, s.38].*

***

*Təvəlla – Əlinin dostunu tanı,*
*Təbərra – seçginən küfrü-düşmanı,*
*Qəsb olan yerlərdən dolan pünhanı,*
*Təmiz tut libasın, xoş adət eylə [3, s.42].*

***

*İmamət Əlini haqq bilib, inan,*
*On bir övladıynan ol Şahi-Mərdan,*
*"Vəliyyikumullah" ayeyi-Quran,*
*Nisbəti Əhmədi-Muxtar eyləyir [3, s.45].*

***

*Görmüşəm camalın o kərəm kanın,*
*Nuri-təcəllanın, yədi-beyzanın.*
*Demədi mətləbin Novrəs İmanın,*
*Eşqə salan yazıq canım Əlidir [3, s.46].*

***

*İsmi vəsiyynən vəliyyi-Xuda,*
*Şiri-pərvərdigar Əlidir, Əli.*
*Edən bədənləri sərindən cüda,*
*Sahibi-Zülfüqar Əlidir, Əli [3, s.46].*

***

*İbtida, dilimdə olub "Bismilah",*
*Sığınmışam ol Xudaya, gəlmişəm!*
*Mənim əzbərimdi "La-fəta-illa",*
*Əxz eləyib yüz min ayə, gəlmişəm.*

*Çəkilib məddimiz doğru ərkana,*
*Əbəs düşməmişəm mən bu məkana.*
*Xidmət eyləmişəm Şahi-Mərdana,*
*Bel bağlayıb Mürtəzaya gəlmişəm [3, s.49].*

Birinci bənd:

*Meraci-nübuvvət, taci-zülkərəm,*
*Kövkəbi-əxtəran, nəcmi-möhtərəm,*
*Dərgahi-vilayət, şahi-vəlhərəm,*
*Ol Şahi-Mərdana bağışla məni!*

*Mən aşığam mərdana,*
*Dorğru gərək, mərdana.*
*Əfv qıl Mustafaya,*
*Əli Şahi-Mərdana! [3, s.24].*

Burada Novrəs İman Əli soraqlı duyğu və düşüncələrini, Həzrəti-Məhəmmədin (s) "Merac" və "Şəfaət"inin üzərində kökləyir. "Merac" və "Şəfaət" isə dinimizin ən aparıcı anlayışlar sırasında yer alır.

Məşhur islam alimlərinə görə merac hadisəsi əsasən Qurani-Kərimdə "İsra" surəsinin 1-ci ayəsində və "Nəcm" surəsinin 7–18 ayələrində əks olunmuşdur. Əvvəlki məqalələrimizin bəzilərində bu məsələyə geniş toxunduğumuz-

dan burada həmin mövzu barədə geniş söhbət açmağı lazım bilmədik. Daha çox “Merac” anlayışını və müəyyən tarixi bilgiləri önə çıxarmağa çalışacağıq. Məşhur türk alimi Akar Metin “Merac” mövzusunu tədqiq edərkən belə yazır ki; “Bu söz ərəbcə “araca” felinin mifal babından bir törəməsi olub yuxarı çıxmaq anlamına gəlməkdədir. Bildiyimiz kimi bu bab bu vəznlə alət adı, hərdən də məcazi olaraq yer adı düzəldilir. Belə olan surətdə “Merac”ın iki lüğəvi anlamı (yuxarı çıxma aləti, yuxarı çıxıla biləcək yer) olduğunu söyləyə bilərik. İstilahi mənada isə nəzərdə tutulan peyğəmbərin (s) göyə çıxması ilə əlaqədar bir möcüzəsinin adıdır [24].

“Merac” hadisənin tarixi ilə bağlı islam alimləri arasında bəzi ixtilaflar vardır. Məsələn, Əhmədağa Əhmədov yazır ki, Peyğəmbərin (s) “Merac”ı besətdən (peyğəmbərə peyğəmbərlik verilməsindən) 12 il sonra baş vermişdir. O, Ramazan ayının “Qədr” gecəsində mələk Cəbrəilin vasitəsilə “Büraq” adlı bir miniyə minərək Ümmi Haninin evindən Məscidül-Həramdan Məcscidül-Əqsaya, oradan da göylərə səfər etmişdir. Bu səfəri zamanı Həzrəti-Məhəmməd (s) Cənnət və Cəhənnəmi görmüş, bir çox qəribə hadisələrin şahidi olmuşdur [16, s.114].

İslam tarixi ilə bağlı araşdırmalar aparan tarixçi alim Şahlar Şərifov isə bu hadisə barədə belə yazır: “Merac hadisəsi besətin 10-cu ili şiə alimlərinə görə, Rəbiül-əvvəl ayının 12-si, sünni alimlərinə görə Rəcəb ayının 27-si, miladi tarixilə 620-ci ildə baş vermişdir. Həzrəti-Peyğəmbərin (s) Məscidül-Həramdan Məscidül-Əqsaya aparılmasına “İsra” (yəni gecə gəzintisi) deyilir. Həzrəti-Peyğəmbərin (s) Məscidül-Əqsadan Cəbrəillə (ə) “Büraq” adlı minikdə ərşə qalxmasına Merac (yüksəlmə) deyilir. Qurani-Kərimin

"İsra" və "Nəcm" surələrində meracdan bəhs olunur. Meracda olarkən Həzrəti-Peyğəmbər (s) ərşin birinci qatında Həzrəti-Adəmlə (ə), ikinci qatında Həzrəti Yəhya (ə) və Həzrəti-İsa (ə), üçüncü qatında Həzrəti-İdris (ə) və Həzrəti-Yusif (ə), dördüncü qatında Həzrəti-Harun (ə), beşinci qatında Həzrəti-Musa (ə), altıncı qatında Həzrəti-İbrahimlə (ə) görüşdükdən sonra öz məqamı olan göyün yeddinci qatı "Sidrətül-müntəhaya" qalxmışdır. Meracda olarkən Həzrəti-Peyğəmbər (s) Allahın üzünü görmədən onunla pərdə arxasından danışmış və Allah tərəfindən üç şey peyğəmbərə hədiyyə edilmişdir: 1. Namaz; 2. Ümmətdən Allaha şərik qoşmayanların Cənnətə gedə biləcəyi müjdəsi; 3. "Bəqərə" surəsinin son ayələri.

Bəziləri Həzrəti-Peyğəmbərin (s) meracda ruhən və ya cismən olması barədə ixtilafa düşmüşlər. Lakin, biz Qurana müraciət etdikdə görürük ki, Həzrəti-Peyğəmbər (s) meracda cismən olmuşdur. Çünki, "İsra" surəsinin birinci ayəsində "biəbdihi" (yəni özünü) deyə müraciət olunur. Əgər Peyğəmbər (s) meracda ruhən olsaydı o zaman "birruhihi" (yəni onun ruhunu) deyə müraciət olunardı" [25, s.28–29].

"Merac" sözünün lüğəti izahı "yüksəliş, nərdivan" və s.deməkdir.

İslam mütəfəkkirləri bir neçə dini məsələ haqqında fikir yürütməyə rəva bilməmişlər. Çünki heç kəsdə bu məsələləri izah etmək qüdrəti yoxdur. Onlardan "Şəqqul-Qəmər" (Peyğəmbərin (s) ayı iki yerə bölməsi), "Miad" (Öləndən sonra yenidən dirilmə), Ruhun nə olduğunu araşdırmaq və Həzrəti-Məhəmmədin (s) merac məsələsidir. Bütün bunlar və bunlara bənzər məsələlərdə ağıl yox, iman əsas götürülür. Çünki hələ heç bir ağıl bu məsələləri aça bilməmiş, heç bundan sonra da aça bilməyəcək. Bunlara yalnız inanmaq

lazımdır. Bunların həqiqətini araşdırmaq və bu haqda fikir söyləmək bəşər əhli üçün yalnız və yalnız nadanlıq, cahillik əlamətidir. O cümlədən də merac məsələsi.

"Merac" mövzusunun bədii təsvir və tərənnümünə həm Novrəs İmanın öz yaradıcılığında, həm də bir çox divan müəlliflərimizin və aşıqlarımızın əsərlərində də tez-tez rast gəlirik:

*Merac edib ərş üzünə varanda,*
*Hamı durdu ayağına, Məhəmməd!*
*Mələklər şad olub güldü, danışdı,*
*Məəttəl qaldın növrağına, Məhəmməd! [5, s.58].*
*(Xəstə Qasım)*

*Gündə beş vaxt səcdəyə get, Şiruyə, eylə vəfa,*
*Məhşər günü sayə salar, eylər dərdinə dəva.*
*Yetəndə Merac evinə Məhəmməd əl-Mustafa,*
*Yeddinci qat göydə qoydu məleykəni Məhəmməd.*
*(Sərraf Şiruyə) [27, s.157]*

***

*Məhəmməd Mustafa endi meracdan,*
*Əlində gətirdi ayə, kölgəsiz [5, s.57].*
*(Xəstə Qasım)*

***

*Cəbrəil ərşdən gətirdi nida,*
*Yetirdi meraca Həbibi-Xuda! [5, s.189].*
*(Xəstə Qasım)*

***

*Rütbeyi-hikməti-meraci-kəmalinə görə,*
*Hükəma firqeyi-dun fəlsəfə cəmi süfəha.*
*(Məhəmməd Füzuli)*

*(Yetkinlik meracının rütbəsinin hikməti müqabilində hikmət sahibləri alçaq təbəqə, filosoflar səfehlər cəmiyyətidir. Merac məsələsi başdan-ayağa hikmət olan elə bir yüksəlmək rütbəsidir ki, o məsələnin izahı qarşısında hikmət sahibləri çox alçaq təbəqə, filosoflar isə bir yığın dəlilərdir) [17, s.38–39].*

***

*Ey qubari, qədəmin ərşi-bərin başına tac,*
*Şərəfi-zatına ədnayi məratib merac. [11, s.220].*
*(Məhəmməd Füzuli)*

***

*Ol məqamın kim, mələk yetməz süqufi nəlinə,*
*Ayağın altında ol bir xaki-padır, ya Nəbi.*
*(Şah İsmail Xətai)*

***

*Qaldı Sidrəl-müntəha, keçdin fələkdən ta zəmin,*
*Kim yetər, bu qədri-həqqə müntəhadır, ya Nəbi.*
*(Şah İsmail Xətai) [18, s.192].*

“Şəfaət bir şəxsə arxa durmaq, sahib çıxmaq yardıma möhtac olan, qorunmağa layiq bir kimsə üçün əfv diləmək və onun yaxşılığına çalışmaqdır”. Peyğəmbərin (s) Allahın izni ilə həm öz ümməti, həmdə bəşəriyyət üçün uzun-uzadı

məhşər sorğu-sualından qurtarmaq məqsədi ilə edəcəyi şəfaətə Şəfaəti-Kubra yəni (böyük şəfaət deyilir). Abdullah ibn Ömər Rəsulullahdan (s) rəvayət edir ki, qiyamət günü insanlar dəstə-dəstə öz Peyğəmbərlərinin (ə) arxasınca o baş-bu başa aparılacaq və Ulul-Əzim Peyğəmbərlərə "Ya Rəsul şəfaət et!" deyə yalvaracaqlar. Bu şəfaət tələbi İslam Peyğəmbərində (s) başa çatır. Allahın Rəsulullahı (s) Məqami-Məhmuda (s) (həmd edilməli dərəcəyə) təyin edəcəyi gün baş verəcək və məhşərdəkilərin hamısı o gün bu şəfaətinə görə ona minnətdar olacaqlar.

"Məqami-Məhmud" Həzrəti-Məhəmməd Peyğəmbərin (s) və övliyaların toplanacağı sahədə İslam rəhbərinin dayanacağı yerdir [12, s.282].

Allah Həzrəti-Muhamməd (s) ümmətinin yarısının cənnətə girməsi ilə onlara şəfaət etmək arasında seçmək hüququ vermiş, daha ümumi və daha kafi bir xilas yolu olduğundan oda "Şəfaəti-kubra"dan sonra öz ümmətindən zərrə qədər imanı olanların əfvi, cəhənnəmə layiq görülmüş bəzi şəxslərin oda atılmamaları, bəzilərini əzablarının yüngülləşdirilməsi və ya dərhal çıxarılması, bəzi şəxslərin hesaba çəkilmədən cənnətə daxil edilməsi üçün Ulu Yaradandan son iltimasını dilə gətirəcəkdir. Ən nəhayət, Rəsulallah (s) öz səhabələrinin bir çoxunun dərəcələrinin yüksəldilməsi və Əhli-beyti (ə) sevənlərin bağışlanması üçün dua edəcəkdir. Şəfaətə inanmayanlarla, müşriklərin şəfaətdən kənarda qalacağını Peyğəmbər (s) xəbər vermişdir: "Qiyamət günü mənim şəfaətim büs-bütün həqiqətdir və şəfaət bir səlahiyyətdir [12, s.282–283].

Kim buna inanmazsa, şəfaət əhlindən olmayacaqdır. Hər Peyğəmbərin (ə) qəbul olunması vəd edilmiş bir duası vardır və hər Peyğəmbər (ə) duasını etməkdə tələsmişdir.

Ancaq mən ümmətimə şəfaət üçün duamı qiyamət gününə saxladım, ümmətimdən Allaha şərik qərar vermədən vəfat etmiş hər bir şəxs, İnşəallah bu şəfaətə layiq olacaqdır".

Biz şəfaət motivi ilə biz Xətai və Füzuli yaradıcılığında da rastlaşırıq.

*Bu Xətai xəstəyə qılgil şəfaət ruzi-həşr,*
*Çünki əslindən səninlən aşinadır, ya Nəbi! [18, s.233].*

*(Ey Peyğəmbər (s) qiyamət günündə bu xəstə Xətaiyə şəfaət et. Çünki, onun əsil-nəsəbi son nəticədə gedib sənə çatır, odur ki, sən də onu özünə dost-doğma bil.)*

Mövlanə Məhəmməd Füzuli Rəsulullahla (s) bağlı şəfaət barədə belə bir beyt yazmışdır:

*Ol qədər zövqü-şəfaət cövhəri-zatındadır,*
*Kim, gəlir ərzi-xəta mənidə bir ehsan sənə.*

*(Sənin zatının mayasında şəfaət zövqü elə çoxdur ki, suçun dilə gətirilməsi, günahın bildirilməsi sənə yaxşılıq etmək mənasına gəlir) [12, s.283].*

İkinci bənd:

*Dar gündə ümidim, ya Şahi-Mərdan,*
*Yusifi Misirdə qurtaran dardan,*
*Nitq ver meydanda qoyma sərgərdan,*
*Bir günahkar qulun bu İmana bax [3, s.27].*

Burada isə el şairi məmduhun müşgülguşalıq keyfiyyətini Yusif peyğəmbərin qissəsi, eləcə də natiqlik sənəti üzərində tərənnüm edir. İmam Əlinin (ə) adı çəkilər-çəkilməz onun müşgülguşalıq keyfiyyəti yada düşür: "İşərinizdə yaxşılığa çağıran, xeyirli işlər görməyi əmr edən və pis əməlləri qadağan edən bir zümrə olsun. Bunlar həqiqətən nicat tapmış şəxslərdir" ("Ali İmran", 104).

"...Peyğəmbər sizə, siz də insanlara şahid olasınız deyə, Allah həm əvvəlki kitablarda, həm də bu kitabda sizi müsəlman adlandırdı. Elə isə namaz qılın, zəkat verin və Allaha möhkəm sarılın ki, O, sizin rəhbəriniz və himayədarınızdır. O, nə gözəl himayədar, nə gözəl yardımçıdır!" ("Həcc", 78).

(Əzizin arvadı) dedi: "Barəsində məni məzəmmət etdiyiniz (adam) bax budur! Mən ondan kam almaq istədim, o isə imtina etdi. Əgər əmrimi yerinə yetirməsə, zindana atılacaq və şübhəsiz ki, xar olacaq".

(Yusif) dedi: "Ey Rəbbim!" Mənim üçün zindan bunların məni sövq etdikləri işi görməkdən daha yaxşıdır. Əgər bunların hiyləsini məndən uzaq etməsən, mən onlara meyl edər və cahillərdən olaram".

Rəbbi "onun duasını qəbul etdi və onların hiyləsini ondan uzaq etdi. Çünki, O, eşidəndir, biləndir. Yusifin günahsız olduğunu təsdiq edən) dəlilləri gördükdən sonra, yenə də bir müddət onu zindana salmaq qərarına gəldilər" ("Yusif", 32, 33, 34, 35).

"Yusif" surəsinin 33-cü ayəsi barədə təfsirdə oxuyuruq "Zindan mənim üçün yaxşıdır". Bəzi hədislərdə var ki, Misir qadınları Yusifin (ə) camalını gördükdən sonra ona ismarış göndərib, ondan kam almaq arzusunda olduqlarını bildirdiər. Bəzi hədislərdə bir qrup qadının əzizin arvadının müdafiəsinə qalxdığı, Yusifi (ə) dövrəyə alaraq yağlı söz-

lərlə onu əzizin arvadının istəyini yerinə yetirməyə təşviq etdikləri qeyd edilmişdir. Hər halda, Yusif (ə) bu qəribə tələdən Allaha sığındı, zindanın çətinliyini Allahın qəzəbinə səbəb olacaq keçici ləzzətdən üstün tutdu və Allahdan onu bu qadınların hiyləsindən xilas etməsini istədi. İslam peyğəmbərinin (s) hədislərinin birində belə buyurulmuşdur: “Allah kölgəsindən başqa bir kölgə olmadığı gün Allah yeddi qrup insanı Öz ərşinin kölgəsinin altına alacaq. Onlardan biri gözəl bir qadının kam almaq dəvətini rədd edib “mən Allahdan qorxuram” deyən şəxsdir”. Bu ayələrin öyrətdiyi mühüm dərslərdən biri də nəfslə mübarizə, ona qarşı cihad dərsidir. Bu cihadı Peyğəmbər (s) “böyük cihad” adlandırmışdır. Çünki, daxili düşmənlə mübarizə xarici düşmənlə mübarizədən daha çətindir. Hədislərin birində belə qeyd edilmişdir: Peyğəmbər (s) bir dəstə müsəlmanı cihada göndərir. Onlar yorğun və yaralı vəziyyətdə geri qayıtdıqlarında Peyğəmbər (s) buyurur: “Kiçik cihadı yerinə yetirənlərə eşq olsun! Ancaq onların böyük cihadları qalıb”. Müsəlmanlar soruşurlar: Ey Allahın rəsulu (s), böyük cihad hansıdır? Peyğəmbər (s) buyurur: “Əsl cihad nəfsi ilə mübarizə aparan şəxsdir”. Hədislərdə “insanın ən böyük düşməni qəzəb və ehtirasdır. Bu iki hissi cilovlayan şəxs yüksək dərəcələrə nail olar, kamilliyin son həddinə yetişər” məzmunu da yer almaqdadır [2, s.239].

Belə bədii parçaların tərənnümünə həm aşığın özünün, həm də bir çox sənətkarların yaradıcılığında rast gəlirik:

*Ustad olan Cəbrailə,*
*Şəksiz, sənsən, ağa!*
*Ol Adəmin təlimini,*
*Yəqin, verənsən, ağa!*

*Ənbiyalar rəhbərisən,*
*Müşgül görənsən, ağa!*
*Yəqin billəm, sən verənsən,*
*Dərdə dərman, ya Əli! [3, s.147].*
*(Novrəs İman)*

***

*Saxla Əli deyənləri,*
*Ahu-zardan, ya Əli!*
*Çıxart qəmli könülləri,*
*İntizardan, ya Əli!*
*Kim ki, sənə şəkk eylədi,*
*Özü düşdü azara;*
*Kim sənə pənah gətirdi,*
*Çıxdı dardan, ya Əli! [3, s.145–146].*

*Özün saxla pənahında,*
*Dolandır bizləri sən.*
*Yer üzündə müsəmanın*
*Ən şirin sözləri sən.*
*Yazıq bu Novrəs İmanın,*
*Dilinin əzbəri sən.*
*Darda qalıb yetmiş dada,*
*Şahi-Mərdan, ya Əli! [3, s.146].*
*(Novrəs İman)*

***

*Qolu bağlı bir nökərsən*
*Şahi-Mərdan Əliyə,*
*Düldül atlı, zülfüqarlı,*
*Sirri pünhan Əliyə,*

*Məzlumların köməkdarı,*
*Canım qurban Əliyə,*
*Döndəribdi haqq yoluna*
*Necə müsəlmanı gör [27, s.158].*
*(Sərraf Şiruyə)*

***

*İstərəm Şiri-Xudanı,*
*Ağamı, Şahi-Mərdanı.*
*Mən Abbası-binəvanı,*
*Ağlar qoyan hara getdi? [23, s.168].*
*(Aşıq Abbas Tufarqanlı)*

Və yaxud;

*Müşküldə qalıb çağırram səni,*
*Yetiş bir dadıma, ay ağa, haray.*
*Pərvanətək yandım şəmi oduna,*
*Piltətək qovruldum oy, ağa, haray [23, s.168].*
*(Aşıq Abbas Tufarqanlı)*

***

*Xəyallı çağırır: ya sirri Xuda!*
*Sənin sürətini gördüm yuxuda.*
*Məni xidmətindən etməynən cida,*
*Aşiqi məşuqə çatdıran Əli! [28, s.124].*
*(Həsən Xəyallı)*

***

*Biz də çağırarıq piri-əzəli,*
*Həllali-müşkülat, valiyi-vəli.*

*Yusifi zindandan qurtaran Əli,*
*Hər kəsin dərdi var, dərman eyləsin!*
*(Miskin Rüstəm Nəvazi)*

***

*Əlinin nuru tufandan qurtardı Həzrəti-Nuhi,*
*Əlidir Yusifi rədd eyləyən zindani-möhnətdən.*
*(Hacı Məhəmməd Təqi Qumri Dərbəndi)*

Üçüncü bənd:

*Əzalarım yeksər ağrar dəmadəm,*
*Təmami bəndləri çox gətirir qəm.*
*Oxuram hər gündə dilimdə mən cəm,*
*"Nadi – Əli" Şahsuvarı çağırıram [3, s.31].*

Ancaq bu misralar Novrəs İmanın bütün varlığına hakim kəsilmiş, tükənməz Əli (ə) məhəbbəti ilə yoğurulmuşdur. "Nadi-Əli" adlanan xüsusi duanın adını çəkməsi isə aşığın imamətlə bağlı mötəbər mənbələrə dərindən bələd olduğunu göstərir:

"Nadi-Əli Şahsuvarı çağırram" – bu misrada haqq aşiqi Novrəs İman islam dinində məşhur olan dualardan biri "Nadi-Əli" duasından söhbət açır və insanları elmin qapısı olan Möminlər Ağası Həzrəti-Əlidən (ə) imdad diləməyə çağırır. "Nadi-Əli" duası iki beytdən ibarət olan bir duadır və özünəməxsus xüsusiyyətləri vardır. Belə ki, on bir gün ərzində "Ya-Sin" surəsini oxuyub və surədəki hər "mubin"ə çatdıqda ("Ya-Sin" surəsində 7 yerdə "mubin" sozü işlənmişdir) bu duanı oxuduqda yuxuda Həzrəti-Əlini (ə) görmək olur. Müşkül bir iş üçün və övlad sahibi olmaq

üçün bu dua 7 dəfə oxunur, ruzi üçün sübh vaxtı 9 dəfə, borcu qaytarmaq üçün 15 gün ərzində 22 dəfə oxumaq məsləhət görülüb. Bu deyilənlərdən başqa bu duanın bir çox xüsusiyyətləri vardır ki, onları qeyd etməyi özümüzə borc bilirik.

Mübarək "Nadi-Əli" duası 2 beytdən ibarətdir:

**نادِ عَلياً مَظهَرَالعَجائِب**
**تَجدهُ عَوَناً لَکَ فِی النَوّائِب**
**کُلَّ هَمٍ وَغَمَّ سَیَنجَلی**
**بِوَلایَتِکَیاعَلِیُّ یاعَلِیُّ یاعَلِیُّ**

**Oxunuşu:**

*Nadi Əliyyən məzhərəl-əcaib!*
*Təcidhu əvnən ləkə fin-nəvaib.*
*Kullu həmmin və ğəmmin səyəncəli,*
*Bi vilayətikə ya Əliyyu, ya Əliyyu, ya Əliyyu!*

**Tərcüməsi:**

*Əcaibləri aşkara çıxaran Əlini (ə) çağırır!*
*Onu sənə çətinliklərdə kömək edən görərsən!*
*Bütün qüssə və kədər çəkilib gedər,*
*Sənin vilayətinlə ya Əli (ə), ya Əli (ə), ya Əli (ə).*

Seyyid Əzim Şirvani də bir qəzəlində "Nadi-Əli" duasından söhbət açır:

*Seyyid düşəndə möhnətə "Nadi-Əli" oxur,*
*Müşkülquşa cahanda "şəhi-la fəta"imiş.*

S.Ə.Şirvani də bu beytlə bir daha Novrəs İman kimi "Nadi-Əli" duasınınn fəzilətlərini vurğulayır. Seyyid özünə və Həzrəti-Əlinin (ə) vilayətini qəbul edən insanlara çatdırır ki, yaşadığımız bu fani dünyada müşkül işləri həll edən möminlər ağası Həzrəti-Əlidir (ə). Beytdə işlənilən "şəhi-la fəta" sözündən məqsəd "Ühüd" müharibəsində Allah-təala tərəfindən vəhy mələyi cənabi Cəbrail (ə) vasitəsi ilə Həzrəti-Əliyə (ə) gətirilən "Zülfüqar" adlı qılıncın üstündə yazılan "La-fəta illa Əli, la seyfi illa Zülfüqar" – "Əlidən şücaətli igid, Zülfüqardan kəsərli qılınc yoxdur" şüarıdır [12, s.318–319].

Beləliklə, İmam Sadin (ə) aşağıdakı sözləri aşıq üçün mötəbər islami məxəz təşkil eməkdədir. "Əli sevgisi elə bir gözəllikdir, elə bir xeyrdir ki, onunla yanaşı günah insana zərər verə bilməz" – yəni o olan yerdə heç bir günah olmaz.

4-cü bənd:

*Keçib gərdənimə qəza kəməndi,*
*Gəzdirir aləmi, həm şəhri, kəndi.*
*Bir Şahi-Qəzənfər, dada yetəndi,*
*Vird edirəm mürtəzanı dilimnən.*

*Sən ey şiri-Xuda, Heydəri-Kərrar,*
*İstəsən, ay ağa, bircə ərzim var:*
*Bu Novrəs İmanı müşgüldən qurtar,*
*Vəsf eyləyim bu sevdanı dilimnən [3, s.38].*

Burada ağır ictimai vəziyyətdən giley duyğuları öndədir. Aşığa görə yalnız Həzrəti-Əlinin (ə) misilsiz ədaləti sayəsində cəmiyyətdə baş alıb gedən ictimai-mənəvi eybəcərliklərin kökünü bir dəfəlik kəsmək olar.

Həzrəti-Əlinin (ə) həyatı burulğanlı bir dənizi andırır. Odur ki, bu ulu din böyüyünün mübarizə yolunu ayrıca nəzərdən keçirmək, bu mübarizəni şərtləndirən islami prinsipləri və tarixi setuasiyanı müəyyənləşdirmək zəruridir.

"Həzrəti-Əli (ə) Həzrəti-Muhəmmədin (s) əmisi oğlu və kürəkənidir. O, doqquz yaşında (m. 609-cu ildə) müsəlman olmuşdur. Mədinəyə hicrətdən sonra mühacir və ənsar arasında aparılan qardaşlaşma zamanı Həzrəti-Muhəmməd (s) onu özünə qardaş elan etmiş və çox sevdiyi qızı xanım Fatimeyi-Zəhranı (s.ə) ona ərə vermişdir. Rəsulullahın nəsli xanım Fatimeyi-Zəhra (s.ə) və İmam Həsənlə (ə), İmam Hüseyn (ə) vasitəsilə davam etmişdir. Həzrəti-Əli (ə) heç vaxt bütə ibadət etməmişdir. O, islam Peyğəmbərinin (s) apardığı bütün müharibələrdə iştirak etmişdir. Həzrəti-Əli (ə) döyüşlərin hamısında misilsiz igidliklə vuruşmuş, çox böyük qəhrəmanlıqlar göstərmişdir. Ələlxüsus, Xeybər səfərindəki qəhrəmanlığı dillərdə dastan olmuşdur. O, yalnız Təbuk müharibəsində iştirak etməmişdir. Ona görə ki, bu zaman Peyğəmbər onu Mədinə şəhərində öz yerində canişin təyin etmişdi.

Həzrəti-Əli (ə) öz sağlığında cənnət muştuluğu alan on şəxsdən biridir. O, Həzrəti-Muhəməd tərəfindən "elmin qapısı" adlandırılmış, məşhur bir qəhrəman, böyük bir zahid və tanınmış bir xətib kimi şöhrət qazanmışdır. "Mürtəza, Heydər Əsadui-lahul-ğalib" kimi ləqəbləri və "Əbul-Həsən, Əbul-Reyhanətəyn, Əbu Turab kimi künyələri məşhurdur".

Həzrəti-Əli (ə) qarabuğdayı, iri qaragözlü, gülərüzlü, ortaboylu, cüssəli, sıx uzunsaqqallı bir şəxs idi [19, s.144–145].

"Həzrəti-Əli (ə)" təqribən beş il çəkən keşməkeşli hadisələrlə dolu olan bir dövrdə xəlifəlik etmişdir. Vəfat etdiyi zaman yaşı altmışı keçmişdi.

Həzrəti-Muhəmməd (s) Həzrəti-Əli (ə) haqqında "Əli məndəndir, mən də Əlidənəm!" buyurmuşdur. Həzrəti-Muhəmməd (s) Həzrəti-Əlinin (ə) Əhli-beytə (ə) mənsub olmasını dəfələrlə bildirmişdir. Məsələn, "Təbuk" döyüşünə gedərkən Rəsulullah(ə) Həzrəti-Əlini (ə) Mədinə şəhərini müdafiə etmək üçün orada saxlamışdı. Həzrəti-Əli (ə) öncə bundan kədərlənərək "Məni qadınlar və uşaqlarlamı qoyub gedirsən?" – deyə etiraz etmişdi. Peyğəmbər (s) isə Həzrəti-Əlinin (ə) bu sualına belə cavab vermişdi: "Heç şübhəsiz, Əliyyi-Mürtəzanın (ə) mənim yanımdakı vəziyyəti Harunun Musanın yanındakı vəziyyəti kimidir!"

Rəsulullah (s) başqa bir inci sözündə belə buyurulmuşdur: "Allah mənə dörd şəxsi sevməyimi tapşırdı və Allahın da dörd şəxsi sevdiyini xəbər verdi". Bu zaman məclisdəkilər həyəcanla onların kim olduqları ilə maraqlandılar. Rəsulullah üç dəfə "Əli onlardandır" – deyə, xüsusi vurğulayıb, sonra "Əbuzər, Miqdad, və Səlman" – deyə əlavə etmişdir.

Həzrəti-Əlinin (ə) fəzilətləri və mənqəbələri qələmə alındığı təqdirdə cildlərlə kitab yaranar. Bu ulu din böyüyü nəfsani duyğulardan uzaq olub, saf qəlbə malik idi, eləcə də onun zahidliyi, qənaətcilliyi və yetkin ixlası misilsiz idi. Həzrəti-Əli (ə) xəlifəliyi zamanı bir an belə haqq-ədalətdən uzaq düşməmişdir. O Həzrət (ə) zəhmətkeşlik, təşkilatçılıq, zəkalılıq, hazırcavablılıq, güclü bir yaddaşa malik olma və müşgülləri həlletmə sahələrində doğrudan da çox bacarıqlı idi. Onun igidlik, qəhrəmanlıq, səxavət, fəsahət və bəlağətinin tayı-bərabəri yox idi. O, həlimliyi və əfvediciliyi, gülərüzlü, xoşxasiyyət olması ilə hamını özünə məftun etmişdi. Elm və fərasət baxımından isə heç kim ona çata bilməzdi.

Xəlifə Ömər "Bizim qazimiz, hakimimiz Əlidir" demişdir. O, həlli çətin məsələlərlə qarşılaşdığı zaman Həzrəti-Əliyə (ə) müraciət etmişdir. Nəhv elminin banisi Əbu Əsvəd Həzrəti-Əlidən (ə) dərs almışdır. Həzrəti-Əlinin (ə) hikmət və nəsihətə, elmi incəliklərə və təsəvvüfə dair çoxlu qiymətli fikirləri var.

Belə geniş fəzilətlərə malik olmasına baxmayaraq, bütün xəlifəliyi boyu Osmanın qətli və intiqamı məsələləri ilə bağlı kədərləndirici və xoşagəlməz hadisələr törədilmiş, Müaviyə ibn əbu Süfyan bundan sui-istifadə edərək, Şamda xəlifəliyi ələ keçirmişdir".

Bəzi subyektiv xüsusiyyətlərinə baxmayaraq bu qeydlər Həzrəti-Əlinin (ə) həyat və fəaliyyətini, əzmli mübarizə tarixçəsini obyektiv surətdə əks etdirir. Belə ki, bu qeydlər inandırıcı tarixi bilgilər əsasında Həzrəti-Muhəmməddən (s) sonar bəşəriyyətin ikinci ən kamil şəxsiyyəti olan Həzrəti-Əlinin (ə) cahil çevrə və irticaçı mühit içərisində necə qərib olduğunu, haqq-ədalət və islami prinsiplərin bərpası uğrunda döyüş meydanında, demək olar ki, tək-tənha qaldığını, bununla belə, bütün varlığı ilə əzəli-əbədi ilahi məqsədləri durmadan həyata keçirmək işində qətiyyən yorulub usanmadığını inkarolunmaz surətdə sübuta yetirir. Lakin, həqiqət naminə deməliyik ki, bu ulu din böyüyünün tarixlərə görk olan dərin məzmunlu ömür yolu və qaynar fəaliyyəti, eləcə də ölməz irsi hələ də özünün xalis niyyəti və dürüst əqidəli tədqiqatçılarının yolunu gözləyir [8, s.23–25].

5-ci bənd:

*Təvəlla – Əlinin dostunu tanı,*
*Təbərra – seçginən küfrü-düşmanı,*
*Qəsb olan yerlərdən dolan pünhanı,*
*Təmiz tut libasın, xoş adət eylə [3, s.42].*

Xalq arasında Firuiddin deyə bilinən islami göstərişlər toplusu burada aşıq üçün çox mötəbər bir bədii silaha çevrilir. Belə ki, "Təvəlla" (Allah dostları ilə dost) və "Təbərra" (Allah düşmənlərindən uzaq olun) buyuruqlarını bilərəkdən ümumilikdən çıxararaq Həzrəti-Əlinin (ə) timsalında xüsusiləşdirir və bununla da parlaq bir obrazlılıq örnəyi yaratmış olur.

İslam dini "Təvəlla" və "Təbərra" təməli prinsipi üzərində qurulmuş bir dindir. Çünki bu dinin əvvəli təbərra ilə yəni Allahın düşməni və Allahın düşmənlərinin tapındığı şeylərdən bizi uzaq durmağa səsləməklə başlayır. Buna misal olaraq İmam Sadiqin (ə.s) buyurmuş olduğu bir gözəl kəlamı qeyd edirik. İmam Sadiq (ə.s) belə buyurur: "Bir kəs "La ilahə illəllaha" iman etsə; bu şəxs düşməni tanıdıqdan sonra dosta yönələr. "La ilahə" yəni: "heç bir ilah yoxdur" deməklə bütün bütləri inkar edirsən. İnkardan sonra deyirsən ki: "İlləllah" yəni: "Yalnız Allah var". Xəstəliyin keçdisə artıq sağlamsan. "La ilahə"dən sonra "İlləllah"ın dəyəri vardır.

Və sonra "Muhəmmədən rəsulullah" yəni: Belə bir Allahın bir də Rəsulu vardır.

Və sonra da "Əliyyən vəliyyullah" yəni: Bu peyğəmbərin bir də vəsisi, höccəti vardır. Ümmətini başlı-başına buraxmadı, Vəsisini tanıtdı…"

Elə buna görə də İmam Rza (ə.s) buyurur ki: "Din, dostluq və düşmənçilikdən ibarətdir."

Yəni yuxarıdakı hədisdən gördüyümüz kimi din, ilk öncə Allahdan qeyri ilahlar sayılan məbudları inkar etməkdir. Yəni dinin əvvəli inkardır, bütləri, Allahın düşmənlərini inkar etməkdir, daha sonra isə tək olan Allahı ibadətə layiq olan yeganə məbud kimi qəbul etməkdir. Yəni din,

Allahı, Allahın dostlarını qəbul etmək və Allahdan qeyri məbud sayılan ilahları və Allahın düşmənmlərini inkar etməkdən ibarətdir. Yəni din “Təvəlla” və “Təbərra”dan ibarətdir (Yəni Allaha görə dost olmaq və Allaha görə düşmən olmaqdan ibarətdir).

Əgər bu gün biz deyiriksə ki, Əhli-Beyti sevir və Əhli-Beytin yolu ilə gedirik gərək Əhli-Beytin düşmənlərini yaxşı tanıyaq və onlardan uzaq duraq. O düşmənlər ki, Peyğəmbərə (s) və onun pak Əhli-Beytinə əzab əziyyətlər çəkdirmiş, Onları incitmiş və narahat etmiş, haqlarını qəsb edərək onlara məxsus olanı onlardan oğurlamışdırlar, Allahu-Təala onlara lənət oxuduğu kimi, biz də gərək onları düşmənimiz olaraq bilək və onlara lənət oxuyaq, necə ki, Allahu-Təala Qurani-Kərimdə buyurur:

“Allahı və Onun Peyğəmbərini incidənlərə Allah dünyada və axirətdə lənət eləmiş (Öz rəhmətindən qovmuş) və onlar üçün həqarətli bir əzab hazırlamışdır!” (“Əhzab”, 57).

Əslində hədislər və ayələr bizlərə hər şeyi bəlli edir, hansı mövqeydə duracağımızı və nə etməli olduğumuzu açıq bir şəkildə bəyan edir. Lakin bu mövzularda yazmaq və Əhli-Beytin düşmənlərinə lənət oxumaq bəzilərinin xətrinə dəyir, bildi bilmədi hər kəs vəhdətdən danışır. Lakin vəhdətin nə olduğunu və nə zaman və harada gərəkli olduğunu bilmir. Və Əhli-Beytin düşmənlərinə lənət oxuduğuna görə və bu dırnaq arası vəhdəti qorumadığına görə sənə elə bir münasibət göstərir ki, bilmirsən bu dostundur yoxsa düşmənin. Axı bu vəhdət dediyin şey nədir? Vəhdət dediyin şey əgər mənim əqidəmə, inanclarıma, dəyərlərimə edilən həqarətlərə göz yümmaqdırsa, yeri gəldikdə öz əqidədaşıma “sus, belə həqiqətləri demə! Qarşı tərəf inciyər” bu-

dursa, o zaman mən sizin inandığınız vəhdətə inanmır və bu batil vəhdəti lənətləyirəm!

Məgər Allah Qurani-Kərimdə buyurmurmu ki: “Siz bilə bilə haqqı batillə qarışdırmayın və haqqı gizlətməyin?”

Haqqı gizlətmək nədir? Məgər haqqı gizlətməyin nəticəsi bu deyilmi ki, haqq batillə qarışıb tanınmaz hala gəlir?

Buna görə də İmam Rza (ə.s), özünü Əhli-Beyt yolunda sanan bu kimi insanlara xitabən belə buyurur: “Biz Əhli-Beytin sevgisinə sarılan (sarıldığını iddia edən) bəziləri vardır ki, onlar şiələrimiz üçün Dəccaldan daha təhlükəlidirlər!

Ravi deyir: “Soruşdum ki; bu necə olur, ey Ağam?!”

Buyurdu ki: “Bizim düşmənlərimizi dost tutarlar, dostumuza düşmən olarlar. Belə olduqda haqq ilə batil qarışar. İşlər dolaşar və mömin ilə münafiq bir-birindən ayırd edilə bilməz.”

And olsun Allaha ki, Əhli-beyt (ə.m) bizə hər şeyi bəyan edir, yetərki Quran və Əhli-beytdən həqiqətən sarılasan. Belə etdikdə Əhli-beytin dostunu da, düşmənini də haqqıyla tanıyarsan! İmam Muhəmməd Baqir (ə.s), Cabir ibn Abdullah Ənsariyə xitabında buyurur ki: “Ey Cabir! Düşmənlərimizdən hacət istəmə! Hətta bir qurtum su belə istəmə. Əks halda cəhənnəmdən keçərkən, “ey filankəs, mən sənə filan yerdə yaxşılıq etmədimmi?” – deyər və sən də çətin vəziyyətdə qalarsan”.

Bu hədisdə İmam Baqir (ə.s) bizi düşmənlərdən o dərəcədə uzaq olmağa səslədi ki, hətta onlardan bir qurtum su belə istəməməyi bizə söylədi, lakin İmam Cəfər Sadiq (ə.s) daha kəskin bir ifadəylə bunu bəyan edir və buyurur ki: “Əgər bizimləsinizsə düşmənlərimizlə nə işiniz var?

Əgər bizimləsinizsə düşmənlərimizin qapısına niyə gedirsiniz? Bir rənginiz və bir şəkliniz olsun".

Yenə İmam Cəfər Sadiq (ə.s) başqa bir hədisdə isə onlara qarşı vəhdət deyil, bəraət etməyin bizə vacib olduğunu bildirərək buyurur ki: "Allahın vəlilərinin vilayət və məhəbbəti və onların düşmənlərindən bəraət (uzaq durmaq) vacibdir! Ali-Muhəmmədə sitəm edənlərdən, onların hörmətini çeynəyənlərdən, Fədəki və Həzrəti Fatimənin (s.ə) mirasını zorla alıb, İmam Əlinin (ə.s) haqqını yağmalayanlardan, Həzrəti Fatimənin (s.ə) qapısını yandırmaq üçün qərar qəbul edib, sitəm binasının əsasını sağlamlaşdırmaq, zəlalət və sapqınlığın öndərləri olan Ənsab və Əzlamdan, zülm və sitəm bayraqdarlarından, birincisindən sonuncusuna qədər bəraət etmək (yəni onlardan uzaqlaşmaq və onlarla düşmən olmaq) vacibdir!!!"

Hətta İmam Sadiq (ə.s) dualarında belə Allahdan istəyir ki, Qiyamət günü Onu Ali-Muhəmmədin düşmənlərindən bəraət edən olaraq onu həşr etsin, vəhdət və onlara qarşı məhəbbət bəsləyən halda deyil! Necə ki, O Həzrətin "Mübahilə günü" belə dua etdiyi nəql edilir: "Ey Rəbbim! Muhəmməd və Ali Muhəmmədə salavat göndər. Və məni sənə iman, Peyğəmbərini təsdiq, Əli ibn Əbi Talibin (ə.s) vilayəti, Ali Muhəmmədin imamlarından tabe olan halda və onların düşmənlərinə bəraət (onların düşmənlərindən bəri, uzaq) və düşmənlik üzərində həşr et. Mən bu inanca razıyam ey Rəbbim!"

"Təbərra"nın bir mənası Allahın düşmənləri ilə düşmən olmaq deməkdir və "Təvəlla"nın isə mənası Allahın dostlarıyla dost olmaq deməkdir ki, bunların ikisi də Firuddinin bəndlərindəndirlər. Lakin Təbərrası olmayan bir kəsin Təvəllası qəbul deyildir! Allah ilə dostsansa gərək Onun düş-

mənləri ilə düşmən olasan, Əgər Allah ilə dost tutub, Onun düşmənləri ilə də dostluq edib onları özünə dost tutursansa sən özün Allahın düşmənisən və münafiqdən qeyri bir şey deyilsən! Necə ki, İmam Sadiq (ə.s) buyurur: "İmam Əlinin (ə.s) düşməninin dostu elə İmam Əlinin (ə.s) düşmənidir".

Əgər Əhli-beyt (ə.m) ilə dostsansa bunu həm qəlbində həm də əməlində göstərəcəksən və əgər Əhli-Beytin düşmənləri ilə düşmənsənsə, o zaman həm qəlbən onlara nifrət edəcək və həm də əməlində bunu təcəssüm etdirəcəksən. (Lakin təqiyyə halı istisnadır!).

Elə dinin kamalı da bununladır, bir kəs Əhli-beytin (ə) vilayətini qəbul edib, düşmənlərindən təbərri etmədiyi müddətcə imanı və dini kamil olmaz! Necə ki, İmam Rza (ə.s) buyurur: "Dinin kəmalı, Biz Əhli-beytin (ə) vilayətinə bağlılıq və düşmənlərimizdən bərat etməkdən (uzaq durmaqdan) ibarətdir".[1]

6-cı bənd:

*İmamət Əlini haqq bilib, inan,*
*On bir övladıynan ol Şahi-Mərdan,*
*"Vəliyyikumullah" ayeyi-Quran,*
*Nisbəti Əhmədi-Muxtar eyləyir [3, s.45].*

Burada isə el şairi öz duyğu və düşüncələrini Əli (ə) və on bir övladı anlayışı üzərində bədii qavrayışa təqdim etməkdədir.

Şair birinci misrada "İmamət Əlinin haqq bil, inan" – deyərkən imamət məqamının seçilmiş şəxslərə Allah-təala

---

[1] Seyyid Mirəddin Haşimi. "Təvəlla" və "Təbərra", "Fiqh dərsləri". 28 iyul 2019

tərəfindən verildiyini çatdırır. "Bəqərə" surəsinin 124-cü ayəsində buyurulur: "(Ya Rəsulum!) Yadına sal ki, İbrahimi öz Rəbbi bir neçə sözlə (bəzi əmrləri ilə) imtahana çəkdiyi zaman o, (Allahın əmrlərini" tamamilə yerinə yetirdi. (Belə olduqda Allah ona:) "Səni insanlara imam (dini rəhbər, başçı) təyin edəcəyəm", – dedi. (İbrahim isə:) "Nəslimdən necə?" – deyə soruşdu. (Allah onun cavabında:) "(Sənin nəslindən olan) zalimlər mənim əhdimə (imamlığıma) nail olmazar" – deyə buyurdu".

Bu ayənin izahı barəsində görkəmli təfsir alimlərindən olan A.N.M.Şirazi öz təfsirində yazır: "Rəbbi İbrahimi müxtəlif vasitələrlə sınağa çəkdiyi zaman" ibarəsinə təfsirçilər belə izah verirlər ki, burada İbrahimin (ə) sınağa çəkildiyi çətinliklər nəzərdə tutulur. Misal üçün, həyat yoldaşını və körpə uşağını quraq Məkkə çölündə qoyması, Babil bütpərəstlərinə qarşı çıxması, onların bütlərini sındırması, oda atılması, istəkli oğlu İsmaili qurban kəsməsi əmri və s. Quran "Səffat" surəsinin 106-cı ayəsində Həzrəti-İbrahimin (ə) ən bariz sınaqlarındn birini – Həzrəti-İsmaili (ə) qurban kəsmək əmrini nəql etmişdir. Təfsirçilərə görə, bu fərman Həzrəti-İbrahimin (ə) ömrünün sonlarında baş vermişdir və o, Allah tərəfindən "imam" olmadan öncə peyğəmbər olmuşdur. Bu imamət məqamının nübuvvət məqamından yüksək olmasına sübutdur. İmam Sadiqdən nəql olunan bir hədisdə oxuyuruq: "Allah İbrahimi peyğəmbər seçməzdən qabaq Öz bəndəsi etdi. Onu rəsul etməzdən qabaq peyğəmbər seçdi. Dostu seçməzdən qabaq rəsulu etdi. Onu imam seçməzdən qabaq Öz dostu etdi. Bütün bu məqamlar onda toplayandan sonra isə ona: "Səni imam təyin edirəm" – buyurdu. Bu məqam İbrahimə (ə) o qədər böyük göründü ki, dedi: "İlahi, mənim nəslimdən də

imamlar təyin et!" İmam o kəsdir ki, insanlar onun ardınca gedirlər. Onu özlərinə rəhbər seçirlər. Onun sözünə, əməlinə tabe olurlar. Peyğəmbərin missiyası ilahi göstərişləri çatdırmaq, insanlara səadət yolunu göstərməkdir. İmamın işi isə ilahi göstərişləri icra etməkdir. Yəni, imam öz ilahi gücü ilə yolu göstərir, hidayət olunmasına, kamilliyə yetməsinə zəmin olanlara bələdçilik edir və mənzil başına çatdırır. Bu ayə imamın məsum (qüsursuz) olmasının dəlillərindən biridir. Çünki, Allah əhdinin (imamətin) zalımlara çatmayacağını bildirir. Zülmün ədalətsizliyin hər növü kim tərəfindən olmasından asılı olmayaraq, yüksək imamlıq məqamından məhrum olmağa səbəb olur" [2, s.19].

İmam (ə) Həzrəti-Peyğəmbərin (s) canişini olub, müsəlmanların rəhbəridir. Ümmətin dini və dünya işlərinin idarəçiliyi onun öhdəsindədir. Buna görə də o, bir sıra xüsusi cəhətlərə sahib olmalıdır, o cümlədən:

**1) Məsum olmalıdır;** İnsanları düz yola yönəldə bilməsi üçün imam (ə) məsum – yəni günahsız və səhvsiz olmalıdır. Çünki, özü günah əhli olan bir şəxs insanları günahdan çəkindirib düz yola yönəldə bilməz.

**2) Qeyb elminə sahib olmalıdır;** Şəriəti təhrifsiz şəkildə insanlara bəyan edə bilməsi üçün imamın (ə) sonsuz ilahi elmə bağlantısı olmalıdır. Çünki, əgər o da başqaları kimi adi bəşəri bilikləri, yaxud güman və ehtimal əsasında danışarsa, onun sözləri insanlar tərəfindən əminliklə qəbul edilməz.

**3) İmam (ə) Allah tərəfindən təyin olunmalıdır:**

İmam (ə) Allahın əmrilə Peyğəmbər (s) tərəfindən, yaxud özündən əvvəlki İmam (ə) tərəfindən təyin olunmalıdır. Çünki, Allahdan başqa kimsə kimsənin məsumluğundan xəbərdar ola bilməz. (Peyğəmbər (s) də Allahın istəyi

və izni ilə bunu edir). Allah hamının keçmişini, bu gününü və gələcəyini, eləcə də batinini və zahirini bilir. Odur ki, müsəlmanların rəhbərliyinə kimin layiq olduğunu yalnız Allah bilir. Qurani-Məciddə də buyurulur: "Allah risalətini harada qərar verdiyini (kimə həvalə etdiyini) yaxşı bilir" ("Ənam", 125).

"On bir övladıynan ol Şahi-Mərdan" – misrasında şair Cəfəri məzhəbinin təməl əqidələrindən dördüncüsü olan "İmamət" məqamına kimlərin layiq olduğunu çatdırır. Həzrəti-Peyğəmbər (s) dünyadan köçdükdən sonra onun vəzifələrini icra etmək, yəni müsəlman cəmiyyətini dini, iqtisadi, siyasi işlərinin idarəçiliyi üçün mütəal Allah 12 nəfər ləyaqətli insanı Peyğəmbərin (s) canişini təyin etmişdir. Həzrəti-peyğəmbər (s) onların adlarını açıqlamışdır. Bir-birinin ardınca bu vəzifələri öhdələrinə götürən məsum imamlar (ə) Peyğəmbərin (s) nəslindəndir və elm, səbr, fəzilət, ədalət, ismət, gözəl əxlaq və bir sözlə, bütün cəhətlərdən peyğəmbərə (s) bənzəyirdilər. Onların peyğəmbərlə tək bir fərqi peyğəmbər olmamalarıdır.

İmamət rəhbərlik deməkdir, yəni Allahın əmri ilə Həzrəti-Peyğəmbərin (s) özünə təyin etdiyi canişinlərin islam ümmətinə rəhbərliyi. İmamların sayı 12-dir: Birinci imam Həzrəti-Əli (ə) və axırıncı imam – Həzrəti Mehdidir (əc.f). "Ey iman gətirənlər! Allaha itaət edin! Peyğəmbərə və özünüzdən olan əmr sahiblərinə itaət edin!" ("Nisa", 59).

Belə bədii parçaların tərənnümünə həm aşığın öz yaradıcılığında, həm də digər sənətkarlarımızın əsərlərində tez-tez rast ıəlirik:

*...On iki imam çaharidəh*
*Məsumin gəlir hesaba;*

*Onları əşrəf yaradıb,*
*Bir hökmran başabaş.*

*On səkkiz min aləm ki, var,*
*Alimlərin dilidir,*
*Ustadlığı izhar edən,*
*Şahi-Mərdan Əlidir.*
*Yetmiş iki millət ki, var,*
*Haqq-islamın yoludur;*
*Mənada bir "Əlif", "Ğayn"*
*Olub Quran başabaş [3, s.122].*

***

*On dörd məsumdur gülümüz,*
*Qeyrisin bilməz dilimiz.*
*Şahi-Mərdandır vəlimiz,*
*Salman ona taya gəldi.*

*Əli mərdlərin mövlası,*
*Silinsin könlümün pası,*
*Behiştin əla libası,*
*Fatimeyi-Zəhraya gəldi [5, s.146].*
*(Xəstə Qasım)*

***

*Əhmədi-Muxtarə aləmdə Əlidür canişin,*
*Çox çətindir munkirin işi peşiman olmasa.*

*On bir övladı ilə mövlanı iman bilginən,*
*Daduva heç kim yetişməz Şahi-Mərdan olmasa.*

*Əhmədi-Mürsəl xəbər vermiş Ğədiri-Xummidə,*
*İsmi-islam arxalanmaz Şiri-Yəzdan olmasa*
*(Manaf. "Qəsidə") [26, s.257].*

***

*Əvvəl İmami özünsən müslimi, ya Murtəza,*
*On bir övladın müdavim, gör nə zivərsən, Əli.*
*Ya əmirəl-möminin, qəlbimdəsən, ruhumdasan,*
*Ey fəda canım sənə, mövlayi-Ənvərsən, Əli [15, s.30].*
*(Hacı Ənvər Nəzərli)*

***

*Dərya qədər günahım var, dərya qədər qəmim var,*
*Köməkdarım qadir Allah, ol Məhəmməd Əlidir!*
*Gecə-gündüz üz sürtürəm onun xaki-payına,*
*Çağırıram o şəxsi ki, sirri qüdrət Əlidir! [27, s.162].*
*(Sərraf Şiruyə)*

Üçüncü misrada söhbət "Vilayət" ayəsindən gedir. "Vilayət" ayəsi "Maidə" surəsinin 55-ci ayəsidir. Ayədə Allah-təala buyurub: "İnnəmə vəliyukumullahu və Rəsuluhu vəlləzinə əmənu əlləzinə yuqimunəs-səlatə və yutunəz-zəkatə vəhum rakiun" – "Sizin rəhbəriniz yalnız Allah, onun Rəsulu və iman gətirib namaz qılaraq rüku halında zəkat verən şəxslərdir" ("Maidə", 55).

Ayənin şəni-nüzulu belədir:

İmam Əbu-İshaq Sələbi "Əl-Kəbir" adlı təfsirində Əbuzər Qəffaridən belə nəql edir: "Mən bu iki qulağımla eşitdim – yalan desəm, hər ikisi də kar olsun – və bu iki gözümlə gördüm – yalan desəm, hər ikisi də kor olsun ki, Həzrəti-Peyğəmbər (s) belə buyurdu: "Əli möminlərin rəhbəri, kafirləri öldürəndir. Ona kömək edən (Allahdan)

kömək görər, onu yalqız buraxan (Allah tərəfindən) yalqız buraxılar.” Bilin ki, mən Həzrəti-Peyğəmbərlə (s) birlikdə namaz qıldığım bir gün bir sail məsciddə xalqdan yardım dilədi. Amma heç kim ona bir şey vermədi. Həzrəti-Əli (ə) isə ruku halında idi, üzük olan orta barmağını sailə tərəf uzatdı. Həmin sail gəlib Əlinin (ə) barmağındakı üzüyü çıxartdı. Bu vaxt Həzrəti-Peyğəmbər (s) Allaha yalvararaq belə dua etdi: “Ey Allahım! Qardaşım Musa sənə dua edərək dedi: “Ey Rəbbim, mənim köksümü aç, işimi asanlaşdır, dilimdəki düyünü aç ki, sözümü başa düşsünlər və mənim öz əhlimdən olan qardaşım Harunu mənə köməkçi et, onunla qüvvətləndir və onu mənim işimə şərik et ki, sənə çoxlu təsbih və zikr edək. Heç şübhəsiz, sən bizim (halımızı) ən yaxşı görənsən.” Sən isə ona: “Ey Musa, dua qəbul edildi və istəyin verildi” – deyə vəhy etdin. Ey Allahım, mən də sənin bəndən və Peyğəmbərinəm; Sən mənim də köksümü aç, işimi asanlaşdır və mənim öz əhlimdən olan Əlini (ə) mənə vəzir (xəlifə, köməkçi) təyin et, onunla məni qüvvətləndir”.

Əbuzər (ə) sözünə belə davam edir: “Allaha and olsun ki, hələ Peyğəmbər (s) sözünü qurtarmamışdı ki, Cəbrail(ə) nazil olub bu ayəni gətirdi: “Sizin vəliniz, rəhbəriniz ancaq Allah, onun elçisi və namaz qılarkən ruku halında zəkat verən möminlərdir.”

“Hər kim Allah, onun elçisi və möminlərlə dostluq etsə, bilsin ki, Allahın firqəsi qələbə çalacaqdır.” (“Maidə”, 56).

Sünnülərin “Sihah” və “Müsnəd” kitablarında nəql etdikləri rəvayətlərdə aydın şəkildə qeyd olunur ki, bu ayə Əlinin (ə) öz üzüyünü ruku halında sailə (fəqirə) verdiyi zaman nazil olmuşdur. Peyğəmbərin (s) zamanında yaşayan

və gözəl təbə malik olan şair Həssan İbni-Sabit bu hadisəni belə nəzmə çəkir. Şeirin sətri tərcüməsi belədir:

"Sən o kəssən ki, ruku halında bəxşiş etdin, canlar sənə fəda olsun, ey ruku edənlərin ən yaxşısı! Allah ən yaxşı vilayəti sənin barəndə nazil etdi və onu şəriətin xələl yetməyən hökmlərində bəyan etdi".

Bu ayənin şəni-nüzulu ilə əlaqədar olan sənədlər həddindən artıq çoxdur [12, s.273–275].

Biz bu motivlə digər sənətkarlarımızın yaradıcılığında da rastlaşırıq:

*Üzük bəxş eyləmişsə sailə ol şəh namaz üstə,*
*Əlində əhli-həqqin hər nə varsa, nəzri-saildir.*
*(M.Füzuli)*

***

*Yeri, döy Əli qapısın, odur ey gədayi-miskin,*
*Kərəmiylə padşahlıq üzüyü verən gədayə.*
*(S.M.Şəhriyar)*

Novrəs İman bəndin sonuncu misrasında "Nisbəti-Əhmədi-Muxtar eyləyir" – deyərkən "Mənzilət" hədisinə işarə edib. "Mənzilət" hədisində peyğəmbərimiz (s) buyurub: "Ya Əli, sənin mənə olan nisbətin Harunun Musaya olan nisbəti kimidir. Bir şərtlə ki, məndən sonra peyğəmbər gəlməyəcək. Sən imam və imamlar atasısan" [20, s.245].

7-ci bənd:

*Görmüşəm camalın o kərəm kanın,*
*Nuri-təcəllanın, yədi-beyzanın.*
*Demədi mətləbin Novrəs İmanın,*
*Eşqə salan yazıq canım Əlidir [3, s.46].*

Novrəs İman məmduhunu daha geniş miqyasda öymək-dən ötrü Musa peyğəmbərin (ə) doqquz möcüzəsindən birini şeirə gətirməkdən belə çəkinmir. Bəllidir ki, Həzrəti-Musa (ə) "üluləzm" (şəriət sahibi olan) peyğəmbərlərdən biridir.

"Əlini qoynuna sal; Çıxanda heç bir qüsursuz, ağappaq və parlaq olacaq. Bu, Firon və onun tərəfdarlarına göndərilən doqquz möcüzədən biridir. Onlar fasiq və həddi aşmış bir qövmdür!". "Açıq-aydın möcüzələrimiz onlara gəldikdə: "Bu, açıq-aşkar bir sehrdir!" – dedilər ("Nəml", 12, 13).

"Biz Musaya doqquz aşkar möcüzə verdik. İsrail oğullarından soruş; Musa onların yanına gəldikdə Firon ona: "Ey Musa! Mən sənin dəli (ya sehrbaz) olduğunu güman edirəm" – demişdi" "(Musa) Dedi: "Sən bilirsən ki, bu möcüzələri yalnız göylərin və yerin Rəbbi ürəklərə işıq bəxş etmək üçün göndərmişdir. Ey Firon, mən güman edirəm ki, sən tezliklə məhv olacaqsan" ("İsra", 101, 102).

"İsra" surəsinin 101-ci ayəsinin izahı barədə təfsirdə oxuyuruq: "Quranda Həzrəti-Musanın (ə) doqquz möcüzəsindən söz açılmışdır. Bu ayədə Firon və qoşunlarının məhv olmasından əvvəl gerçəkləşmiş möcüzələrə işarə edilmişdir:

1. Həzrəti-Musanın (ə) əsasının böyük bir ilana çevrilməsi;

2. Bəmbəyaz əl: Həzrəti-Musa əlini qoynuna salıb çıxardıqdan sonra əli günəş kimi parlayırdı. (Bu iki möcüzəyə "Qəsəs" surəsinin 3-cü ayəsində işarə edilmişdir);

3. Dağıdıcı tufanlar;

4. Firon və tərəfdarlarının tarlalarına və bağlarına daraşmış çəyirtkələr;

5. Onların dənli bitkilərini məhv edən bitki xəstəliyi;

6. Qurbağaların Nildən çıxması və həyatı onlar üçün dözülməz və yaşanmaz edəcək qədər şoxalması;

7. Qan. Firon tərəfdarlarının içməli suları qana döndü. (Bu möcüzəyə "Əraf" surəsinin 133-cü ayəsində işarə edilmişdir);

8. Qıtlıq və quraqlıq;

9. Meyvə qıtlığlığı (Bu möcüzəyə "Əraf" surəsinin 130-cu ayəsində işarə edilmişdir).

8-ci bənd:

*İsmi vəsiyynən vəliyyi-Xuda,*
*Şiri-pərvərdigar Əlidir, Əli.*
*Edən bədənləri sərindən cüda,*
*Sahibi-Zülfüqar Əlidir, Əli [3, s.46].*

Bu misralar məmduhun parlaq məziyyətləri ilə doludur; Məsələn, Həzrəti-Əlinin (ə) vəsiliyi, vəliliyi, Allahın aslanı olması, döyüş meydanının qəhrəmanına çevrilməsi və "Ühüd" müharibəsindəki şücaəti və s.

**"Şiri-pərvərdigar Əlidir, Əli"** misrası daha dərin mənalı mətləblərdən xəbər verir. Novrəs İman bu misrasında Merac əhvalatı ilə bağlı dini rəvayətlərdəki bir məqama istinad edir. Rəvayətdə deyilir ki, Rəsulullah (s) Allahın əmri ilə Məkkədən Qüdsə gəlir və oradan "Büraq" adlı bir məxluqla Meraca qalxır. ("Büraq» haqqında Qurani-Kərimdə müfəssəl olaraq heç bir məlumat yoxdur, yalnız onun adı çəkilir. Şəriət təfsirlərində isə "Büraq" başı adam, bədəni ata bənzər bir heyvan olaraq göstərilir).

Əziz peyğəmbərimiz Məhəmməd əl-Mustafa (s) Meraca gedərkən yatıb yolu kəsmiş bir aslanla rastlaşdı. O an "əmim oğlu Əli (ə) indi burada olsaydı, bunun öhdəsindən

gələrdi" – deyə düşündü. Bu vaxt səs eşitdi: "Üzüyünü aslana ver". Peyğəmbər (s) üzüyünü çıxardı və aslanın ixtiyarına verdi və aslan sakitləşdi.

Rəvayətin sonunda aydın olur ki, Peyğəmbər (s) Meracdan qayıdarkən Qumbədil-Xəzrada (Yaşıl Gümbəz) Qırxlar Məclisinə varid olur və həmin üzüyü Həzrəti-Əlinin (ə) barmağında görür və Həzrəti-Əlinin (ə) hansı yüksək məqamda olduğunu məclis əhlinə çatdırır [12, s.328].

Bu rəvayətlə bağlı bədii parçalara həm Novrəs İmanın, həm də başqa aşıq və şairlərimizin yaradıcılığında da rast gəlirik:

*Bu dünyaya gəlməmişdən,*
*Ağ devin bəndini çatan;*
*Qərran kimi şir donunda*
*Merac yolunda yatan;*
*Qeyrət ilə qul adına*
*Özün Bərbərdə satan;*
*Şəninizə nə deyilsə,*
*Yoxdu böhtan, ya Əli!*

*Ol Xudadan nüsrət oldu,*
*Sən yeridin göylərə;*
*Möcüzatın bəyan oldu,*
*Yetişdi Peyğəmbərə,*
*Novrəs İman dərdi dildə,*
*Yazar vəsfin dəftərə;*
*Zəlil qoyma məhşər günü,*
*Çoxdu üsyan, ya Əli! [3, s.147].*

***

*Can fəda qıldım yolunda,*
*Ya Əmir əl möminan!*
*Tutdun Rəsulun irahın,*
*Xatəmin aldın nişan.*
*Yunisə munis olub,*
*Nuha oldun gəştiban;*
*Xızrla irfana girdin,*
*Sirrini etdin nihan;*
*Nuri-pakın zülmətin*
*Götürdün yerdən, Ağa! [7, s.103].*
*(Aşıq Ələsgər)*

***

*Mustafa gördü səni, aslan sifətli bir mələk,*
*Sahibi -Merac, həm taci –livasan, ya Əli [21, s.251].*
*(Ş.İ.Xətai)*

***

*Çıxdı meraca Muhəmməd, qıldı doğsan min kəlam,*
*Sirri-Həqq, həm məhrəmi-əsrar sənsən, ya Əli [21, s.252].*
*(Ş.İ.Xətai)*

Ş.İ.Xətai bu beytdə deyir ki, Peyğəmbər (s) meraca gedərkən Sidrətül-Müntəhaya çatdı. Dost dosta qovuşdu. Doxsan min kəlam deyildi, otuz mini şəriət, otuz mini təriqət, otuz mini isə həqiqət haqqında idi.

*Edən bədənləri sərindən cüda,*
*Sahibi-Zülfüqar Əlidir, Əli [3, s.46].*

Şair bəndin son iki misrasında açıq-aşkar "Ühüd" müharibəsinə işarə edir. Ühüd müharibəsinin tarixi təsviri belədir: Hicrətin üçüncü ilinin hadisələri əhəmiyyətlilik baxımında ikinci ilin hadisələrindən heçdə geri qalmır. Əgər Hicrətin ikinci ilində Bədr döyüşü baş vermişdisə, Hicrətin üçüncü ilində Ühüd döyüşü baş verdi ki, hər ikisi islamın böyük və əhəmiyyətli döyüşlərindən sayılır.

Əbu Süfyan öz qoşununun bayraqdarlarına xitabən "Qoşunun qələbəsi bayraqdarların səy göstərmələrinə bağlıdır. Biz Bədr günündə elə bu səbəbdən məğlub olduq. Əgər bəni Əbdüd-dad qəbiləsi, bayrağı saxlamaqda səy göstərə bilməyəcəklərsə, elə indidən bayraqları başqa qəbiləyə versinlər" – deyəndə döyüş başlandı bu vaxt bayraqdarlardan biri olan Təlhəd ibni Əbi Təlhə irəlləyib mübarizə istədi və dedi: – Ey Muhamməddin (s) tərəfdarları siz deyirsiniz ki, bizim ölülərimiz cəhənnəmdə, sizinkilər isə cənnətdədir, bu halda sizdən bir nəfər varmı ki, onu cənnətə göndərim və ya o, məni cəhənnəmə göndərsin?

Onun nərəsi meydanda dolaşırdı ki, Əli (ə) irəllədi, qısa müddətli vuruşdan sonra onu torpağa sərdi. Qureyş ondan başqa səkkiz nəfəri, ehtiyat üçün bayraqdar seçmişdi, hamısı da bəni Əbdud-dad qəbiləsindən idilər, hamısının əlində bayraq var idi. Ardıcıl olaraq mübariz istədilər, hamısı da Həzrəti-Əlinin (ə) qılıncı ilə öldürüldülər. Sonra vahiməli siması, enli kürək Həbəşli Suab adlı bir qul bayrağı götürdü. Onun məqsədi Həzrəti-Rəsulu (s) öldürmək idi. Qəzəbindən gözləri qızarmış və ağzı köpüklənmişdi. O da Əlinin (ə) qılıncı ilə məhv edildi.[1]

Qureyş qoşunları islam qoşununun şücaətini gördükdən

---

[1] Ə.Əmini. "Biharul-Ənvar". 20-ci cild. səh. 51

sonra həlqə qurub xüsusi ahənglə şeir oxuyaraq öz qoşunlarına deyirdilər: "Əgər düşmənlə qarşı-qarşıya dursanız, sizinlə qol-boyun olacağıq və əgər düşmənə arxa çevirsəniz, sizdən ayrılacağıq".

Bu qədər tədbirlərlə belə, Qureyş qoşunu onda biçarə oldu ki, on nəfər bayraqdarın hamısını itirdi, vəhşət və qorxu onlara hakim oldu, hamı qaçmağa üz qoydu və müsəlmanlar qalib gəldilər.

İmam Əli (ə) eşqində qələm çalan S.Ə.Nəbati (Xançobani) məhşur bir müsəddisində "Ühüd" döyüşündə Həzrəti-Əlinin (ə) şücaətini belə təsvir edir:

*Çünki Peyğəmbər Ühüd rəzmində qaldı bipənah,*
*Gövhəri-dəndanı sındı, oldu halı çox təbah,*
*Ləşgəri buldu həzimət, getdi əldən dəstigah,*
*Zikr edib bu ismi-pakı, çəkdi canından bir ah:*
*"Şahi-Mərdan, şiri-Yəzdan, Heydəri-Düldülsəvar,*
*La fəta illa Əli, La seyfə illa Zülfüqar".*

*(S.Ə.Nəbati)*

*(Ühüd döyüşündə Peyğəmbər (s) köməksiz qaldığından inci kimi dişləri sındırıldı və vəziyəti olduqca kəskinləşdi, onun həyatı üçün təhlükə yarandı. Ordusu başı pozuqluğa uğradı və qoşunu idarə etmək mümkün olmadı. O, Həzrəti-Əlinin (ə) pak-pakizə adını dərin sayğı və sevgi ilə dilə gətirərək ürəkdən bir ah çəkdi. Həmin ah bundan ibarət idi: "Ey mərd kişilərin hökmüdarı, sən ey Allahın şiri, sən ey asta yerişli Düldülə minmiş yenilməz igid, axı Tanrı özü buyurmuşdur ki; "Əlidən (ə) başqa igid, Zülfüqardan başqa qılınc yoxdur").*

Şair burada "Ühüd" müharibəsinə və həmin müharibədə Həzrəti-Əli (ə) haqqında buyurulmuş hədisə işarə edir. Bu hədisin istinadgahlarından biri belədir:

"Ühüd" müharibəsində Həzrəti-Əli (ə) bütün qüdrəti ilə Peyğəmbərin (s) müqəddəs vücudundan mühafizə edirdi və düşmənləri öldürürdü. Orada olanlar göydən bir səs eşitdilər. Həmin səs (Cəbrailin (ə) səsi) bundan ibarət idi ki: "La fəta illa Əli, La seyfa illa Zülfüqar-İgid yalnız Əli, qılınc yalnız Zülfüqardı".

Bu qılıncın Zülfüqar adlandırılmasının hikməti barədə İmam Sadiqdən (ə) sual etdilər. İmam Sadiq (ə) onların cavabında buyurdu: "Həmin qılıncın orta hissəsində xüsusi fəqərələrə (insanın onurğa sütununun fəqərələrinə) oxşayan bir xətt olduğu üçün bu qılıncın adı Zülfüqar idi, yəni, fəqərələrə sahib olan. Zülfüqar həlqəsi gümüşdən olan bir qılıncdır, Cəbrail (ə) onu göydən gətirmişdi" [22, s.87].

Onu da qeyd edək ki, Ühüd müharibəsində Həzrəti-Əlinin (ə) fədakarlığı elə bir həddə çatdı ki, vəhy mələyi Cəbrail (ə) Peyğəmbərə (s) nazil olub buyurdu "Ey Muhamməd! (s) Bu qardaşlıq və fədakarlıq mənasıdır". Peyğəmbər (s) buyurdu: "İnnəhu minni vəl ənə minhu" – yəni Əli məndən və mən ondanam". Cəbrail (ə) buyurdu: "Və ənə minkumə" – "mən də sizin ikinizdənəm" Ühüd müharibəsində Həzrəti-Əlinin (ə) fədakarlığı elə şövkətli idi ki, Peyğəmbər (s) ondan olması ilə iftixar edirdi və Cəbraildə (ə) arzu edirdi ki, Peyğəmbərdən (s) və Əlidən (ə) olsun, yəni Cəbrail (ə) Peyğəmbər (s) və Həzrəti-Əlinin (ə) malik olduğu fəzilətlərə malik olmaq istəyirdi [14, s.288].

Biz bu motivlə digər sənətkarlarımızın yaradıcılığında da tez-tez rastlaşırıq:

*Səndən özgə gəlmədi ər və qılıcından özgə tiğ,*
*Bu söz öfsafında Həqdəndür müqərrər, ya Əli!*
*(Ş.İ.Xətai)*

*("Dünyaya nə sənin özün kimi igid, nə də qılıncın kimi qılınc gəlmişdir!". Səni səciyələndirən bu söz Ulu Yaradanın uca dərgahından qaynaqlanır ya Əli!).*

*Xanda varsan, ey Xətai, sən bu ləfzi söyləgil;*
*"La fəta illa Əli, la seyfa illa Zülfüqar"* [18, s.59].
*(Ş.İ.Xətai)*

***

*Qasım ağlar zarı-zarı,*
*Var gözəgörünməz tarı,*
*Əli çəkdi Zülfüqarı,*
*Bərbər şəhri raya gəldi* [5, s.147].
*(Xəstə Qasım)*

***

*Dünyəyə gəldi Əli, çün adı oldu Şahsuvar,*
*Yerlər anın ismi ilə çünki tutdular qərar,*
*İslam anın ismilə islama gəldi iftixar,*
*"La fəta illa Əli, la seyfə illa Zülfüqar"* [10, s.289].
*(Seyyid İmadəddin Nəsimi)*

***

*Qeyb əlilə kibriyadan cuşa gəldi ruzigar,*
*Varlığıyla, Mustafayə olmaq üçün cannisar,*
*Verdi İslama Əliyyi-Mürtəzanı yadigar,*
*Qəhrəmanlar qəhrəmanı xalqa etdi aşikar,*

*Tarixə zərlə yazıldı bu zamanlarda şüar:*
*“La fəta illa Əli, la seyfa illa Zülfüqar”*

*Əsrlər aşmış, zamanlar fəth edibdir şöhrətin,*
*Laməkandır qeybdən təqdim olunmuş qismətin.*
*Ruh verir qəlb oxşayan ülfətlərində hörmətin,*
*Rəmzini heyran edibdir xidmətinlə hikmətin,*
*Torpağından öpmək üçün intizarəm, intizar,*
*“La fəta illa Əli, la seyfa illa Zülfüqar”* [26, s.355].
*(Cəfər Rəmzi)*

***

*“La fəta illa Əli, la seyfa illa Zülfüqar”*
*Söyləmişdir Mustafa, dillərdə əzbərsən, Əli [15, s.31].*
*(Hacı Ənvər Nəzərli)*

9-cu bənd:

*İbtida, dilimdə olub “Bismilah”,*
*Sığınmışam ol Xudaya, gəlmişəm!*
*Mənim əzbərimdi “La-fəta-illa”,*
*Əxz eləyib yüz min ayə, gəlmişəm.*

*Çəkilib məddimiz doğru ərkana,*
*Əbəs düşməmişəm mən bu məkana.*
*Xidmət eyləmişəm Şahi-Mərdana,*
*Bel bağlayıb Mürtəzaya gəlmişəm* [3, s.49].

Ən nəhayət, el şairi özünün Əli (ə) soraqlı duyğu və düşüncələrinin qətiyyən mücərrəd olub, havadan asılı qal-

madığını, Həzrəti-Əlinin (ə) zəngin həyat və fəaliyyətinə söykəndiyini, onun mübarizə tarixçəsinə böyük ümidlər üzərində qurulduğunu dərin sayqı və sevgi ilə dilə gətirir.

*İbtida, dilimdə olub "Bismilah",*
*Sığınmışam ol Xudaya, gəlmişəm*

– deyərkən ustad aşıq çatdırır ki, Səmavi kitabımız olan Qurani-Kərimin müqəddiməsi ***"Bismilləhir-Rahmənir-Rahim"*** ayəsi ilə başlanır. "Bismilləh" ayəsi təkcə Quranın yox, bütün səmavi kitabların ("Tövrat", "Zəbur", "İncil", "Suhuf") başlanğıcında olmuşdur. Bütün peyğəmbərlər öz işlərinə "Bismilləh"lə başlamışlar. Həzrəti-Nuhun (ə) gəmisi tufan zamanı dəli dalğalar arasına düşdüyü vaxt Həzrəti-Nuh (ə) öz yoldaşlarına dedi: "Suvar olun (gəmiyə minin), bu gəminin hərəkəti və dayanması Allahın adı ilədir". Həzrəti-Süleyman (ə) Səba məlakəsini – Bilqeyis xanımı imana çağırdığı vaxt öz dəvətnaməsini ***"Bismilləhir-Rahmənir-Rahim"*** ayəsi ilə başladı.

Allah-təala Qurani-Kərində belə buyurmuşdur:

إِنَّهُ مِن سُلَيْمَانَ وَإِنَّهُ بِسْمِ اللهِ الرَّحْمَنِ الرَّحِيمِ

*("O məktub Süleymandandır və "Bismilləhir-Rahmənir-Rahim"lə başlanır).*

Məktub ***"Bismilləhir-Rahmənir-Rahim"*** ayəsi ilə başlanır və məzmunu belədir: "Mənə qarşı təkəbbür göstərməyin və yanıma müti (müsəlman) olaraq gəlin! (Mənim də-

vətimə saymazyana yanaşmayın. Allaha təslim olaraq yanıma gəlin!)”.[1]

İmam Sadiq (ə) buyurub: “Hər bir işdə “Bismilləh” deyilməsə, o iş tamamlanmamış olar” (“Nəml”, 30).

Həzrəti-Əli (ə) buyurmuşdur: “Bismilləh” işlərin bərəkət mayası, onu tərk etmək isə müvəffəqiyyətsizlikdir”.

Həzrəti-Əli (ə) “Bismilləh” ayəsini yazan bir kişiyə deyir: “Onu gözəl yaz”.

Bütün işlərədən qabaq “Bismilləh” demək tapşırılmışdır. Yeməkdən və yatmazdan, yazmaqdan və oxumağa başlamazdan, suvar olmazdan və yola çıxmazdan qabaq “Bismilləh” demək tövsiyə edilir. Hətta “Bismilləh” deyilmədən kəsilən heyvanıın əti haram sayılır. Bütün bu deyilənlərdən belə görünür ki, təkallahlı insanların yeməyi də ilahi rəngdə olmalıdır.

Peyğəmbər (s) buyurur: “Kullu əmrin zibalin ləm yəbdəu Bismilləhi fəhuva əbtəru” – Əvvəli Allahın adı ilə başlanılmayan bütün işlər sonsuzdur, yəni faydasız, naqisdir”.

Kimi yardım üçün bütlərə və zalım hakimlərə, kimi də Allaha və Onun övliyalarına əl uzadırlar.

Hicrətin 5-ci ilində Xəndək döyüşündə yerə ilk külüngü Həzrət Peyğəmbər (s) “Bismilləh” ayəsi ilə vurdu.

Hədisdə oxuyuruq: “Hətta bir beyt şeir yazarkən də “Bismilləh”i unutma.

Uşağa ilk dəfə “Bismilləh” öyrədən şəxsin mükafatı haqqında rəvayət nəql olunmuşdur.

Bütün işlərdən qabaq “Bismilləh” deməyin səbəbi budur ki, bu kəlmə, yəni “Bismilləh” müsəlmanlığın simvoludur.

---

[1] Gülüstan hekayələr. səh. 108

"Bismilləhir-Rahmənir-Rahim" ayəsi müstəqil bir ayədir.

Fiqh rəhbərlərindən yüz il qabaq fəaliyyətə başlamış, Allah yolunda şəhadətə çatmış, Quranda paklığı yad edilmiş Peyğəmbər (s) Əhli-beytinin (ə) etiqadına görə, "Bismilləhir-Rahmənir-Rahim" ayəsi Qurana daxil olan müstəqil bir ayədir.

Fəxri Razi öz təfsirində "Bismilləh"in surə tərkibi olmasına on altı dəlil gətirir. Alusi də bu fikirdədir.

Əhməd ibn Hənbəl öz "Musnəd"ində də "Bismilləh"i surə tərkibi saymışdır. "Bismilləh"i surədən saymayan və ya onu namazda tərk edənlər etirazla qarşılanmışlar. Hakimin "Müstədrək"ində deyilir: "Bir gün Müaviyə namazda "Bismilləh"i demədi. Xalq ona etiraz edərək dedi: "Ayəni oğurladın, yoxsa yaddan çıxardın?"

Məsum İmamlar (ə) israr etmişlər ki, namazda "Bismilləh" ucadan deyilsin. İmam Baqir (ə) namazda "Bismilləh" deməyənlər haqqında buyurmuşdur: "Quranın ən üstün ayəsini oğurladılar".

Beyhəqinin "Sunən"ində bir hədisdə belə deyilir: "Nə üçün bəziləri "Bismilləh"i surədən saymırlar?

Şəhid Mütəhhəri "Fətihə" surəsinin təfsirində İbni Abbası, Asimi, Kəsayini, İbni Öməri, İbni Zubeyri, Ətaini, Tavusu, Fəxri Razini, Suyutini "Bismilləh"i surədən sayanlar kimi tanıtdırır.

"Təfsiri-Qurtəbi"də İmam Sadiqdən (ə) belə nəql olunur: "Bismilləh" surələrin tacıdır". Yalnız "Bəraət" ("Tövbə") surəsinin başlanğıcında "Bismilləh" gəlməmişdir. Həzrət Əlinin (ə) buyruğuna əsasən, bunun səbəbi kafirlərdən və müşriklərdən üz döndərməyi əmr edən "Bəraət" su-

rəsi ilə mərhəmət dolu "Bismilləh" kəlməsinin uyğun gəlməməsidir.

Mövlanə Cəlaləddin Rumi "Bismilləh" haqqında deyir: "Allahın həqiqətlərinin həqiqətinə get, özünü fəda et, yox ol! "Bismi"dəki "əlif" kimi ona qarış, gizlən. O "əlif", "bismi"də gizlənmişdir. "Əlif" həm "bismi"dədir, həm də "Bismi"də yoxdur" [20, s.68–70].

Bəndin son iki misrasında:

*"Mənim əzbərimdi "La-fəta-illa",*
*Əxz eləyib yüz min ayə, gəlmişəm"*

– deyərkən şair möminlər ağası Həztəti-Əlinin (ə) şücaətini vəsf edir. Belə ki, "Ühüd" müharibəsində Həzrəti-Əli (ə) bütün qüdrəti ilə Peyğəmbərin (s) müqəddəs vücudundan mühafizə edirdi və düşmənləri öldürürdü. Orada olanlar göydən bir səs eşitdilər. Həmin səs (Cəbrailin (ə) səsi) bundan ibarət idi ki: "La fəta illa Əli, La seyfa illa Zülfüqar– İgid yalnız Əli, qılınc yalnız Zülfüqardı".

Belə bədii parçaların tərnnümü ilə digər şairlərimizin yaradıcılığında da tez-tez rastlaşırıq:

*Ta xəyalinlə könül mülkündə seyran eylərim,*
*Bən bəni ol şahımın mədhində heyran eylərim,*
*Bən Nəsimiyəm, Şəhin vəsfini dastan eylərim,*
*"La fəta illa Əli, la seyfə illa Zülfüqar".*

***

*"İnnəma"vu "həl-əta"vu "la fəta" şəhrinə gir,*
*"Əyn"ü, "lam"ü, "yey"dən özgə varmıdır canan bizə.*

Nəsimi bu beytdə Quranın beşinci “əl-Maidə” – yəni içərisi yeməklə dolu olan süfrə surəsinini 55-ci “İnnəma vəliyukumullah” ayətindən 76-cı “həl-əta” surəsindən və “La fəta illa Əli, la seyfa illa Zülfüqar” (Əli kimi igid, Zülfüqar kimi qılınc yoxdur).

İkinci misrada "“Əyn”ü, “lam”ü, “yey”dən özgə varmıdır canan bizə?” – deyərkən şair “Əli” adındakı hərflərə işarə edərək bildirir ki, Allah və Peyğəmbərdən (s) sonra rəhbərimiz Mövla-Əlidir (ə). Həmçinin filosof-şair S.İ.Nəsimi Peyğəmbərimizin “Məh hər kimin mövlasıyamsa, Əli də onun mövlasıdır, Əli Haqq ilədir, Haqq da Əli ilədir” hədislərindəndən istifadə etmişdir ki, bütün müfəssir və tarixşilərin yazdıqlarına görə bunların hər biri Həzrəti-Əlinin (ə) şənindədir [9, s.227].

*Əhli-təqva, əhli-iman, əhli-ürfandır Əli,*
*Fatehi-xeybər, vəyiyyi-həqi-Sübhandır Əli,*
*Mürtəzadır, Şahi-Mərdan, Şiri-Yəzdandır Əli,*
*Təkcə bu misra yetər ki, kimdir ol Düdülsəvar:*
*“La fəta illa Əli, la seyfa illa Zülfüqar” [11, s.226].*

Beləliklə, aydın olur ki, Novrəs İmanın Mövla Əli (ə) soraqlı duyğu və düşüncələri məfkurə, mövzu, məzmun, dil, üslub, janr və forma cizgiləri ilə köklü ideya-bədii bir hərəkətə gətirici və istiqamət verici ədəbi məziyyət olaraq meydana çıxmışdır.

**Ədəbiyyat:**

1. Qurani-Kərim. (Ərəb dilindən tərcümə edənlər: Z.M.Bünyadov, V.N.Məmmədəliyev). Bakı, 2005
2. Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017
3. Novrəs İman. "Seçilmiş əsərləri". (toplayıb tərtib edəni: İslam Ələsgər). Bakı, "Səda", 2004
4. "Nəhcül-Bəlağə" (toplayanı: Seyyid Rəzi; tərcümə və şərh, 2 clddə). Bakı, 2017
5. Xəstə Qasım. Bakı, "Folklor İnstitutu", 2010
6. Aşıq Ələsgər. Əsərləri, dastan-rəvayətlər, xatirələr. Bakı, "Şərq-Qərb", 1999
7. Aşıq Ələsgər. "Gözüm bir alagöz xanıma düşdü". Bakı, "Yazıçı", 1993
8. Vərağa Almasov. "Həzrəti-Əli (ə) aşiqi Füzuli". Bakı, "Çaşıoğlu", 2010
9. Ramiz Faseh. "Füzuli şeirində təsəvvüfi qaynaqlar". Bakı, "Elm", 2000
10. Ramiz Faseh. "S.İ.Nəsiminin seçilmiş bəzi şeirlərinin şərhi". Bakı, "Şərq-Qərb", 2007
11. Hacı Ələmdar Mahir. "Səadət intizarında". Bakı, "Ağrıdağ", 1998
12. Hacı Həsən Hüseyni. "Əhli-beyt (ə) aşiqi Dədə Ələsgər". Bakı, "İmza", 2022
13. Hacı Həsən Hüseynov. "Sığın Haqq dərgahına", (məqalələr toplusu-I). Bakı, "Nərgiz", 2013
14. Hacı Həsən Hüseyni. "Şah İsmail Xətai – 535". Bakı, "İmza", 2022
15. Ənvər Nəzərli. "Məhəbbət gülşəni – həsrət çələngi". Bakı, "Səda", 1999
16. Ə.Əhmədov. "Allahın höccətləri", Bakı, 2001

17. Hacı Ələmdar Mahir. “Füzuli qəzəllərinin şərhi”. 3 cilddə. I cild, Bakı, “Elm və təhsil”, 2012
18. Şah İsmayıl Xətai. “Keçmə namərd körpüsündən”. Bakı, “Yazıçı”, 1988
19. Doktor Nuri Ünlü. “İslam tarixi”. III cilddə, I cild. İstanbul, 1997
20. H.Hüseyni. ““Bismilləh” ayəsinin incə görüntüləri və “bə” hərfinin altında olan nöqtənin sirri”. Bakı, “MBM”, 2014
21. Şah İsmail Səfəvi (Xətai) külliyyatı. Qəzəllər, qəsidələr, nəsihətnamə, dəhnamə, qoşmalar. (Tərtibatçısı: Mirzə Rəsul İsmailzadə). Bakı, Əlhuda, 2004
22. Məhəmməd Həsən Muini. “On dörd məsum haqqında sual-cavab”. Bakı, 2009
23. “Azərbaycan dastanları”. Bakı, “Lider nəşriyyat”, 2005
24. Vərağa Almasov. “Füzuli “Leyli və Məcnun”un islami mahiyyəti”. Bakı, “Elm”, 2006
25. Şahlar Şərifov. “İslam tarixi”. Bakı, “Nurlar”, 2013
26. Axund Hacı Soltan Hüseynqulu oğlu. “Gizli xəzinələrdən incilər”. Bakı, “Tural-Ə” NPM, 2002
27. Sərraf Şiruyə. “Susma, ürək...”. Bakı, “SkyG”, 2015
28. Həsən Xəyallı. “Axtar məni”. Bakı, “Nurlan”, 2006

*“Üsuliddin” demək dinin köküdür,*
*Tövhidi – bir Allah aşkar eyləyir.*
*“Qul-hu vəllahi”də dəlildi “Əhəd”,*
*Dildə təkliyini iqrar eyləyir.*

*İkinci Ədldir, Ədalət bir ad,*
*“Və məllah yuridu zulmən lil ibad”.*
*Yəni zülm eyləməz, eyləyər imdad,*
*Dolandırıb hərdən ehzar eyləyir.*

*Üçüncü kəlmədə Nübuvvətdi həm,*
*Yüz iyirmi dörd min peyğəmbərdi cəm.*
*Əvvəli Adəmdir, axırı Xatəm,*
*Dəlili-əhvalın iqrar eyləyir.*

*“Məkana Məhəmməd” xəlq olub əzəl,*
*“Əba Əhəd” vardı o nuri-gözəl.*
*“Və ləhu kan Rəsulullah”dır əzəl,*
*“Kulli-şəyin əlimə” huşyar eyləyir.*

*...Aldanıbsan əgər cifəyə hərdəm,*
*Çəkilər hesabı o gündə möhkəm.*
*Dilində vaynövsə, könlün alar qəm,*
*Novrəs İman sizə izhar eyləyir.*

## NOVRƏS İMAN YARADICILIĞINDA ƏQİDƏ ƏSASLARI

*Bismillahir-Rəhmanir-Rəhim!*
*Ya Allah ya Rəsul ya Əli səndən mədəd!*

Kiçik yaşlarından dini ruhda tərbiyə və təhsil alan Novrəs İman bütün varlığı ilə haqq məzhəb olan Cəfəri (ə) məzhəbinə (şiə təriqəti) bağlanmış və demək olar ki, yaradıcılığını Əhli-beytə (ə) məhəbbətlə bəzəmişdir. Aşığın yaradıcılığına baş vurduqda biz bu deyilənlərin şahidi oluruq. Belə ki, şair yaradıcılığı boyu Qurani-Kərimin ayələrindən, Peyğəmbərimizin (s) buyurduğu hədislərdən, "Üsuliddin"dən, "Firuiddin"dən, şəriət qanunlarından yerli-yerində sitatlar gətirir.

Biz bu məqalədə ustad aşığın "Eyləyir" rədifli qoşmasının şərhini verməyə çalışacağıq:

*"Üsuliddin" demək dinin köküdür,*
*Tövhidi – bir Allah aşkar eyləyir.*
*"Qul-hu vəllahi"də dəlildi "Əhəd",*
*Dildə təkliyini iqrar eyləyir [3, s.44].*

Aşıq Novrəs İman "Eyləyir" rədifli qoşmasının hər bir bəndində Üsuliddin"in maddələrinin bir-bir adlarını çəkir və bildirir ki, "Üsuliddin" (yəni dinin kökləri) beşdir: "Tövhid, Ədl, Nübuvvət, İmamət, Məad".

İslam dinin maarifi üç prinsipin üzərində qurulub: "Üsuliddin", "Firuiddin" və Əxlaq. "Üsuliddin" – dinin köküdür, "Firuidddin" – dinin budaqlarıdır, "Əxlaq" isə dinin meyvələridir.

Bu bənddə haqq-aşiqi “Usuliddin”in ilk maddəsi olan “Tövhid”dən – yəni Allahın təkliyindən bəhs edir. Surə tövhid əqidəsini ən xalis şəkildə bəyan etdiyindən “Tövhid” surəsi kimi tanınır. Kitab əhli və müşriklərdən bir qismi peyğəmbərdən (s) istədilər ki, Allahı onlara tanıtdırsın. “İxlas” (“Tövhid”) surəsi Allahın təqdimatıdır. Həmin vaxt bu surə nazil oldu. Bildirildi ki, Allah oxşarsızdır, Onun şəriki yoxdur, O, pak-pakizədir.

Surənin fəziləti ilə bağlı bir çox rəvayətlər nəql olunmuşdur:

– Hər gün ən azı bir dəfə bu surəni namazlarınızda oxuyun, sonra deyin: “Kəzalikəllahu Rəbbi” yəni “Mənim Rəbbim belədi”.

– Bu surə əhəmiyyət baxımından Quranın üçdə birinə bərabərdir. Onu bir dəfə oxumaq Quranın üçdə birini oxumaq kimidir. Bu surəni üç dəfə oxuyan sanki bütün Quranı oxumuşdur.

– Həzrəti-Peyğəmbər (s) buyurmuşdur: “Tövhid” surəsi Əli ibn Əbu Talib (ə) kimidir. Hər kəs onu qəlbən sevsə imanın üçdə birini əldə etmişdir. Hər kəs onu qəlbən və dildə sevsə imanın üçdə ikisini əldə etmişdir. Hər kəs onu qəlbdə, dildə və əməldə sevsə kamil imana sahib olmuşdur.

– Bu surə namazın təqibatı kimi də tanınır. Rəvayətlərdə bidirilir ki, hər kəs namazdan sonar bu surənin tilavətini tərk etməsə Allah onu dünya və axirət xeyrinə çatdırar, onu, valideynlərini, övladlarını bağışlayar.

– İmam Səccad (ə) buyurur: “Allah bilirdi ki, axır dövrlərdə dəqiq və dərin düşünənlər gələcək. Bu səbədən də “Tövhid” surəsinin və “Hədid” surəsinin ilk altı ayəsini nazil etdi”.

Bu surəsini 6 tərəfə oxumaq insanı təhlükələrdən qoruyur [4, s.1028].

Bəndin üçüncü misrasında şair "Qul-hu vəllahi"də dəlildi "Əhəd" – deyərkən "Tövhid" – kəlməsinin mənasını "İxlas" surəsinin birinci ayəsində olduğu kimi bizə çatdırır. "İxlas" surəsi dörd ayədən ibarətdir. Allah-təala buyurur: "De: O Allah yeganədir. Allah ehtiyacsızdır. Doğmayıb və doğulmayıb. Heç bir bənzəri yoxdur və heç kimsənə ona tay ola bilməz" ("İxlas", 1–4).

Tanınmış təfsir alimlərindən olan A.N.M.Şirazi "İxlas" ("Tövhid") surəsinini ümumi məzmunu, nazil olma səbəbi və onu oxumağın savabı barədə öz təfsirində yazır: "Surədə Allahın təkliyindən söz aşılır. Hədislərdə bu surəni oxumağın savabının çox olması ilə bağlı deyilənlər onun əzəmətli olmasından xəbər verir. Bir gün Peyğəmbər (s) "Sizlərdən bir gecədə Quranın üçdə birini oxumağı bacarmayan bir adam varmı?" – deyə soruşur. Dinləyicilərdən biri deyir: "Ey Allahın rəsulu! Kim bunu bacarar?" Peyğəmbər (s) buyurur: "Qulhuvəllahu əhəd" surəsini oxuyun!" başqa bir hədisində belə buyurmuşdur: "Allaha və Qiyamət gününə imanı olan şəxs namazlardan sonra "Qulhuvəllahu əhəd" surəsini oxumağı unutmasın. Çünki, kim onu oxuyarsa, Allah dünya və axirətin xeyrini onun üçün toplayar, özü, atası, anası və övladlarının günahlarını bağışlayar".

Hədislərdə qeyd edilir ki, evə daxil olarkən bu duanı oxumaq ruzini çoxaldıb yoxsulluğu yox edər. [2, s.604].

Bəndin ikinci misrasında "Tövhidi bir Allah aşkar eyləyir" – deyərkən şair Allah-təalanın əzəmətini çatdırmaq istəyir. Yaxşı olar ki, "Tövhid" və "Əllah" sözlərinin nə məna verdiyinə diqqət yetirək:

"Tövhid" imanla küfr arasında sərhəddir. Tövhidi qəbul etmədən iman qalasına daxil olmaq mümkün deyil. Peyğəmbərin (s) ilk sözü "La ilahə illəllah", tövhid kəlmələri olmuşdur. Tövhid kəlmələri cəmi üç hərfdən təşkil olunmuşdur. (Əlif, lam, ha). Bu kəlmələri zikr edərkən hətta dodaq tərpənmir. (Aşıq ədəbiyyatında buna "dodaqdəyməz" deyirlər. H.H) Amma tövhidə əməl məsum rəhbərlərə itaətdən başlayıb onların canişinlərinə itaətədək davam eir. Çünki, imam Rzanın (ə) buyurduğuna əsasən məsum imama iman gətirmək və ona itaət tövhid şərtidir.

İmam Rza (ə) Məmunun məcburiyyəti ilə Mədinədən Mərvə hicrət etdi. Nişapura çatdığı vaxt insanlar onun ətrafına toplaşdılar, ondan hədiyyə və göstəriş istədilər. İmam buyurdu: "Atam atasından, o da babasından, o da Peyğəmbərdən (s) belə nəql edir ki, Allah buyurur: "la ilahə illəllah kəlməsi mənim qalamdır, hər kəs bu qalaya daxil olsa, mənim əzabımdan amandadır". İmam sonra buyurur: "Əlbəttə ki, bunun şərtləri var. Mən onun şərtiyəm. Yəni vilayətsiz tövhid qəbul deyil". (Silsilətüs-zəhəb-qızıl silsilə hədisi). Bu hədisin raviləri arasında Peyğəmbərə (s) qədər bütün məsum imamlar olduğu üçün buna "Silsilətüs-zəhəb" hədisi deyilir [13, s.157].

İmam Mehdinin (ə) qeybi dövründə də onun öz göstərişi ilə ədalətli fəqihlərə itaət olunmalıdır. Deməк, kamil tövhid Allahın birliyinə inam, istənilən bir şirk, düşüncə və əməldən uzaqlıq, məsum rəhbərlərə itaət, qeyb dövründə ədalətli fəqihlərə tabeçilikdir.

"Əllah" sözü "Vəlihə" sözündəndir. Bu söz "heyrət" mənasını bildirir. Yəni, yaranmışlar ilahi həqiqəti dərk etməkdə acizdirlər, Onun zatını tanıya bilməzlər. Həzrəti-Əli (ə) buyurur: "Allah sözünün mənası budur ki, O yaran-

mışları heyrətə salan məbuddur. Çünki, gözlərdən gizlidir, düşüncələrdən pərdələnmişdir” [4, s.1029].

**“Allah” kəlməsinin mənası:**

İmam Kazımdan (ə) “Allah” kəlməsinin mənası haqqında soruşulduqda buyurmuşdur: “İrili-xırdalı hər bir şey Onun iqtidarının hüdudları daxilindədir”.

İmam Sadiq (ə) bir Allahsızın “O (tanrı), nədir?” sualına cavab olaraq buyurur. O Rəbdir, məbuddur, Allahdır. “Allah” deyərkən “Əlif”, “Lam”, “Ha” həriflərinin (səslərinin) əmələ gətirdiyi bir sözü, eləcə də (Rəbb deyərkən) “Ra” və “Bə”nin əmələ gətirdiyi bir sözü deyil, mənanı, (bütün mövcud olan) varlıqlıarı yaradanın, bu səslərin (birləşməsindən əmələ gələn sözlərin) ifadə etdiyi mənanı nəzərdə tuturam. O, “Allah”, “Rəhman”, “Rəhim”, “Əziz” və bu kimi adalarla ifadə edilən bir mənadır (zatdır). O hər şeydən üstün olan (yeganə) məbuddur”.

İmam Əsgəri (ə) ***“Bismilləhir-Rahmənir-Rahim”i*** təfsir edərkən: “Allah” o varlıqdır ki, hər bir məxluq çətinlik və ehtiyac vaxtı, ümidi Ondan başqa (yardım üçün) səbəbkar tapmadıqda Ona sığınır. Deyir: “Bismilləh”, yəni bütün işlərimdə özündən savayı heç bir şeyi ibadətə layiq olmadığı, köməyə səslədikdə imdada yetə, çağırıldıqda (dua edildikdə) cavab verən Allahdan yardım diləyirəm. Bir zamanlar bir kişidə İmam Sadiqə (ə) müraciət edərək demişdir: “Ey peyğəmbər oğlu, mənə “Allah”ın nə olduğunu aydınlaşdır. Çünki, mənimlə mübahisə edənlər (sofistlər) üstün gələrək məni şəkkə salırlar”. İmam Sadiq (ə) ondan soruşmuşdu: “Heç gəmiyə minməmisənmi?”

– Minmişəm.

– Heç olubmu ki, gəmi sıradan çıxsın və səni xilas edə biləcək başqa gəmidə olmasın, canını qurtara biləcək üzgüçülük qabiliyyətin də olmasın?

– Bəli, olub.

– Heç o zaman qəlbindən keçibmi ki, aləmdə səni xilas edə biləcək bir varlıq vardır?

– Bəli.

– Bax, həmin varlıq heç bir xilaskarın olmadığı vaxt xilas etməyə, heç bir yardımçının olmadığı vaxt imdada yetməyə qadir olan Allahdır.

Mütəal Allahın bir çox adları vardır. Qurani-Kərimdə bu barədə buyurulur: “Va lilləhil-əsmaul-hüsna, fəduhu bihə – Allahın gözəl adları var, Onu həmin adlarla çağırın!” Lakin bu adların ən üstünü Allah kəlməsidir ki, ona elmi-ədəbi dildə “ləfzi-cəlalə” deyilir. Rəbbimizin digər adları “ləfzi-cəlalə (Allah kəlməsi)” kimi deyil. Bu kəlmə beş hərfdən ibarətdir. Bu hərflərdən hansı birini azaltsan, yerdə qalan hərflər yenə də Allaha işarə edir. Məsələn, mübarək Allah kəlməsi əslində “Əl-İlah (aləmləri heyran qoyan)” kəlməsi olub. Bu kəlmənin tez-tez təkrarlanması nəticəsində ortada gələn həmzə (“i” hərfi) düşərək “Əllah” formasını alıb yenə də həmin mənanı daşıyır. Bu kəlmədən birinci “ə” və “l” hərfləri düşərsə, yerdə “lah” qalar ki, bu sözü keçmiş zaman formasında “lahə” şəklində oxusan, “əql və düşüncə sahiblərini heyran qoydu” mənasına gələr. Bundan isə “a” hərfi düşərsə, yerdə “ləh – Onun, Ona” kəlməsi qalar. Necə ki, bu kəlmədən təşəhüddə istifadə edərək “vəhdəhu lə şərikə ləh” deyirik. Yaxud dua etdikdə “ləhul-həmdu və ləhuş-şukr” deyirik. Bu kəlmədən də “l” hərfi düşərsə, yerdə “hu” kəlməsi qalar ki, bunun da mənası “O (yəni, Allah)” deməkdir. Məsələn, “ənhu – Onun haqqında”, “minhu

– Ondan”, “lə iləhə illə hu – Ondan başqa heç bir Tanrı yoxdur”.

Lakin Allahın digər adlarından hər hansı bir hərfi azaltsan, məna dəyişərək daha əvvəlki mənaya işarə etməz. Buna misal olaraq Allahın “Rəhim və Rəhman” adlarına nəzər salaq. “Rəhim” kəlməsindəki “i” hərfini, Rəhmandan isə “a” və “n” hərflərini çıxarsaq, “rəhm” kəlməsi qalar. Lakin bu iki kəlmənin ilk hərfini (“r” hərfini) çıxarsaq, yerdə “him” və “hman” kəlmələri qalar ki, bunlar daha “rəhm” mənasını verməz. Elə bu baxımdan Allah kəlməsi bütün kainatda olan isimlərin ən üstünüdür. Çünki bu kəlmənin hər bir hərfi Mütəal Allaha işarə edir.

Bəzi “nəhv (qrammatika)” alimləri belə iddia ediblər ki, “ləfzi-cəlalə” (“Allah” kəlməsi) “Mədinə (şəhər)” kəlməsi kimi ismi-cinsdir (ümumi bir addır). Yəni, ağlı heyran qoyan hər bir əşyaya “İlah”, yaxud “Allah” demək olar. Amma bu kəlmə yalnız aləmləri yaradan Rəbbimizə aid edilməklə ümumilikdən çıxaraq xüsusiləşmişdir. Necə ki, “Mədinə (şəhər)” sözü yalnız Peyğəmbərin (s) yaşadığı şəhərə həsr edilməklə xüsusiləşib.

Qeyd etməliyəm ki, bu iddianı irəli sürən nəhv alimləri bu barədə böyük bir xətaya düçar olublar. Çünki onlar şəhərlərlə Rəbbimizi müqayisə edərək bu nəticəyə gəliblər. Halbuki “əynət-turab və Rəbbul-ərbab” – “torpaqlar, şəhərlər hara, onları yaradan Rəbbimiz hara!” Şəhərlərin sayı çox olduğu üçün bu ad (mədinə) onlardan birinə həsr edilə bilər. Amma aləmləri yaradan Allahın sayı, tayı yoxdur ki, bu kəlmə digərlərinə deyil, Ona verilsin [11, s.125, 129].

Yuxarıda deyilənlərdən aydın oldu ki, Allah kəlməsində Onun bütün isimləri cəm olub. Allahı bu isimlə çağıran şəxs Onu bütün isimləri ilə zikr etmiş sayılır. Qurani-Kə-

rimdə Allah kəlməsi digər isimlərindən daha çox zikr olunub.

Bəndin 3-cü və 4-cü misralarına ("Qul-hu vəllahi"də dəlildi "Əhəd", Dildə təkliyini iqrar eyləyir") – diqqət yetirək. Təfsir alimlərindən A.M.Qiraəti özünün "Nur" təfsirində "İxlas" – "Qul-hu vəllahi Əhəd" surəsini izah edərkən "Əhəd" və "Vahid" sözlərinin fərqini belə izah edir: "Vahid" və "Əhəd" sözləri arasınd fərq var. "Vahid" sözü o zaman işlədilir ki, onun ardınca iki və üç də olsun. "Əhəd" sözü isə "yeganə" mənasını bildirir. Əgər deyilsə ki, insanın qarşısına bir nəfər çıxa bilməz, bu o deməkdir ki, iki nəfər çıxa bilər. Amma əgər deyilsə ki, bir nəfərin qarşısına kimsə çıxa bilməz, bu o deməkdir ki, onun qarşısına şıxacaq qüvvə yoxdur. "Əhəd" sözü "bir" yox, "yeganə" mənasını bildirir [4, s.1029].

Allah təkcə zatı baxımından yox, həm də sifətləri baxımından yeganədir. O, biz insanlar kimi deyil ki, sifətləri zatından ayrı olsun. Bizim bu gün elm və gücümüz var. Amma uşaq vaxtı bu sifətlərə malik deyildik. Qocaldığımız vaxt isə həmin sifətləri əldən veririk. Allahın elm və qüdrəti var və O, bu sifətləri sonradan qazanmayıb. Elm və qüdrət Allahın zatındadır. Məxluqluq, acizlik, yoxsulluq heç vaxt bizdən ayrı olmayıb və olmayacaq.

Allah istənilən bir baxımdan yeganədir. Onun zatı, sifətləri, elmi, qüdrəti, hikməti yeganədir: "Qul-hu vəllahi Əhəd" – "De ki, O yeganə Allahdır".

Həzrəti-Əli (ə) oğlu İmam Həsənə məktubunda yazır: "Əgər Rəbbinin şəriki olsaydı o da peyğəmbərlər göndərərdi. Beləcə, insanlar onu tanıyar, bəndəlik edərdilər".[1]

---

[1] "Nəhcül-bəlağə". 31-ci məktub.

Növbəti bənddə şair Allahın ədalət sifətini vəsf edir:

*İkinci Ədldir, Ədalət bir ad,*
*"Və məllah yuridu zulmən lil ibad".*
*Yəni zülm eyləməz, eyləyər imdad,*
*Dolandırıb hərdən ehzar eyləyir [3, s.44–45].*

Bəndin birinci misrasında "Usuliddin"in ikinci maddəsi olan Ədldən söz açılır. Allah ədalətlidir və əsla zülm etməz. Cəfəri məzhəbinə görə dinin təməl əqidələrindən ikincisi Ədalətdir. Ədalət mütəal Allahın **"camal"** sifətlərindəndir.

Qeyd edək ki, ilahi ədaləti qəbul edib etməmək bir sıra dini mövzuların izahını dəyişdirəcəkdir. Məsələn, nübuvvət və imamətin fəlsəfəsi, dini göstərişlərin fəlsəfəsi, mükafat və cəza meyarları, cəbr və təfviz" (məcburiyyət və ya tam sərbəstlik) məsələsi bu mövzulardandır.

Bundan əlavə, ilahi ədalət prinsipi fərd və cəmiyyətin ədalətpərvərlik ruhunda tərbiyələnməsi istiqamətində böyük rol oynayır. Məhz, onlara görə Allahın digər sifətləri arasından ədalət, dinin təməl əqidələrindən biri kimi qəbul olunmuşdur.

Allah-təalanın ədalət sifəti barəsində Qurani-Kərimin ayələrinə və məsumların hədislərinə nəzər yetirək: "Allah zərrə qədər də zülm etməz" ("Nisa", 40). "Biz, iman gətirən və yaxşı işlər görənləri yer üzündə fəsad törədənlərlə bərabər tutarıqmı? Yaxud təqvalıları günah əhli ilə eyni tutarıqmı?" ("Sad", 28).

"Biz peyğəmbərlərimizi aydın dəlillərlə göndərdik və onlarla birlikdə kitab və mizan nazil etdik ki, insanlar (bir-biri ilə) ədalətlə rəftar etsinlər…" ("Hədid", 25).

Peyğəmbərlər göndərildi ki, insanlar ədalətli olsunlar və bir-biri ilə ədalətlə rəftar etsinlər. "Hər şeyi ədalətlə ölçün və çəkini əsla əksiltməyin!" ("Ər-Rəhman", 9). "Həqiqətən də Allah ədalət və ehsanı yaxşılıq etməyə əmr edir. Beləlklə, Quran insanları ədalətli olmağa və bir-birinin haqqını qorumağa çağırır" ("Ər-Rəhman", 9).

Həzrəti-Əli (ə) buyurub: "Şəhadət verirəm ki, Allah adildir və ədalətlə rəftar edir. O, elə bir hakimdir ki, haqqı batildən ayırd edir".[1]

Həzrəti-Əli (ə) buyurur: "Həmin gündə Allahın ədalət tərəzisində insanların əməllərinə düzgün əvəz veriləcək. Hətta, bu əməl asimana bir baxış olsa belə".[2]

Bəndin sonrakı misralarında "Ğafir" surəsinin 31-ci ayəsini ("Və məllah yuridu zulmən lil ibad") şeirə gətirməklə şair bildirir ki, "Allah Öz bəndələrinə zülm etmək istəməz!" (Allah Öz qullarına onlar günah etmədən cəza verməz, günahı olanları da cəzasız buraxmaz!). Çünki, zülm eyləmək qüdrətsizliyin və acizliyin nişanəsidir. Allah-təala isə hər şeyə qadirdir. Əgər insan Allaha etiqad göstərsə və ədalətli olsa heç zaman əzab çəkməz.

Qoşmanın növbəti bəndində ustad aşıq dinin əsaslarından üçüncüsü olan Nübuvvətdən (peyğəmbərlikdən) söhbət açır:

*Üçüncü kəlmədə Nübuvvətdi həm,*
*Yüz iyirmi dörd min peyğəmbərdi cəm.*
*Əvvəli Adəmdir, axırı Xatəm,*
*Dəlili-əhvalın iqrar eyləyir [3, s.45].*

---

[1] "Nəhcül-bəlağə". Feyzül-islam. xütbə 205. səh. 675

[2] "Nəhcül-bəlağə". Feyzül-islam. xütbə 214. səh. 709

Bəndin ilk misrasında şair nübuvvət motivini şeirə gətirir və nübuvvətin nədən ibarət olduğunu vəsf edir: "Nübuvvət, islam dininin təməl əqidələrindəndir və hər bir müsəlman buna etiqad bəsləməlidir. Sadə məntiqdə insana düz yolu göstərən etibarlı bələdçinin olmasının zəruriliyini qəbul edir.

Əminliklə deyə bilərik ki, insanları azğınlıq və cəhalətdən nicat verib onları əbədi səadətə qovuşduran yola yönəldən bələdçilərin göndərilməsi Allahın bizə qarşı lütfkarlığı və bizə bəxş etdiyi ən böyük nemətlərdəndir. Çünki, əgər peyğəmbərlər göndərilməsəydi insanlar bütpərəstlik və xurafat, ədavət və müharibə, ayrıseçkilik və zülm, əsarət və işgəncələr bataqlığında qərq olar, heç vaxt doğru yolu tanımaz və tapmazdılar.

Peyğəmbərlər Allahın bəxş etdiyi nemətləri insanlara xatırladıb onların yatmış fitrətlərini oyatmaqla, camaatla söhbətlər aparıb ilahi əmrləri təbliğ etməklə onları Qadir və Rəhman Allahın ibadətinə yönəltmişlər".

Bəndin ikinci misrasında "Yüz iyirmi dörd min peyğəmbərdi cəm" – deyərkən şair bəşər övladına çatdırır ki, Allah-təala bəşərin Xaliqi (Yaradanı) olduğu üçün öz məxluqunun ehtiyaclarını hamıdan yaxşı bilir. Bilir ki, əgər kamilliyə və səadətə aparan yolu – "Şəriət"i bəşərə tanıtdırmasa bəşər düz yolu tapmaz. Bu səbəbdən də elə insanların öz aralarından ləyaqətli bəndələri seçərək Peyğəmbər – elçi və bələdçi göndərmişdir. Biz müsəlmanlar, Allah tərəfindən göndərilən bütün peyğəmbərlərin haqq olduğunu qəbul etmişik. Lakin, sonuncu din islam dinidir. Mütəal Allah buyurub: "innəd-dinə, indəllahil-isləm" – "Allah dərgahında din əlbəttə, isla"mdır" ("Ali-İmran", 19). Bu ayəyə istina-

dən, islam dini gəldikdən sonra artıq qeyri dinlər, şəriətlər Allah tərəfindən qəbul olunmur və bütün insanlar ümumbəşər din olan islama tapınmalıdırlar. İslam dini 14 əsr öncə sonuncu peyğəmbər Həzrəti-Məhəmməd (s) vasitəsilə nazil edildi. 40 yaşında peyğəmbər seçilən Həzrəti-Məhəmməd (s) 23 il ərzində bu dinin göstərişlərini insanlara çatdırdı.

Qurani-Kərimə istinadən peyğəmbərlər aşağıdakı məqsədlər üçün göndərilmişlər:

1. İnsanların maariflənməsi və tərbiyələnməsi (özünü saflaşdırması); "Ümmi" (yazıb-oxumaq bilməyən) ərəblərə özlərindən peyğəmbər göndərən Odur! Ondan ötrü ki, bu peyğəmbər onlara Allahın ayələrini oxusun, onları təmizləsin və onlara kitabı və hikməti təlim etsin. Bundan əvvəl onlar (ümmi ərəblər) cəhalət və azğınlıqda idilər" ("Cümə", 2).

Burada incə bir məqama toxunmaq istərdik. Məlumdur ki, insanın həm mənəvi təkamülü, həm də maddi tərəqqisi elmin, biliyin girovundadır. Amma, heç şübhəsiz, yuxarıdakı ayədə sözü gedən biliklər (…onlara kitabı və hikməti təlim etsinlər…) maddi tərəqqini təmin edən elm deyil. Çünki, belə elm yalnız dünya rifahını insana töhfə verə bilər. Halbuki, peyğəmbərlər insanlara dünya və axirət səadətini vəd etmişlər.

2. İnsanların Allaha ibadət etmələri və tüğyankarlara itaətdən boyun qaçırıb onlarla mübarizə aparmaları: "Biz hər bir ümmətə peyğəmbər göndərmişdik ki, (insanlara çatdırsınlar): Allaha ibadət edin və təğutdan (tüğyankarlardan) uzaq durun… " ("Nəhl", 36)

3. Ədalət və azadlığın təmin olunması: "Biz peyğəmbərləri aydın dəlillərlə göndərdik və onlarla birlikdə ki-

tab və mizan nazil etdik ki, insanlar ədalətlə rəftar etsinlər…”. (“Hədid”, 25).

Peyğəmbərlər göndərilib ki, insanları Allaha ibadətə yönəltsinlər. İlahi göstərişləri təlim və təbliğ etsinlər və nəticədə insan bu dünyada düzgün yaşayıb sonda əbədi axirət səadətinə nail olsun [14, s.40].

Mötəbər səhih hədislərə istinadən Allah təala insanları hidayət etmək üçün 124 min peyğəmbər göndərmişdir. Həzrəti-Peyğəmbər (s) buyurub: “Peyğəmbərlərin sayı 124 mindir, onların beşi ülul-əzim peyğəmbərlərdir: Nuh (ə), İbrahim (ə), Musa (ə), İsa (ə) və Məhəmməd (s)” (“Biharul-ənvar”. c. 11)

Biz bu motivlə həm şairin öz yaradıcılığında, həm də digər sənətkarların əsərlərində tez-tez ratlaşırıq:

*Yüz iyirmi dörd min nəbi,*
*Tən-Pənci-Ali-Əba;*
*Altı əfzəl, beş ülul-əzm,*
*Yazılmışdır kitaba [3, s.122].*

*(Novrəs İman)*

***

*Yüz iyirmi dörd min cəm ənbiyaya,*
*Vəliyyi –Xudaya, həm övsiyaya,*
*Xəməssəl nücəba – Ali-Əbaya,*
*Şərh olan bəyana bağışla məni [3, s.25].*

*(Novrəs İman)*

***

*Xatəm əl-nəbinin taci-sərinə,*
*Şəmsi vəzzühaya, il qəmərinə,*

*Müqərrəb mələyin zərrin pərinə,*
*Gəzəydi hər yana, bağışla məni!*

*Aşıq deyər, hər aya,*
*Nəbi oxur hər aya.*
*Canım xəstə çağırram,*
*Mərd ağasın haraya [3, s.23].*
*(Novrəs İman)*

***

*Yüz iyirmi dörd min peyğəmbər keçdi,*
*Dünyadan kim getdi dərdi vərəmsiz.*
*(M.P.Vaqif)*

***

*Ey xoş ol kəslər Məhəmməd Mustafanı sevdilər,*
*Oldular aşiq Əliyyəl Mürtəzanı sevdilər.*
*Sidqü ixlas ilə pənc təni ali-əbanı sevdilər,*
*Çardah məsumtək müşkülguşanı sevdilər,*
*Dəxi onlardan gözəl yaxşı cəmaət görmədim*
*(M.P.Vaqif)*

Üçüncü və dördüncü misralarda "Əvvəli Adəmdir axırı Xatəm, Dəlili əhvalın iqrar eyəyir" – deyərkən ustad aşıq bizlərə çatdırır ki, Allah-təala insanları düz yola – dünya və axirət səadətinə qovuşduran yönə yönəltməkdən ötrü peyğəmbərlər göndərmişdir. Birinci peyğəmbər Həzrəti Adəm (ə) və axırıncı peyğəmbər Həzrəti-Məhəmməddir (s).

"Həqiqətən biz səni haqqla göndərdik ki, müjdə verəsən və qorxudasan. Elə bir ümmət olmayıb ki, onun içində qorxudan bir bələdçi peyğəmbər olmasın" ("Fatir", 24).

Həzrəti-Əli (ə) buyurur: "Beləliklə, Allah öz peyğəmbərlərini seçdi və onları bir-birinin ardınca göndərdi ki, fitri əhdi-peymanı onlardan tələb etsin, unudulmuş nemətləri onların yadına salsın, təbliğ ilə onlarla söhbət aparsın və onların ağıl xəzinələrini işə salsın".[1]

Göründüyü kimi mütəal Allah insanları düz yola yönəltmək üçün bələdçilər göndərmişdir.

Növbəti bənddə şair sonuncu peyğəmbəri Quran ayəsi işığında vəsf edir:

*"Məkana Məhəmməd" xəlq olub əzəl,*
*"Əba Əhəd" vardı o nuri-gözəl.*
*"Və ləhu kan Rəsulullah"dır əzəl,*
*"Kulli-şəyin əlimə" huşyar eyləyir [3, s.45].*

Bu bənddə şair Qurani-Kərimin "Əhzab" surəsinin 40-cı ayəsinə işarə edir: "Ma kanə Muhəmmədun əba-Əhədin min ricalikum və ləkin Rəsulullah və xatəmən-nəbiyyin. Və kanəllahu bikulli şəyin əlimə" – "Mühəmməd (s) kişilərinizdən birinin atası deyildir, lakin Allahın Rəsuludur və peyğəmbərlərin sonuncusudur. Allah hər şeyi biləndir".

Bu ayə ilə bağlı ustad təfsirçi A.M.Şirazi belə yazır: "Bu ayə cahiliyyət dövrünə aid olan yanlış bir ənənəyə son qoymaq üçün Peyğəmbərin (s) Zeynəb bint Cəhş ilə evlənməsindən bəhs edən sonuncu ayədir. Öncə belə buyurulur: istər Zeyd olsun, istərsə də başqası, "Məhəmməd aranızdakı kişilərdən heç birinin atası olmayıb və deyildir". Bir zamanlar əgər Zeydə "Məhəmmədin oğlu" deyilirdisə,

---

[1] "Nəhcül-bəlağə". Feyzül-islam. xütbə 1. səh. 33

bu, təbii və qohumluq əlaqəsi deyil, İslamın və Quranın hökmü ilə ortadan qaldırılmış bir adət və ənənədən irəli gəlirdi. Əlbəttə, Peyğəmbərin (s) Qasim, Təyyub, Tahir və İbrahim adlı oğlanları olmuşdur. Ancaq tarixi mənbələrin yazdığına görə, onların hamısı yetkinlik yaşına çatmamış dünyalarını dəyişmişdilər. Sonra Allah peyğəmbərlə insanların əlaqələrinin peyğəmbərlik və xatəmiyyət prinsipinə əsaslandığını buyurur. Ayənin əvvəlində qohumluq əlaqəsi tamamilə inkar edilir, ardınca isə əlaqənin peyğəmbərlik və xatəmiyyət prinsipinə əsaslanan mənəvi əlaqə olduğu isbat edilir. Ayənin çatdırmaq istədiyi başqa bir həqiqət Peyğəmbərin (s) insanlara olan sevgisinin bir ata sevgisindən daha üstün olmasıdır. Onun ümmətə olan sevgisi bir peyğəmbərin öz ümmətinə olan sevgisidir. Xüsusilə o, özündən sonra heç bir peyğəmbər gəlməyəcəyini bilirdi. Buna görə də onlar üçün Qiyamətə qədər lazım olacaq proqrammı yüksək sevgi və şəfqətlə təqdim etməli idi. "Xatəm" sonluğa deyilir. Bu ayə peyğəmbərlik missiyasının İslam peyğəmbəri ilə başa çatdığını və ondan sonra heç bir peyğəmbər gəlməyəcəyini göstərir. Hədislərinin birində Peyğəmbər (s) belə buyurmuşdur: "Mənim digər peyğəmbərlərlə olan müqayisəmi bir misalla belə izah edə bilərəm: Bir kişi gözəl bir ev tikir. Camaat onun ətrafına toplaşıb "bundan gözəl bina yoxdur. Yalnız bir kərpici çatmır" – deyirlər. Bax, həmin boş yeri dolduran sonuncu kərpic mənəm".

Ustad aşıq növbəti bənddə də Peyğəmbərin (s) qiyamət günündə bizlərə şəfaət edəcəyini, Qurani-Kərimin ayələri işığında və hədislər güzgüsündə çatdırır:

*Ona təlim verib elmi-ilahi,*
*Göstəribdi bizə o doğru rahi,*
*Məşhərdə məxluqat çəkəndə ahı,*
*Şəfaət o şahi-əbrar eyləyir [3, s.45].*

"Şəfaət bir şəxsə arxa durmaq, sahib çıxmaq yardıma möhtac olan, qorunmağa layiq bir kimsə üçün əfv diləmək və onun yaxşılığına çalışmaqdır". Peyğəmbərin (s) Allahın izni ilə həm öz ümməti, həmdə bəşəriyyət üçün uzun-uzadı məhşər sorğu-sualından qurtarmaq məqsədi ilə edəcəyi şəfaətə Şəfaəti-Kubra yəni (böyük şəfaət deyilir). Abdullah ibn Ömər Rəsulullahdan (s) rəvayət edir ki, qiyamət günü insanlar dəstə-dəstə öz Peyğəmbərlərinin (ə) arxasınca o baş-bu başa aparılacaq və Ulul-Əzim Peyğəmbərlərə "Ya Rəsul şəfaət et!" deyə yalvaracaqlar. Bu şəfaət tələbi İslam Peyğəmbərində (s) başa çatır. Allahın Rəsulullahı (s) Məqami-Məhmuda (s) (həmd edilməli dərəcəyə) təyin edəcəyi gün baş verəcək və məhşərdəkilərin hamısı o gün bu şəfaətinə görə ona minnətdar olacaqlar.

"Məqami-Məhmud" Həzrəti-Məhəmməd Peyğəmbərin (s) və övliyaların toplanacağı sahədə İslam rəhbərinin dayanacağı yerdir.

Allah Həzrəti-Muhamməd (s) ümmətinin yarısının cənnətə girməsi ilə onlara şəfaət etmək arasında seçmək hüququ vermiş, daha ümumi və daha kafi bir xilas yolu olduğundan oda "Şəfaəti-kubra"dan sonra öz ümmətindən zərrə qədər imanı olanların əfvi, cəhənnəmə layiq görülmüş bəzi şəxslərin oda atılmamaları, bəzilərini əzablarının yüngülləşdirilməsi və ya dərhal çıxarılması, bəzi şəxslərin hesaba çəkilmədən cənnətə daxil edilməsi üçün Ulu Yaradandan son iltimasını dilə gətirəcəkdir. Ən nəhayət, Rəsulallah (s) öz

səhabələrinin bir çoxunun dərəcələrinin yüksəldilməsi və Əhli-beyti (ə) sevənlərin bağışlanması üçün dua edəcəkdir. Şəfaətə inanmayanlarla, müşriklərin şəfaətdən kənarda qalacağını Peyğəmbər (s) xəbər vermişdir: "Qiyamət günü mənim şəfaətim büs-bütün həqiqətdir və şəfaət bir səlahiyyətdir.

Kim buna inanmazsa, şəfaət əhlindən olmayacaqdır. Hər Peyğəmbərin (ə) qəbul olunması vəd edilmiş bir duası vardır və hər Peyğəmbər (ə) duasını etməkdə tələsmişdir. Ancaq mən ümmətimə şəfaət üçün duamı qiyamət gününə saxladım, ümmətimdən Allaha şərik qərar vermədən vəfat etmiş hər bir şəxs, İnşallah bu şəfaətə layiq olacaqdır" [12, s.282–283].

Biz şəfaət motivi ilə həm şairin özünün, həm də Ş.İ.Xətai, M.Füzuli və Aşıq Ələsgər yaradıcılığında da rastlaşırıq:

*Gözüm açdım mən yetişdim bəlaya,*
*Aşiq oldum elm-əmri-Xudaya,*
*Novrəs İman üz tutanda üqbaya,*
*Şəfaətin üçün ümid var, ağa! [3, s.19].*

***

*Bu Xətai xəstəyə qılgil şəfaət ruzi-həşr,*
*Çünki əslindən səninlən aşinadır, ya Nəbi! [15, s.233].*
*(Ş.İ.Xətai)*

*(Ey Peyğəmbər (s) qiyamət günündə bu xəstə Xətaiyə şəfaət et. Çünki, onun əsil-nəsəbi son nəticədə gedib sənə çatır, odur ki, sən də onu özünə dost-doğma bil).*

Mövlanə Məhəmməd Füzuli Rəsulullahla (s) bağlı şəfaət barədə belə bir beyt yazmışdır:

*Ol qədər zövqü-şəfaət cövhəri-zatındadır,*
*Kim, gəlir ərzi-xəta mənidə bir ehsan sənə.*

*(Sənin zatının mayasında şəfaət zövqü elə çoxdur ki, suçun dilə gətirilməsi, günahın bildirilməsi sənə yaxşılıq etmək mənasına gəlir) [12, s.283].*

Qoşmanın sonrakı bəndində şair imamət mövzusunu şeirə gətirməklə Həzrəti-Əlinin (ə) və onun pak övladlarının imamlıq məqamını "Vilayət" ayəsi və mənzilət hədisinə istinadən tərənnüm edir:

*İmamət Əlini haqq bilib, inan,*
*On bir övladıynan ol Şahi-Mərdan.*
*"Vəliyyikumullah" ayeyi-Quran,*
*Nisbəti-Əhmədi-Muxtar eyləyir [3, s.45].*

Şair birinci misrada "İmamət Əlinin haqq bilib, inan" – deyərkən imamət məqamının seşilmiş şəxslərə Allah-təala tərəfindən verildiyini çatdırır. "Bəqərə" surəsinin 124-cü ayəsində buyurulur: "(Ya Rəsulum!) Yadına sal ki, İbrahimi öz Rəbbi bir neçə sözlə (bəzi əmrləri iə) imtahana çəkdiyi zaman o, (Allahın əmrlərini" tamamilə yerinə yetirdi. (Belə olduqda Allah ona:) "Səni insanlara imam (dini rəhbər, başçı) təyin edəcəyəm", -dedi. (İbrahim isə:) "Nəslimdən necə?" – deyə soruşdu. (Allah onun cavabında:) "(Sənin nəslindən olan) zalimlər mənim əhdimə (imamlığıma) nail olmazar" – deyə buyurdu".

Bu ayənin izahı barəsində görkəmli təfsir alimlərindən olan A.N.M.Şirazi öz təfsirində yazır: "Rəbbi İbrahimi müxtəlif vasitələrlə sınağa çəkdiyi zaman" ibarəsinə təfsirçilər belə izah verirlər ki, burada İbrahimin (ə) sınağa çəkildiyi çətinliklər nəzərdə tutulur. Misal üçün, həyat yoldaşını və körpə uşağını quraq Məkkə çölündə qoyması, Babil bütpərəstlərinə qarşı çıxması, onların bütlərini sındırması, oda atılması, istəkli oğlu İsmaili qurban kəsməsi əmri və s. Quran "Səffat" surəsinin 106-cı ayəsində Həzrəti-İbrahimin (ə) ən bariz sınaqlarındn birini – Həzrəti-İsmaili (ə) qurban kəsmək əmrini nəql etmişdir. Təfsirçilərə görə, bu fərman Həzrəti-İbrahimin (ə) ömrünün sonlarında baş vermişdir və o, Allah tərəfindən "imam" olmadan öncə peyğəmbər olmuşdur. Bu imamət məqamının nübuvvət məqamından yüksək olmasına sübutdur. İmam Sadiqdən nəql olunan bir hədisdə oxuyuruq: "Allah İbrahimi peyğəmbər seçməzdən qabaq Öz bəndəsi etdi. Onu rəsul etməzdən qabaq peyğəmbər seçdi. Dostu seçməzdən qabaq rəsulu etdi. Onu imam seçməzdən qabaq Öz dostu etdi. Bütün bu məqamlar onda toplayandan sonra isə ona: "Səni imam təyin edirəm" – buyurdu. Bu məqam İbrahimə (ə) o qədər böyük göründü ki, dedi: "İlahi, mənim nəslimdən də imamlar təyin et!" İmam o kəsdir ki, insanlar onun ardınca gedirlər. Onu özlərinə rəhbər seçirlər. Onun sözünə, əməlinə tabe olurlar. Peyğəmbərin missiyası ilahi göstərişləri çatdırmaq, insanlara səadət yolunu göstərməkdir. İmamın işi isə ilahi göstərişləri icra etməkdir. Yəni, imam öz ilahi gücü ilə yolu göstərir, hidayət olunmasına, kamilliyə yetməsinə zəmin olanlara bələdçilik edir və mənzil başına çatdırır. Bu ayə imamın məsum (qüsursuz) olmasının dəlillərindən biridir. Çünki, Allah əhdinin (imamətin) zalımlara çatmayacağını

bildirir. Zülmün ədalətsizliyin hər növü kim tərəfindən olmasından asılı olmayaraq, yüksək imamlıq məqamından məhrum olmağa səbəb olur" [2, s.19].

**İmamın sifətləri:**

İmam (ə) Həzrəti-Peyğəmbərin (s) canişini olub, müsəlmanların rəhbəridir. Ümmətin dini və dünya işlərinin idarəçiliyi onun öhdəsindədir. Buna görə də o, bir sıra xüsusi cəhətlərə sahib olmalıdır, o cümlədən:

1) **Məsum olmalıdır;** İnsanları düz yola yönəldə bilməsi üçün imam (ə) məsum – yəni günahsız və səhvsiz olmalıdır. Çünki, özü günah əhli olan bir şəxs insanları günahdan çəkindirib çəkindirib düz yola yönəldə bilməz.

2) **Qeyb elminə sahib olmalıdır;** Şəriəti təhrifsiz şəkildə insanlara bəyan edə bilməsi üçün imamın (ə) sonsuz ilahi elmə bağlantısı olmalıdır. Çünki, əgər o da başqaları kimi adi bəşəri bilikləri, yaxud güman və ehtimal əsasında danışarsa, onun sözləri insanlar tərəfindən əminliklə qəbul edilməz.

3) **İmam (ə) Allah tərəfindən təyin olunmalıdır:** İmam (ə) Allahın əmrilə Peyğəmbər (s) tərəfindən, yaxud özündən əvvəlki İmam (ə) tərəfindən təyin olunmalıdır. Çünki Allahdan başqa kimsə kimsənin məsumluğundan xəbərdar ola bilməz. (Peyğəmbər (s) də Allahın istəyi və izni ilə bunu edir). Allah hamının keçmişini, bu gününü və gələcəyini, eləcə də batinini və zahirini bilir. Odur ki, müsəlmanların rəhbərliyinə kimin layiq olduğunu yalnız Allah bilir. Qurani-Məciddə də buyurulur: "Allah risalətini harada qərar verdiyini (kimə həvalə etdiyini) yaxşı bilir" ("Ənam", 125).

Mövlana Cəlaləddin Rumi demiş:

*Əgər varsa əqliniz, təyin edin düz yolu,*
*Ondan sonra sidq ilə gediniz dümdüz yolu.*

"On bir övladıynan ol Şahi-Mərdan" – misrasında şair Cəfəri məzhəbinin təməl əqidələrindən dördüncüsü olan "İmamət" məqamına kimlərin layiq olduğunu çatdırır. Həzrəti-Peyğəmbər (s) dünyadan köçdükdən sonra onun vəzifələrini icra etmək, yəni müsəlman cəmiyyətini dini, iqtisadi, siyasi işlərinin idarəçiliyi üçün mütəal Allah 12 nəfər ləyaqətli insanı Peyğəmbərin (s) canişini təyin etmişdir. Həzrəti-peyğəmbər (s) onların adlarını açıqlamışdır. Bir-birinin ardınca bu vəzifələri öhdələrinə götürən məsum imamlar (ə) Peyğəmbərin (s) nəslindəndir və elm, səbr, fəzilət, ədalət, ismət, gözəl əxlaq və bir sözlə, bütün cəhətlərdən peyğəmbərə (s) bənzəyirdilər. Onların peyğəmbərlə tək bir fərqi peyğəmbər olmamalarıdır.

İmam ilə peyğəmbər arasındakı fərq aşağıdakılardı:

1. Peyğəmbər şəriət gətirir, imam isə yeni şəriət gətirmir.

2. Peyğəmbər Şəriət qanunlarını vəhy yolu ilə alır, başqa sözlə desək, onun aləmlərin Rəbbi olan Allahla birbaşa əlaqəsi vardır, imama isə Şəriət qanunları vəhy olunmur, o, bunları peyğəmbərdən təlim alır.

İmamət rəhbərlik deməkdir, yəni Allahın əmri ilə Həzrəti-Peyğəmbərin (s) özünə təyin etdiyi canişinlərin islam ümmətinə rəhbərliyi. İmamların sayı 12-dir: Birinci imam Həzrəti-Əli (ə) və axırıncı imam – Həzrəti Mehdidir (əc.f). "Ey iman gətirənlər! Allaha itaət edin! Peyğəmbərə və özünüzdən olan əmr sahiblərinə itaət edin!" ("Nisa", 59).

"Ey peyğəmbər! Rəbbin tərəfindən sənə nazil olanı (Həzrəti-Əlinin (ə) canişinlik imamlıq məsələsini camaata)

çatdır. Əgər (bunu) etməsən, Onun (Allahın) risalətini (sənə həvalə etdiyi peyğəmbərlik, elçilik vəzifəsini) yerinə yetirmiş olmazsan. Allah səni insanlardan qoruyacaq" ("Maidə", 67).

"Allah siz Əhli-beytdən (ə) hər çirkinliyi uzaq etmək və sizi tər-təmiz, pak etmək istəmişdir" ("Əhzab", 33).

Peyğəmbər (s) buyurub: "Əl-xüləfəi min-bədi isnaəşərə kulluhum min-Qurəyş" – "Məndən sonra xəlifələr on iki nəfərdir və hamısı da Qureyşdəndir".

Həzrəti-Peyğəmbər (s) buyurmuşdur: "Din rəhbərləri məndən sonra 12 nəfərdir: Ey Əli, onlardan birincisi Sənsən, sonuncusu isə Qaimdir…".[1]

Həzrəti-Əli (ə) buyurmuşdur: "Peyğəmbərinizin (s) Əhli-beytinə baxın, onlar getdiyi tərəfə gedin və addımınızı onların addımının yerinə qoyun".[2]

Belə bədii parçaların tərənnümünə aşığın yaradıcılığında tez-tez rast gəlirik:

*On iki imam çaharidəh*
*Məsumin gəlir hesaba;*
*Onları əşrəf yaradıb,*
*Bir hökmran başabaş [3, s.122].*

*On səkkiz min aləm ki, var,*
*Alimlərin dilidir,*
*Ustadlığı izhar edən,*
*Şahi-Mərdan Əlidir.*
*Yetmiş iki millət ki, var,*

[1] "Cavahirül-hikəm". səh. 9
[2] "Nəhcül-bəlağə". xütbə 96. səh. 286

*Haqq-islamın yoludur;*
*Mənada bir "Əlif", "Ğayn"*
*Olub Quran başabaş [3, s.122].*

***

*İsna-əşərə-çakəri-kəmtər ola Vaqif,*
*Sərdaridi əla,*
*Xaki-dəri-övladi-peyğəmbər ola Vaqif,*
*Neylər dəxi dünya?*
*Ol gündəki, həngameyi məhşər ola Vaqif,*
*Tut daməni Mövla!*
*Fəryadrəsin Heydəri – Səfdər ola Vaqif,*
*Xovf eyləmə əsla!*
*Sən qərqsən hərçənd ki, dəryayi vəbalə,*
*Tövhiqi bulansan!*

*(M.P.Vaqif)*

***

*"Ey dil, yapış ol Əhmədi-Muxtar ətəyindən*
*Ta ki, nəfəsin var,*
*Səflər dağıdan Heydəri-Kərrar ətəyindən*
*Qəmdən bizi qurtar.*
*Tut silsileyi-seyyidi-əbrar ətəyindən*
*Onlardı dəhü çar*[1]
*Həftad dü tən yavəri-qəmxar*[2] *ətəyindən*
*Xoşxülq, xoş ətvar.*
*Hər xeyir tökülsə, tökülür var ətəyindən,*

---

[1] Dəhü çar–14 Məsum, yəni Peyğəmbər (s), qızı Faimeyi-Zəhra (s.ə) və 12 İmam (ə).
[2] Həftad dü tən yavərü-qəmxar – 72 yavər, Kərbəla şəhidləri.

*Bil vazehü aşkar.*
*Yox daneyi-ərzən qədəri şeri-qəzəldən,*
*Zakir, sənə çarə.*
*Tut Ali-Əlinin genə naçar ətəyindən*
*Fəryad elə yalvar."*

(Q.B.Zakir)

Novrəs İmanın sələfi olan İslam dininə, 14 Məsuma, Kərbəla şəhidlərinə sonsuz məhəbbət göstərən və gözəl mərsiyyələr müəllifi kimi tanınan şairlərimizdən olan Qasım bəy Zakir bu şeirində vurğulayır ki, insanların bu dünyada və axirətdə səadətə, xoşbəxtliyə çatması üçün yeganə düzgün yol 14 məsumun ətəyindən tutmaları və 72 nəfər Kərbəla şəhidlərindən ibrət almalarındadır.

Üçüncü misrada söhbət "Vilayət" ayəsindən gedir. "Vilayət" ayəsi "Maidə" surəsinin 55-ci ayəsidir. Ayədə Allah-təala buyurub: "İnnəmə vəliyukumullahu və Rəsuluhu vəlləzinə əmənu əlləzinə yuqimunəs-səlatə və yutunəz-zəkatə vəhum rakiun" – "Sizin rəhbəriniz yalnız Allah, onun Rəsulu və iman gətirib namaz qılaraq rüku halında zəkat verən şəxslərdir" ("Maidə", 55).

Ayənin şəni-nüzulu belədir:

İmam Əbu-İshaq Sələbi "Əl-Kəbir" adlı təfsirində Əbuzər Qəffaridən belə nəql edir: "Mən bu iki qulağımla eşitdim – yalan desəm, hər ikisi də kar olsun – və bu iki gözümlə gördüm – yalan desəm, hər ikisi də kor olsun ki, Həzrəti-Peyğəmbər (s) belə buyurdu: "Əli möminlərin rəhbəri, kafirləri öldürəndir. Ona kömək edən (Allahdan) kömək görər, onu yalqız buraxan (Allah tərəfindən) yalqız buraxılar." Bilin ki, mən Həzrəti-Peyğəmbərlə (s) birlikdə namaz qıldığım bir gün bir sail məsciddə xalqdan yardım

dilədi. Amma heç kim ona bir şey vermədi. Həzrəti-Əli (ə) isə ruku halında idi, üzük olan orta barmağını sailə tərəf uzatdı. Həmin sail gəlib Əlinin (ə) barmağındakı üzüyü çıxartdı. Bu vaxt Həzrəti-Peyğəmbər (s) Allaha yalvararaq belə dua etdi: "Ey Allahım! Qardaşım Musa sənə dua edərək dedi: "Ey Rəbbim, mənim köksümü aç, işimi asanlaşdır, dilimdəki düyünü aç ki, sözümü başa düşsünlər və mənim öz əhlimdən olan qardaşım Harunu mənə köməkçi et, onunla qüvvətləndir və onu mənim işimə şərik et ki, sənə çoxlu təsbih və zikr edək. Heç şübhəsiz, sən bizim (halımızı) ən yaxşı görənsən." Sən isə ona: "Ey Musa, dua qəbul edildi və istəyin verildi" – deyə vəhy etdin. Ey Allahım, mən də sənin bəndən və Peyğəmbərinəm; Sən mənim də köksümü aç, işimi asanlaşdır və mənim öz əhlimdən olan Əlini (ə) mənə vəzir (xəlifə, köməkçi) təyin et, onunla məni qüvvətləndir".

Əbuzər (ə) sözünə belə davam edir: "Allaha and olsun ki, hələ Peyğəmbər (s) sözünü qurtarmamışdı ki, Cəbrail(ə) nazil olub bu ayəni gətirdi: "Sizin vəliniz, rəhbəriniz ancaq Allah, onun elçisi və namaz qılarkən ruku halında zəkat verən möminlərdir".

Hər kim Allah, onun elçisi və möminlərlə dostluq etsə, bilsin ki, Allahın firqəsi qələbə çalacaqdır" ("Maidə", 56).

Sünnülərin "Sihah" və "Müsnəd" kitablarında nəql etdikləri rəvayətlərdə aydın şəkildə qeyd olunur ki, bu ayə Əlinin (ə) öz üzüyünü ruku halında sailə (fəqirə) verdiyi zaman nazil olmuşdur. Peyğəmbərin (s) zamanında yaşayan və gözəl təbə malik olan şair Həssan İbni-Sabit bu hadisəni belə nəzmə çəkir. Şeirin sətri tərcüməsi belədir:

"Sən o kəssən ki, ruku halında bəxşiş etdin, canlar sənə fəda olsun, ey ruku edənlərin ən yaxşısı! Allah ən yaxşı

vilayəti sənin barəndə nazil etdi və onu şəriətin xələl yetməyən hökmlərində bəyan etdi”.

Bu ayənin şəni-nüzulu ilə əlaqədar olan sənədlər həddindən artıq çoxdur.[1]

Biz bu motivlə digər sənətkarlarımızın yaradıcılığında da rastlaşırıq:

*Üzük bəxş eyləmişsə sailə ol şəh namaz üstə,*
*Əlində əhli-həqqin hər nə varsa, nəzri-saildir.*

*(M.Füzuli)*

*Yeri, döy Əli qapısın, odur ey gədayi-miskin,*
*Kərəmiylə padşahlıq üzüyü verən gədayə.*

*(S.M.Şəhriyar)*

*Sailə etdin əta şövqilə əngüştərini,*
*Heyranam taətinə, etdiyin ehsanə, Əli.*

*(Namiq Kamal Dərbəndi)*

*Verdin əngüştərini sailə əsnayi-namaz,*
*Kimsə əshabidə bir böylə səxa olmaz idi.*

*(Hacı Yaşar Cahid)*

“Dədə Qorqud” dastanında Qurani-Kərimin xüsusi fəzilətlərə malik “Ən-nəbə” və “Ya-sin” surələri zikr olunur. Dastanda Əhli-beyt (ə), xüsusən, Həzrəti-Əlinin (ə) vilayəti

[1] “Təfsiri-Təbəri”. cild 6. səh. 186; “Təfsiri-Beyzavi”. cild 1. səh. 345; “ddürrul-Mənsur”. cild 2. səh. 293 və s.

barədə buyurulur: "Qılınc çaldı, din açdı mərdlər şahı Əli – əhsən" [12, s.273–275].

Novrəs İman bəndin sonuncu misrasında "Nisbəti-Əhmədi-Muxtar eyləyir" – deyərkən "Mənzilət" hədisinə işarə edib. "Mənzilət" hədisində peyğəmbərimiz (s) buyurub: "Ya Əli, sənin mənə olan nisbətin Harunun Musaya olan nisbəti kimidir. Bir şərtlə ki, məndən sonra peyğəmbər gəlməyəcək. Sən imam və imamlar atasısan". "Mənzilət" hədisinə bir çox sənətkarlarımız müraciət etmişdir. Müasir dövrümüzdə yaşayan və yazıb yaradan şairlərimiz də Həzrət Əlinin (ə) vilayətinə biganə qalmamış və öz yaradıcılıqlarında bu mövzuya xüsusi diqqət yetirmişlər. O şairlərdən biri də qəzəlxan şair Xəqani Əminidir. Şairin "Əli vilayətidir" qəzəlinə nəzər yetirək:

*Cahanda nuri-hidayət Əli vilayətidir,*
*Şəfii-ruzi-qiyamət Əli vilayətidir.*

*Əlini sevməyəni istəməz Xudanın özü,*
*Həqiqi eşqə dəlalət Əli vilayətidir.*

*Nübuvvətin işi naqis qalır imamətsiz,*
*Ki, xətmi-əmri-risalət Əli vilayətidir.*

*Əli itaətidir xəlqə məğfirət qapısı,*
*Verən behişti zəmanət Əli vilayətidir.*

*Əlidən özgəni, Xəqani, tutmaram mövla,*
*Unutma, doğru vilayət, Əli vilayətidir [11, s.245].*

Növbəti bənddə şair müqəddəs islam dininin əqidə əsaslarından beşincisi və sonuncusu olan – məaddan söhbət açır.

*“Mim”, “yey” ölərsən, həm dirilərsən,*
*Ayin adil qiyaməti görərsən.*
*Dal qurar divanın onda bilərsən,*
*Haqq divan bir ğəni Səttar eyləyir [3, s.45].*

**Məad** – Axirət aləminə inanmaqdır. Bizim inancımıza görə insan öldükdən sonra onun ruhu “Bərzəx” adlı bir aləmə köçür. Qiyamət qopanadək orada qalır və qiyamət qopduğu gün ruh yenidən bədənə qovuşur. Hamı Məşhərə cəm edilir və əməllərin haqq-hesabı aparılır. Beləcə, insanın əbədi məkanı – Cənnət və ya Cəhənnəm müəyyənləşir.

Demək olar ki, qədimdən bəri insanlar axirət aləminə inanıblar və bu inancın nişanələri neçə min il tarixi olan qövmlərin, xalqların qoyub getdiyi izlərdə görmək olar. Dünyada geniş yayılan dinlər arasında məada və axirət aləminə inam əsas inanclardandır. Ümumiyyətlə, məada inam bəsləməyin hər hansı bir dini-ilahi və səmavi din adlandırmaq olmaz.

Qeyd edək ki, məada inamın qədimdən bəri dünyanın ayrı-ayrı məntəqələrində də yaşayan xalqlar arasında yayılması bu əqidənin fitri olduğunu göstərir (Allahın varlığına inam kimi). Məada inamın fitri olduğu da belə izah edilir. İnsan qəlbinin dərinliklərində inanır ki, ölüm həyatın sonu deyil və həyat başqa bir aləmdə davam edir. O, çətinliklərlə dolu olan fani dünya həyatı üçün yaradılmayıb və bu qaranlıq gecənin işıqlı bir səhəri var. Ölüm

əbədi olan Axirət aləminə köçməkdir. Necə ki, Nizami Gəncəvi deyib:

*Hərçənd ki, dünyada ölüm gerçəkdir,*
*Ölüm, ölmək deyil, yer dəyişməkdir.*

Bəli, əgər insan öz fitrətinin səsinə – yəni, qəlbinin dərinliyindən gələn səsə qulaq verərsə, bu həqiqəti dərk edər.

Əql və məntiq də məada inanmağı zəruri edir, başqa sözlə desək, məadın zəruriliyi bir sıra əqli dəlillərlə də isbat edilir. O cümlədən: Kainatı xəlq edən həkim-hikmət sahibi və qadir Allah bəndələrinin maddi və mənəvi yüksəlişi, təkamülü üçün peyğəmbərlər vasitəsilə bir sıra qayda qanunlar göndərmiş və insanlara həmin qayda-qanunlara əməl etməyi əmr etmişdir. Bəzi insanlar ilahi göstərişlərə tabe olmuş və onlara əməl etmişlər. Bəziləri isə Allahın qanunlarına tabe olmamış, günah işlətmiş və hətta, qətl və qarət kimi ağır günahlardan belə çəkinməmişlər. Amma, müşahidə etdiyimiz kimi, bu iki dəstə insanlardan heç biri, istər Allaha itaət edənlər, istərsə də Allaha asi olanlar öz əməllərinin əvəzlərini bu dünyada layiqincə almırlar. Heç şübhəsiz, onların bu dünyada əməllərinin əvəzinin layiqincə almaları qeyri-mümkündür. Məsələn, əgər bir nəfər bir neçə nəfəri qətlə yetirmişdirsə, ona ölüm cəzası verilsə belə, bu, onun törətdiyi cinayətin tam cəzası deyildir. Çünki, onun bir canı var idi və onu itirir. Halbuki, o, neçə-neçə insanın həyatına son qoymuşdur. Odur ki, Allahın ədaləti və hikməti tələb edir ki, bir gün insanları bir yerə cəm edib onların əməllərinin əvəzini layiqincə versin. Beləliklə, məadın zəruriliyi sübuta yetir.

**Məad** – qiyamət günü ölülərin diriləræk Allah məhkəməsinə toplanacaqlarına və dünyada yerinə yetirdikləri əməllərin əvəzini alacaqlarına etiqad bəsləməkdir: “Yoxsa elə güman edirsiniz ki biz sizi əbəs yerə xəlq etmişik və öldükdən sonra) bizə doğru qaytarılmayacaqsınız?!” (“Muminin”, 5).

“Hər kəs ölümü dadacaqdır. Yoxlamaq məqsədilə biz sizi xeyir və şərlə sınayırıq və siz bizə doğru qaytarılacaqsınız” (“Ənbiya”, 35).

Həzrəti-Peyğəmbər (s) buyurub: “Qəbirləri ziyarət edin, çünki, qəbirlər axirəti sizin yadınıza salır”.[1]

Həzrəti-Əli (ə) buyurub: “Ölüm və onun çətinliklərinə doğru tələsin, ölümü qarşılamağa hazırlaşın və o yetişməmişdən öncə hazır olun ki, işin sonu “Qiyamət” dir”.[2]

“Kəyfə təkfurunə billahi və kuntum əmvatən fə əhyakum summə yumitukum, summə yuhyiykum, summə iləyhi turcəun” – “Allahı necə inkar edirsiniz, ölü idiniz, o, sizi diriltdi. Sizi yenə öldürəcək, sonra sizi dirildəcək, sonra da onun hüzuruna qaytarılacaqsınız” (“Bəqərə”, 28) [14, s.68].

Biz bu motivlə Dədə Ələsgər ocağının digər bir üzvü şair Əbdüləzimin yaradıcılığında da rastlaşırıq:

*Üsuliddin beş kəlmə, əvvəli Tovhid,*
*Dəlilində bir Allahı göstərir.*
*İkinci, ədldi, yəni ədalət,*
*Ədl adil padişahı göstərir.*

[1] “Cavahirül-hikəm”. səh. 70
[2] “Nəhcül-bəlağə”. xütbə 232. səh. 763

*Üçüncü, nübuvvət, haqdı peyğəmbər,*
*Adəmdən Xatəmə verilir xəbər.*
*Yazılıb ayələr, olub mötəbər,*
*Quran bizə doğru rahı göstərir.*

*Dördüncü, bərhaqdı on iki imam,*
*Zahirdi, yəqindi, bilirəm tamam.*
*Aqibət dərdimə eyləyən əncam,*
*Məhəmməddi, din pənahı göstərir.*

*Beşinci, məaddı, ölmək-dirilmək,*
*Bizlərə vacibdi bunları bilmək,*
*Əməlin əlində məşhərə gəlmək,*
*Həm savabı, həm günahı göstərir [8, s.93].*

Qoşmanın davamında:

*"İnna-nəhnu nəhyəl mövt" kəlamı,*
*Mənada müxtəsər öləcək hamı.*
*Tapmasam axırda dərdə əncamı,*
*İstəsə Heydəri-Kərrar eyləyir [3, s.45].*

– deyərkən, şair "Ya-Sin" surəsinin 12-ci ayəsinə istinad edir: "İnna nəhnu nuhyil məvtə və nəktubu ma qəddəmu və əsərəhum və kullə şəyin əhsəynəhu fi Imamim-mubin" – "Həqiqətən biz ölüləri dirildərik. Etdiklərini və qoyub getdiklərini də yazırıq. Hər şeyi açıq-aydın kitabda (Lövhi-məhvuzda) qeydə almışıq".

Bu ayənin şəni nüzulunda qeyd olunur ki, səhabələrdən bəzisi Peyğəmbərin (s) yanına gəlib "İmami-mubin"dən

məqsəd nə olduğunu süal etdilər. Peyğəmbər (s) buyurdu: "İmami-mubin"dən məqsəd nə Tövrat, nə İncil. nə Zəbur, nə də Quran deyil, məqsəd Həzrəti-Əlidir (ə). Şair də qeyd edir ki, Qiyamət günündə günahkarlara ancaq Həzrəti-Əli (ə) kömək edə bilər.

Belə bədii parçalara həm aşığın öz yaradıcılığında, həm də digər şair və aşıqların əsərlərində rast gəlirik:

*Əlinin məqamın anlasa hər kim,*
*Ol kəs də kəsilər nəfsinə hakim.*
*Əlidir Quranda "Ta-ha"vu "Ya-sin",*
*Həm "Ya-Sin"də olan "İmamin-mubin".*

*(Novrəs İman)*

***

*Mətlubum istərəm Şahi-Heydərdən,*
*Sahibi-Zülfüqar şahi Qənbərdən,*
*Biçarə Vaqifi salma nəzərdən,*
*Qul xətasız olmaz, ağa kərəmsiz!*

*(M.P.Vaqif)*

Novrəs İman qoşmanın möhürbəndini bu misralarla tamamlayır:

*Aldanıbsan əgər cifəyə hərdəm,*
*Çəkilər hesabı o gündə möhkəm.*
*Dilində vaynövsə, könlün alar qəm,*
*Novrəs İman sizə izhar eyləyir [3, s.45].*

Ustad aşığın şərh etdiyimiz "Eyləyir" rədifli qoşmasının əvvəlki bəndlərindən aydın olur ki, Novrəs İman islam dinin əsası olan "Üsuliddin"in maddələrini mükəmməl bilmiş və onun hər bir maddəsini çox gözəl şəkildə nəzmə çəkmişdir. Eyni zamanda, Qurani-Kərimin ("Əhzab", 40; "Maidə", 55; "Nisa", 64; "Ya-Sin", 12; "Bəqərə", 28 və s.) ayələri, həmçinin, Peyğəmbərimiz Həzrəti-Məhəmmədin (ə) müxtəlif zamanlarda Həzrəti-Əlinin (ə) vilayəti (rəhbərliyi) barədə buyurduğu hədisləri ustad aşıq sərraslıqla qələmə almış və gələcək nəsillərə İslam dininin əsl mahiyyətini çatdırmışdır.

**Ədəbiyyat:**


1. Qurani-Kərim. (Ərəb dilindən tərcümə edənlər: Z.M.Bünyadov, V.N.Məmmədəliyev). Bakı, 2005
2. Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017
3. Novrəs İman. "Seçilmiş əsərləri". (toplayıb tərtib edəni: İslam Ələsgər). Bakı, "Səda", 2004
4. Möhsün Qiraəti. "Nur təfsiri". XI-XII cild. (tərcümə: Hacı Arzu). Bakı, "Nurlar", 2015
5. Şah İsmail Səfəvi (Xətai) külliyyatı. Qəzəllər, qəsidələr, nəsihətnamə, dəhnamə, qoşmalar. (Tərtibatçısı: Mirzə Rəsul İsmailzadə). Bakı, Əlhuda, 2004
6. Aşıq Ələsgər. Əsərləri, dastan-rəvayətlər, xatirələr. Bakı, "Şərq-Qərb", 1999
7. Məhəmməd Füzuli. "Seçilmiş əsərləri". Bakı, "Yazıçı", 1984
8. "Ələsgər ocağı". Şeirlər. (toplayanı və tərtib edəni: İslam Ələsgər). Bakı, "Yazıçı", 1991

9. Hacı Ələmdar Mahir. “Füzuli qəzəllərinin şərhi”. 3 clilddə. I cild, Bakı, “Elm və təhsil”, 2012
10. Famil Şirvanov, Təbriz Qasımov. “İslamda olanlar olduğu kimi”. Bakı, “Zərdabi LTD”, 2018
11. H.Hüseyni. ““Bismilləh” ayəsinin incə görüntüləri və “bə” hərfinin altında olan nöqtənin sirri”. Bakı, “MBM”, 2014
12. Hacı Həsən Hüseyni. “Əhli-beyt (ə) aşiqi Dədə Ələsgər”. Bakı, “İmza”, 2022
13. Hacı Həsən Hüseyni. “İmam Rza (ə) müxtəlif baxışlarda”. Bakı, “Ecoprint”, 2019
14. Əhmməd Əmiripur. “Hər müsəlman bilməlidir”. Bakı, “Zər-dabi LTD MMC” NPM, 2011
15. Şah İsmayıl Xətai. “Keçmə namərd körpüsündən”. Bakı, “Yazıçı”, 1988

*Dinin yarpaqları “Firuiddin”dir,*
*Oruc tut, namaz qıl, ibadət eylə.*
*Beşdən bir “xüms” ver, ondan bir “zəkat”,*
*Zəlilə, müztərə inayət eylə.*

*Şərə fitva verib, saxlama dildə,*
*Qəlbdə möhkəm ol, bu doğru yolda.*
*Məişətdən artıq var olsa əldə,*
*Həcc qıl, nəfsinə əmanət eylə.*

*Təvəlla – Əlinin dostunu tanı,*
*Təbərra – seçgilən küfrü düşmanı.*
*Qəsb olan yerlərdən dolan pünhanı,*
*Təmiz tut libasın, xoş adət eylə.*

*Haqqa tərəfdar ol, nahaqdan kənar,*
*Şər işə qarışan axır olar xar.*
*Haqq səni yaradıb faili-muxtar,*
*Nə kin saxla, nə də xəyanət eylə.*

*Novrəs İman, sözün eylə müxtəsər,*
*Hər işin haqq bilir, olma mükəddər.*
*Dəşti-Kərbəlayə eylə bir səfər,*
*Öp qədəmgahını, ziyarət eylə!*

# NOVRƏS İMAN YARADICILIĞINDA ŞƏRİƏT HÖKMLƏRİNİN TƏRƏNNÜMÜ

*Bismillahir-Rəhmanir-Rəhim!*
*Ya Allah ya Rəsul ya Əli səndən mədəd!*

Əvvəlki məqaləmizdə ustad aşıq-şair Novrəs İmanın yaradıcılığında dinimizin əqidəvi bölümünü təşkil edən "Üsuliddin" barədə oxuculara ətraflı məlumat vermişik. Bu məqalədə isə şəriət qanunlarının əməl bölümü hesab edilən "Firuiddin" barədə şairin "Eylə" rədifli qoşmasının şərhini oxuculara çatdırmaq istərdik. Bildiyimiz kimi İslam dininin maarifinin ikinci bölümünü əməllər təşkil edir. Bu barədə də Novrəs İman öz qələmini sınamış və "Eylə" rədifli qoşmasında "Firuiddin"in maddələrini açıqlamışdır:

*Dinin yarpaqları "Firuiddin"dir,*
*Oruc tut, namaz qıl, ibadət eylə.*
*Beşdən bir "xüms" ver, ondan bir "zəkat",*
*Zəlilə, müztərə inayət eylə [3, s.42].*

Şeirin birinci bəndində ustad aşıq "Firuiddin"in dörd maddəsindən söhbət açır. Məlum olduğu kimi, hər bir müsəlman gündəlik on yeddi rükət namazın qılmalı, ildə bir ay Ramazan ayında orucunu tutmalı, ildə bir dəfə qazancının beşdə birini xüms, qazancının ondan birini də zəkat verməli, eyni zamanda imkansız insanlara da kömək etməlidir.

Namazın, orucun, xümsün və zəkatın dinimizdəki əhəmiyyəti barədə Qurani-Kərimdə, Peyğəmbərimizin (ə) və

Əhli-beyt (ə) imamlarının hədislərində kifayət qədər dolğun məlumatlar vardır.

İmam Sadiq (ə) buyurub: “Namazı yüngül tutanlara, namaza əhəmiyyət verməyənlərə bizim şəfaətimiz aid olmaz”.[1]

Namaz islam dinin mühüm ibadətlərindən biridir və müsəlmanlar hər gün beş vaxtda bu ibadəti yerinə yetirməlidirlər: “Namaz qıl, həqiqətən, namaz çirkin və pis əməllərdən çəkindirər. Allahı zikr etmək, şübhəsiz, böyükdür, Allah etdiklərinizi bilir!” (“Ənkəbut”, 45).

“Namaz qılın, zəkat verin və ruku edənlərlə birlikdə ruku edin!” (“Bəqərə”, 43)

İmam Bagir (ə) buyurub: “Bəndə hər şeydən əvvəl namaz barədə sorğu-suala çəkiləcək. Əgər namaz qəbul olunarsa, digər (yaxşı) əməlləri də qəbul olunacaq”.

Namaz tək islam dininə xas olan ibadət deyil. Quran-Kərimin ayələrinə istinadən, namaz, islamdan əvvəlki peyğəmbərlərin (ə) gətirdikləri dinlərdə də mövcud olmuşdur. (Əlbəttə, keçmiş dinlərdə olan namazla islam dinindəki namaz arasında müəyyən fərqlər vardır). Bu barədə bir neçə Quran ayəsinə nəzər salaq:

1. Şüeyb peyğəmbərin (ə) dinində namaz: “Onlar dedilər, ey Şüeyb! Namazınmı sənə əmr edir ki, atamızın tapındıqlarını tərk edək…” (“Hud”, 87).

2. İbrahim peyğəmbərin (ə) dinində namaz: “Ey Rəbbimiz! Mən sülaləmdən bəzisini əkin bitməz bir vadidə, sənin beytül-həramının yaxınlığında namaz qılmaları üçün sakin etdim. Ey Rəbbimiz! Sən elə et ki, insanlardan bir qisminin qəlbi onlara meyl etsin” (“İbrahim”, 37).

---

[1] “Vəsailüş-şiə”. c. 3. səh. 17

3. İsmail peyğəmərin (ə) dinində namaz: "O, öz əhlinə (ümmətinə) namaz qılmağı, zəkat verməyi əmr edirdi. O, Rəbbinin razılığını qazanmışdı" ("Məryəm", 55).

4. İsa peyğəmbərin dinində namaz: "Və mənə tapşırdı ki, nə qədər həyatdayamsa, namaz qılım və zəkat verim" ("Məryəm", 31).

5. İshaq peyğəmbərin (ə) və Yaqub peyğəmbərin (ə) dinində namaz: "Biz onlara xeyirli işlər görməyi, namaz qılmağı və zəkat verməyi vəhy etdik. Onlar yalnız bizə ibadət edirdilər" ("Ənbiya", 73).

Yuxarıda qeyd olunan ayələrdən məlum olur ki, namaz – bu keçmiş dinlərdə də vacib buyurulmuşdur.

**Oruc** – Sübh azanından, məğrib azanına qədər orucu batil edən işlərdən (məsələn, yemək, içmək və s.) çəkinməkdir.

"Ey iman gətirənlər! Oruc tutmaq sizə vacib edildi, necə ki, sizdən əvvəlki ümmətlərə vacib edilmişdi. Bəlkə, təqvalı olasınız (pis əməllərdən çəkinəsiniz)" ("Bəqərə", 183).

Ramazan ayı o aydır ki, insanları hidayət edən (insanlara doğru yolu göstərən), hidayəti açıq-aşkar dəlillərlə aydınlaşdıran və haqqı batildən ayıran Quran nazil olmuşdur. Bəs kim Ramazan ayına yetişərsə oruc tutmalıdır. Kim xəstədirsə və ya səfərdədirsə, tutmadığı günlərin sayı qədər başqa günlərdə oruc tutmalıdır" ("Bəqərə", 185).

Həzrəti-Peyğəmbər (s) buyurub: "Hər şeyin zəkatı vardır, (pak və sağlam qalması üçün) bədənin zəkatı isə orucdur".[1]

---

[1] "Biharul-Ənvar". c. 96. səh. 246

“Oruc tutun! Həqiqətən, oruc od (cəhənnəm odu) qarşısında qalxandır”.[1]

“Allah öz mələklərini oruc tutanlara dua etməyə vəzifələndirib”.[2]

**Xüms** – Allahın əmrinə itaət niyyətilə şəxsi əmlakın “beşdə biri”ni xüsusi şərtlər əsasında seyyidlərə (Haşim övladlarına) və məsum imama (ə) verməkdir:

“Bilin ki, qənimət götürdüklərinizin beşdə biri Allahın, peyğəmbərin, onun qohum-əqrəbasının, yetimlərin, miskinlərin və (pulu qurtarıb) yolda qalanlarındır. Əgər Allaha və bəndəmizə nazil etdiyimizə iman gətirmisinizsə…” (“Ənfal”, 41).

Həzrəti-Əli (ə) buyurub: “Allah xümsü öz yerində qərar verib və sədəqəni, zəkatı da öz yerində vacib edib”.[3]

İslam dini büdcələr müəyyən etmişdir. Xüms də həmin büdcələrdən biridir. Rəvayətlərin birində oxuyuruq ki, bir tacir İmam Rzadan (ə) onu xüms verməkdən azad etməsini xahiş edir. İmam Rza (ə) ona buyurur: “Xüms verməlisiniz ki, biz onun vasitəsilə dini yayaq və möhkəmləndirək, düşmənlərin müqabilində heysiyyətimizi qoruyaq, imkansızlara yardım edək...

Xüms verməyə imkanınız olduğu təqdirdə özünüzü bizim dualardan məhrum etməyin. Xüms vermək sizin ruzinizin açarıdır.

Müsəlman o kəsdir ki, Allahla bağladığı əhd-peymana vəfalı olsun. Dildə Allahı qəbul edən, qəlbdə isə ona qarşı çıxan şəxs müsəlman deyildir...”.[1]

---

[1] “Biharul-Ənvar”. c. 96. səh. 246
[2] “Biharul-Ənvar”. c. 96. səh. 258
[3] “Nəhcül-bəlağə”. “Qısa kəlamlar”. səh. 1217

Xüms iki paya ayrılır:

1. Seyyid payı,
2. İmam payı.

Seyyid payı yoxsul, yetim və yardıma ehtiyacı olan seyyidlərin ehtiyaclarını aradan qaldırmaq üçün xərclənir. Qeyd edək ki, seyyidlərə zəkat vermək haramdır və zəkat seyid olmayan imkansız müsəlmanların ehtiyaclarını ödəmək üçün xərclənir. İmam payı isə dini rəhbərlərə verilir və onlar bu büdcəni cəmiyyətdə dini göstərişlərin icrası və cəmiyyətdə ümumi mənafeyi üçün xərcləyirlər [12, s.118].

**Zəkat** – Allahın əmrinə itaət niyyətilə müsəlmanın öz malından müəyyən bir hissəsini ayıraraq yoxsulların ehtiyaclarının təmin edilməsinə və xeyriyyəçiliyə sərf etməsidir.

“Sədəqələr (zəkatlar) Allah tərəfindən müəyyən edilmiş bir fərz (vacib əməl) olaraq ancaq yoxsullara, miskinlərə zəkat yığıb paylayanlara, qəlbləri (müsəlmanlığa isinişənlərə), kölələrin azadlığına, (borcu ödəməyə imkanı olmayan) borclulara, Allah yolunda (cihada və ya xeyriyyəçiliyə), (pulu qurtarıb) yolda qalanlara məxsusdur. Allah biləndir və hikmət sahibidir (“Tövbə”, 60).

“İman gətirən, xeyirli işlər görən, namaz qılan, zəkat verən şəxslərin Rəbbi yanında mükafatları vardır. Onların (Axirətdə) heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər!” (“Bəqərə”, 277).

Həzrəti-Əli (ə) buyurub: “İnsanlar zəkat vermədikdə yer öz bərəkətini onlardan əsirgəyir”.[2]

[1] “Vəsailüş-şiə”. c. 6. səh. 375

[2] “Vəsailüş-şiə”. c. 6. səh. 13

Həzrəti-Əli (ə) buyurub: “Həqiqətən zəkat namazla birlikdə islam əhlinin Allaha yaxınlaşma vəsiləsi qərar verilmişdir. Elə isə kim zəkatı rəmbətlə və könül xoşluğu ilə verirsə, bu, onun günahlarının kəffarəsi və od (Cəhənnəm odu) qarşısında bir maneə, qoruyan olacaqdır”.[1]

9 şeyə zəkat düşür: **Buğda, arpa, xurma, kişmiş, qoyun, inək, dəvə, qızıl, gümüş.**

İslam şəriətində bunların hər biri üçün “nisab həddi” – yəni müəyyən bir miqdar və say təyin edilmişdir və yalnız “nisab həddi”nə çatdıqda onlara zəkat düşür [10, s.204–207].

Biz bu motivlə həm aşığın özünün, həm də digər sənətkarlarımızın yaradıcılığında tez-tez rastlaşırıq:

*Rəsulullah merac etdi,*
*Gətirdi oruc-namazı.*
*Mömin olar tutub qılan,*
*Xoşdur dildə avazı;*
*İki mələk müvəkkildir,*
*Savab – üsyandan yazı,*
*Günahkarı yandıracaq,*
*Nari-niran başa-baş [3, s.123].*

*(Novrəs İman)*

***

*Namaz qılan səcdəgaha,*
*Sübhana baş endirir;*
*Kəlmə kəsir həqiqətdən,*
*Ərkana baş endirir.*

[1] “Nəhcül-bəlağə”. “Qısa kəlamlar”. səh. 644

*Niyyət tutur, qiyam edir,*
*Təkbir ilən həmd oxur,*
*Qulhu deyir, salam edir,*
*Mərdana baş endirir [3, s.124].*
*(Novrəs İman)*

***

*Əl çəkmə dünyada sövmü səlatdan,*
*Təmiz ver, qalmasın xümsü-zəkatdan.*
*Ələsgər, xofv etmə puli-siratdan,*
*İrəhbərdi cənab Əli qabaqda [5, s.101].*
*(Aşıq Ələsgər)*

***

*Əgər zərrə qalsa xümsün, zəkatın,*
*Hərgiz qəbul olmaz sövmü səlatın,*
*Haqq yanında möhr olunmaz baratın,*
*Salarlar boynuna oddan tənabı [5, s.49].*
*(Aşıq Ələsgər)*

***

*Sirat, sual qabaqdadı, nə damaqdı dünyada*
*Kəlmeyi-şəhadət lazımdı, ölən vaxtı dünyada.*
*Tut orucun, qıl namazın, şükür eylə Allaha,*
*Gül olma dünya malına, qalacaqdı dünyada [5, s.194].*
*(Aşıq Ələsgər)*

***

*Əvvəl sövmi-səlat vacibdi bizə,*
*Bərhaqdı xaliqim görünməz gözə.*

*Orucsuz, namazsız, təharət sizə,*
*Məşhər günü narullahı göstərir [8, s.93].*
*(Şair Əbdüləzim)*

İkinci bənddə şair əməllərdən beşincisi olan "Həcc"dən söhbət açır və bildirir ki, insan gərək ömründə bir dəfə Allah evi Kəbəni ziyarət edə:

*Şərə fitva verib, saxlama dildə,*
*Qəlbdə möhkəm ol, bu doğru yolda.*
*Məişətdən artıq var olsa əldə,*
*Həcc qıl, nəfsinə əmanət eylə [3, s.42].*

**Həcc** – Allahın əmrini yerinə yetirmək niyyəti ilə müqəddəs Məkkə şəhərindəki "Kəbə Evi"ni ziyarət etməkdir.

"Onun (Həcc) yoluna ərzaq, minik, sağlamlıq və s. baxımdan gücü çatan hər bir kəsin Həccə gedib o evi ziyarət etməsi insanların Allah qarşısındakı borcudur. Kim bunu inkar edərsə, həqiqətən, Allah aləmlərə möhtac deyil" ("Ali-İmran", 97).

"Camaatı Həccə çağır ki, onlar sənin yanına piyada və uzaq yollardan hər cür miniklə gəlsinlər. Ondan ötrü ki, öz mənfəətlərinin (istər maddi, istərsə də mənəvi mənfəətlərinin) şahidi olsunlar və məlum günlərdə Allahın onlara ruzi verdiyi dörd ayaqlı heyvanların başı üstündə (yəni, onları qurban edərkən) Allahın adını çəkisnlər, onun ətindən özünüz də yeyin, biçarə, zavallı yoxsula da yedizdirin!" ("Həcc", 27–28)

İmam Əli (ə) buyurub: "Rəbbinizin evi xüsusunda Allahdan qorxun! Nə qədər ki, həyatdasınız Allah evini boş

qoymayın. Əgər onu tərk etsəniz (ilahi əzabdan) sizə möhlət verilməyəcək”.[1]

İmam Sadiq (ə) buyurub: “Kəbə durduqca, (Həcc ziyarəti yerinə yetirildikcə), din (İslam dini) yaşayacaqdır”.[2]

Həcc İslam dinin ən mühüm ibadətlərindən biridir və hər il böyük izdiham və əzəmətlə Məkkə şəhərində yerinə yetirilir. Həcc ictimai, iqtisadi, mədəni və tərbiyəvi əhəmiyyətli bir ibadətdir. Belə ki, Həcc mövsümündə dünyanın hər bir yanından müxtəlif siniflərə mənsub insanlar Məkkə şəhərində toplaşaraq eyni libasda, eyni əməlləri yerinə yetirirlər. Onlar hər növ maddi həzzdən uzaqlaşıb, günahlardan çəkinərək Allaha üz tutur, ondan hacət diləyirlər. Bu isə onların həm mənəvi, həm də maddi yüksəlişində böyük təsirə malikdir.

İslam şəriəti baxımından həddi-buluğa çatan, ağıllı olan və **“müstəti”** bir şəxs ömründə bir dəfə Həcc ziyarətinə getməlidir [6, s.137].

**“Müstəti”** – Həcc səfərinin xərcini ödəyə bilən, bu səfərə çıxmaq üçün kifayət qədər vaxtı olan və sağlamlığı da buna yol verən, həmçinin yolu təhlükəsiz olan, ailəsinin dolanışıq xərclərini ödəyə bilən və səfərdən qayıtdıqdan sonra dolanışıq üçün çətinliyə düşməyən kəsə deyilir.

İmam Məhəmməd Baqir (ə) bir hədisində belə buyurur: “İslam dini beş təməl üzrə qurulub: “Namaz, oruc, zəkat, həcc və vilayət. Vilayət bu dörd şərtin açarıdır, əgər bir kəsin vilayətə (on iki imama) etiqadı olmasa Allah onun heç bir əməlini qəbul etməz”.

---

[1] “Nəhcül-bəlağə”. “Feyzül İslam”. səh. 978
[2] “Vəsailüş-şiə”. c. 8. səh. 14

Biz bu motivlə həm aşığın öz yaradıcığılığında, həm də digər sənətkarlarımızın əsərərində tez-tez rastlaşırıq:

Qoşmanın növbəti bəndində şair deyir:

*Təvəlla – Əlinin dostunu tanı,*
*Təbərra – seçgilən küfrü düşmanı.*
*Qəsb olan yerlərdən dolan pünhanı,*
*Təmiz tut libasın, xoş adət eylə [3, s.42].*

Bu bənddə Həzrəti-Əlinin (ə)dostunu şair Allahın dostu, düşmənini isə Allahın düşməni hesab edir. Şair bu bənddə Qurani-Kərimin "Bəqərə" surəsinin 257-ci ayəsinə və peyğəmbərin (s) "Qədir-Xum" xütbəsinə istinad edir: "Allah mömünlərin dostudur". Həzrət-Əli (ə) də mömünlərin ağasıdır. Peyğəmbər (s) buyurub: "Əli həqq ilədir və həqq də Əli ilədir. Əlinin dostu Allahın dostu, Əlinin düşməni isə Allahın düşmənidir".

**"Təvəlla"** – Allah dostlarını, peyğəmbərlərin və imamların dostlarını dost tutmaq və sevməkdir.

Təvəlla çox əhəmiyyətli məsələdir və Qurani-kərimdə bunun üzərində təkid olunmuşdur.

"Sizin hamınız, dostunuz yalnız və yalnız Allah, onun peyğəmbəri və iman gətirənlərdir: O kəslər ki, namaz qılır və ruku halında zəkat verirlər" ("Maidə", 55).

"Hər kəs Allahı, onun peyğəmbərini və iman gətirənləri özünə dost tutsa, heç şübhəsiz, qələbə çalanlar Allahın firqəsidir" ("Maidə", 56).

"Mömin kişilərlə mömin qadınlar bir– birinə dost, əyandırlar" ("Tövbə", 71).

Həzrəti-Əli (ə) buyurub: "Allahı uca tut və onun dostlarına özünə dost tut".[1]

İmam Sadiq (ə) buyurub: "Kim Allaha xatir sevərsə və Allaha xatir ədavət bəsləyərsə imanı kamildir".[2]

Təvəllanın əsasında Rəhman və Rəhim olan Allahı sevmək dayanır. (Sizcə Allahı sevməyən kəs Allahı sevənləri sevə bilərmi?). Ümumiyyətlə, ən ülvi sevgi Allaha olan sevgidir. Çünki, bizi yaradan və yaşadan bizə maddi və mənəvi nemətlər bəxş edən məhz, Allahdır.

Peyğəmbərlərə və imamlara olan sevgi də Allaha olan sevgiyə bağlanır. Çünki, peyğəmbərlər və imamlar Allah tərəfindən göndərilmiş bəşərin hidayəti və əbədi səadətə qovuşması üçün böyük fədakarlıqlar göstərmişlər. Elə bu səbəbdən də biz onları sevir, onlara itaət edir, canla və malla onların xidmətində dayanırıq.

Möminləri və əməli salehləri sevmək, onlara yaxın olmaq istəyi də Allaha olan sevgidən qaynaqlanır.

Məlum məsələdir ki, Allahı sevəni Allah da sevər. Qurani-Kərimdə Allah dostlarının, Allahın sevdiyi bəndələrin nişanələri açıqlanmışdır. Aşağıda bu nişanələrdən bəzilərini nəzərinizə çatdırırıq:

1. Yaxşı əməl sahibləri – "İnnəllahə-yuhibbul muhsinin – Həqiqətən, Allah yaxşı əməl sahiblərini sevər" ("Maidə", 13).

2. Tövbə edənlər və pak insanlar – "İnnəllahə– yuhibbul təvvabinə və yuhibbul mutatahhirin – həqiqətən, Allah tövbə edənləri, pak və təmiz olanları sevər. ("Bəqərə", 222).

---

[1] "Nəhcül-bəlağə". məktub 69. səh. 1070

[2] Əllamə Kuleyni. "Üsuli-kafi". c. 3. səh. 189

3. Müttəqilər – “Fəinnəlahə yuhibbul müttəqin –Şübhəsiz ki, Allah müttəqiləri sevər” (“Ali-İmran”, 76).

4. Səbrlilər – “Allahi yuhibbul sabirin – Həqiqətən, Allah səbrliləri sevər” (“Ali-İmran”, 146).

5. Təvəkkül edənlər – “İnnəllahə yuhibbul mütəvəkkilin – Həqiqətən Allah təvəkkül edənləri sevər” (“Ali-İmran”, 159).

6. Ədalətlilər – “İnnəllahə yuhibbul muksitin – Həqiqətən, Allah ədalətliləri sevər”

7. Cihad edənlər – “İnnəllahə yuhibbul ləzinə yuqatilunə fissəbilihi saffən kəənnəhum buniyənun mərsus – Həqiqətən Allah onun yolunda möhkəm divar kimi səf çəkib döyüşənləri sevər” (“Səff”, 4).

Allaha, Peyğəmbərə (s), məsum İmamlara (ə) qeyd-şərtsiz itaət etmək onlara olan sevginin təzahürüdür. Əks təqdirdə insan etdiyi iddiada sadiq deyildir. “Ey iman gətirənlər! Allaha, peyğəmbərə, özünüzdən olan əmr sahiblərinə itaət edin!” (“Nisa”, 59). “De: “Əgər siz Allahı sevirsinizsə, mənə tabe olun ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın. Allah bağışlayan və mərhəmətlidir” (“Ali-İmran”, 31).

“Peyğəmbərə itaət edən şəxs şübhəsiz ki, Allaha itaət etmişdir” (“Nisa”, 80).

“Allah iman gətirib yaxşı əməllər edən bəndələrinə bununla müjdə verir. (Ey Peyğəmbər!) De ki: “Mən sizdən bunun (risalətin-yəni Allah əmrlərini sizə çatdırmağın) müqabilində qohumlara (Əhli-beytə) məhəbbətdən başqa bir şey istəmirəm. Kim bir yaxşı iş görsə onun yaxşılığının savabını mükafatını artırarıq!” Həqiqətən, Allah bağışlayandır və qədir biləndir!” (“Şura”, 23).

Hədislərdə də bu məsələyə toxunulmuşdur. Hədislərin birində İmam Baqir (ə) Cabir Cufiyə buyurur: "Ey Cabir! Mənim salamımı şiələrimə çatdır, onlara de ki, bizim Allahla qohumluğumuz yoxdur. Allaha yalnız və yalnız ona itaət etməklə yaxın olmaq olar. Kim Allaha itaət edərsə və bizi sevərsə, o kəs bizim dostumuz olacaq".[1]

**"Təbərra"** – Allahın, peyğəmbərin və imamların düşmənlərini düşmən bilib onlardan uzaq durmaqdır.

"Möminlər möminləri buraxıb kafirləri dost tutmasınlar! Onlardan (kafirlərdən) sizə bir qorxu olmayınca bunu edən kəs Allahdan heç bir şey gözləməsin.(O, Allahla əlaqəsini kəsmişdir). Allah sizi öz əzabından çəkindirir. Axır dönüş Allaha tərəfdir" ("Ali-İmran", 28).

"Ey iman gətirənlər! Mənim düşmənimi və özünüzün düşməninizi dost tutmayın!" ("Mumtəhinə", 1).

İmam Rza (ə) buyurub: "Kim Allahın düşmənlərini dost tutursa, Allahın dostlarına düşmən kəsilmişdir".[2] Başqa bir hədisdə İmam Sadiq (ə) buyurub: "Allaha xatir sevmək, Allaha xatir bəxş etmək və Allaha xatir əsirgəmək imanın ən möhkəm bağıdır".[3]

Qeyd olunduğu kimi "Təbərra" Allahın, peyğəmbərlərin (s), imamların (ə) düşmənlərini düşmən bilib, onlardan uzaq olmaqdır. Başqa sözlə desək, kafirləri, münafiqləri və pis əməl sahiblərini düşmən bilib onlardan uzaq gəzmək, onların düşüncə və rəftarlarına nifrət bəsləməkdir.

İslam dinində "Təvəlla" və "Təbərra" eynilə namaz, oruc, həcc və cihad qədər əhəmiyyətlidir. Və dinin ən mü-

---

[1] "Səfinətul-bihar". c. I. səh. 142
[2] "Vəsailüş-şiə". c. 11. səh. 441
[3] "Vəsailüş-şiə". c. 11. səh. 434

hüm göstərişlərindən hesab olunur. Deyə bilərik ki, bütün tarixi hadisələrin, qarşıdurmaların, mübarizə və müharibələrin, candan keçmələr və fədakarlıqların kökündə dostluq və düşmənçilik dayanır.

İslam dini də "Təvəlla" və "Təbərra"ya dostluq və düşmənçiliyə olduqca böyük əhəmiyyət verir. Belə ki, bu iki prinsip dindarlığın, fəzilətin, imanın və səadətin meyarı hesab olunur.

Unutmayın ki, hər bir dostluq və düşmənçilikdə məqsəd Allahın razılığını qazanmaq olmalıdır. Həzrəti-Peyğəmbər (s) buyurub: "Möminin mömini Allaha xatir sevməsi və dost tutması imanın ən böyük dərəcələrindəndir. Kim Allaha xatir sevib, Allaha xatir ədavət bəsləyərsə, Allaha xatir bəxş edib, Allaha xatir əsirgəyərsə, Allahın seçilmiş bəndələrindəndir".[1]

İmam Sadiq (ə) buyurur: "Kafiri dost tutan kəs Allaha düşmən kəsilmişdir. Kafirə düşmən kəsilən şəxssə Allahı dost tutmuşdur. Allah düşməninin dostu Allahın düşmənidir.[2]

İmam Rza (ə) buyurub: "Günah əhlini dost tutan kəs özü günahkardır. Allaha itaət edəni dost tutan kəssə özü Allaha itaətkardır. Zülm edənə köməklik edən kəsin özü zülmkardır. Allahın sevgisini yalnız ona itaət etməklə qazanmaq olar".[3]

Hədislərin məzmunundan bu qənaətə gəlirik ki, Allah düşmənlərini dost tutan şəxs onların əməllərinə şərikdir və onların cinayətlərini, azğınlıqlarını bir növ dəstəkləyir. Bu

---

[1] "Vəsailüş-şiə". c. 11. səh. 441
[2] "Vəsailüş-şiə". c. 11. səh. 442
[3] "Vəsailüş-şiə". c. 11. səh. 446

isə Allaha qarşı çıxmaq hesab olunur və belə şəxsi ağır cəza gözləyir.

Bu motivə digər sənətkarların əsərlərində də tez-tez rast gəlirik.

*Ələsgərəm, ismim deyim aşikar,*
*Qədir bilən dosta başü can nisar!*
*Təvəlla, Təbərra şəriətdə var,*
*İstəyən şad olsun, düşmən kor olsun! [5, s.297].*
*(Aşıq Ələsgər)*

***

*Təbərra qılmayınca yox təvəlla,*
*Təbərrasız təvəllalar xətadır.*
*Təbərra qıl, ey Miskin Nəsimi,*
*Təbərra qılmayanlar bir bəladır [7, s.256].*
*(S.İ.Nəsimi)*

Şair qoşmanın dördüncü bəndində "Firuiddin"in daha iki maddəsindən – "əmr bil məruf və nəhy ənil-munkər"dən söhbət açır:

*Haqqa tərəfdar ol, nahaqdan kənar,*
*Şər işə qarışan axır olar xar.*
*Haqq səni yaradıb faili-muxtar,*
*Nə kin saxla, nə də xəyanət eylə [3, s.42].*

3. "Əmr bil-məruf və Nəhy ənil-munkər" – ərəb sözü olub "Yaxşı işlərə əmr etmək və Pis işlərdən çəkindirmək" – deməkdir.

“(Ey müsəlmanlar!) Siz insanlar üçün zahirə çıxarılmış ən yaxşı ümmətsiniz. (İnsanlara) yaxşı işlər görməyə əmr edir, pis əməlləri qadağan edir və Allaha inanırsınız” (“Ali-İmran”, 110).

“(Ey müsəlmanlar!) içərinizdə (insanları) yaxşılığa çağıran, yaxşı işlər görməyi əmr edən və pis əməlləri qadağan edən bir camaat olsun!

Bunlar (bu camaat), həqiqətən, nicat tapmış şəxslərdir” (“Ali-İmran”, 104).

“Mömin kişilərlə mömin qadınlar bir-birinə dost, hayandırlar. Onlar yaxşı işlər görməyə əmr edir, pis işləri qadağan edir… (“Tövbə”, 71).

Həzrəti-Peyğəmbər (s) buyurub: “Əmr bil-məruf və Nəhy ənil-Munkəri yerinə yetirin, əks təqdirdə Allahın qəzəbi hamınızı yaxalayacaq”.

Həzrəti-Əli (ə) buyurur: “Əmr bil-məruf və Nəhy ənil-munkəri tərk etməyin, yoxsa pis insanlar sizə hakim olar. Belə olduğu təqdirdə nə qədər dua etsəniz də qəbul olunmaz”.[1]

Həzrəti-Əli (ə) buyurur: “Əmr bil-məruf edib, özü ona əməl etməyənə və Nəhy ənil-Munkər edib özü ona əməl edənə Allah lənət etmişdir”.[2]

“Əmr bil-məruf və Nəhy ənil-munkər” islam dinin mühüm göstərişlərindəndir. Qeyd etmək lazımdır ki, əgər bu göstərişə əməl olunarsa, müsəlman cəmiyyətində digər dini göstərişlərə lazımınca əməl olunar. İslam dini baxımından hər bir müsəlman özü dini vəzifələrinə əməl etməklə yanaşı, dini göstərişlərin icrası xüsusunda cəmiyyətə nəza-

[1] “Nəhcül-bəlağə”. məktub 47. səh. 978
[2] “Nəhcül-bəlağə”. xütbə 129. səh. 401

rət etməlidir. Başqa sözlə desək, dini qanunların yaşaması üçün çalışmalıdır.

Sözsüz ki, hər bir müsəlman ilk öncə özü yaxşı əməlləri yerinə yetirməli, sonra başqalarını yaxşı əməlləri yerinə yetirməyə çağırmalıdır. Həmçinin özü pis əməllərdən və günahlardan çəkinməli, sonra başqalarını belə əməllərdən çəkindirməlidir. Hər bir müsəlman zülm və fəsadla mübarizə aparmalı, pis və günah işlərin qarşısını almalıdır. Birisinin günah işlətdiyini gördükdə, düzgün iş tutmadığını ona söyləməli, mümkün qədər onu günah işlərdən çəkindirməlidir.

Həzrəti-Peyğəmbər (s) buyurub: "Mənim ümmətim Əmr bil-məruf və Nəhy ənil-munkər edənədək bir-birinə köməklik göstərib əl tutanadək onların vəziyyəti yaxşı olar. Amma, elə ki, bu iki ilahi vəzifəni tərk etdilər, bərəkət onların üzərindən çəkilər və onların bəziləri (zalımları) digərlərinə hakim kəsilər. Bu vaxt yerdə və göydə onların dadına çatan olmaz".[1]

"Əmr bil-məruf və Nəhy ənil-munkər" dinin qorunmasında böyük rol oynayır. Belə ki, əgər bu iki vacib əməl tərk edilərsə və ya onlara qarşı səhlənkarlıq göstərilərsə, ilahi qanunlar dini və mənəvi dəyərlər tədricən həyat səhnəsindən kənarlaşar, nəticədə insanlar azğınlaşar və ilahi əzaba giriftar olarlar [10, s.385].

Deməli, islam dininin yaşaması bu iki vacib əməlin yerinə yetirilməsinə bilavasitə bağlıdır.

İmam-Əli (ə) buyurur: "Bütün yaxşı işlər və Allah yolunda cihad Əmr bil-məruf və Nəhy ənil-munkərin müqabi-

[1] "Vəsailüş-şiə". c. 11. səh. 398

lində böyük bir dənizə ağız suyu atmağa bənzəyir” [4, s.1263].

Məlum məsələdir ki, əgər ilahi qanunlar bəyan edilməsə, “yaxşı” və “pis” insanlara tanıtdırılmasa, yaxşı işlər təbliğ olunmasa və pis işlərin qarşısı alınmasa bu vaxt pis əməllərin qəbahəti tədricən aradan gedəcək, günah və azğınlıq adiləşəcəkdir. Nəticədə, fəsad hər tərəfi bürüyəcək və cəmiyyət korlanacaqdır, ictimai asayiş aradan gedəcək və həyat cəhənnəmə dönəcəkdir. Kamillik, mənəviyyat, dünya və axirət səadəti anlamsız məvhumlara çevriləcəkdir. [10, s.386].

Bu səbəbdən də cəmiyyətdə günah və fəsadın qarşısının alınması, insanların mənəvi saflığı və kamilliyi üçün “Əmr bil-məruf və Nəhy ənil-munkər” göstərişinə layiqincə əməl olunmalıdır.

Məhz, elə bu səbəbdən seyyidüş-şühəda (şəhidlər sərvəri), cəddinin dininin xilası üçün qiyam edir. Məlum olduğu kimi İmam Hüseynin (ə) qiyamının 3 mühüm səbəbi vardır:

**1. Yezidə beyət** – İmam Hüseyn (ə) bu batil fikir barədə buyurdu:

**“Zillət və zülmü qəbul etmək bizdən uzaqdır”.**

**2. Kufə camaatının dəvəti** – Onlar 150-yə qədər məktub yazıb İmam Hüseyni (ə) Kufəyə dəvət etdilər (amma sözlərinin üstündə durmadılar).

**3. “Əmr be məruf və nəhy – əz-münkər”** – Bir çox alimlər bu amilin üzərində dayanırlar.

İmam Hüseyn (ə) buyurub: “Mən özümə xatir və fəsad üçün qiyam etməmişəm. Qiyamda məqsədim cəddim Peyğəmbərin (s) ümmətini və atam Həzrəti-Əlinin (ə)

şiələrini islah etməkdir. Mən bu qiyamla **“əmr be mərufa və nəhy-əz-münkərə dəvət edirəm”.**

İmam Hüseyn (ə) bir məntəqəyə çatıb yerin adını soruşdu, dedilər Kərbəladır. O Həzrət (ə) Kərbəla adını eşidəndə buyurdu: “İlahi, bu bəlalı və qəmli-qüssəli yerdən Sənə pənah aparıram”. Sonra sözünə davam etdi: “Atlardan düşün, bura bizim mənzilimizdir və xeyməmlərimizin yeridir. Bizim qanımız bu torpağa töküləcək” [11, s.201].

Zənnimizcə ustad aşıq qoşmanın “Haqq səni yaradıb faili-muxtar, Nə kin saxla, nə də xəyanət eylə” misralarında şanlı kitabımızda olan ayələrə istinad edir: “İnsanın elə bir dövrü olub keçmişdir ki, o, xatırlanmağa layiq bir şey olmamışdır! (yaxud insanın elə bir dövrü olub keçmişdir ki, o, həmin dövrdə xatırlanası bir şey olmasın?! Əlbəttə, olmuşdur. İnsan əvvəlcə mövcud deyildi, sonra o, yəni ulu babamız Adəm torpaqdan və sudan yoğrulub insan şəklinə salınmış, ona ruh verilmiş və o, həyat sürməyə başlamışdır. İnsanın nə üçün yaradıldığını əvvəlcə nə göy əhli, nə də özü bilirdi. Tədriclə mələklər və o özü nə üçün yaradıldığını anladı). “Həqiqətən, biz insanı (sonrakı mərhələdə ata-anasının toxumundan ibarət) qarışıq bir nütfədən yaratdıq. Biz onu (dünyada özünü necə aparacağı, hər şeyin xaliqi olan Allaha itaət edib-etməyəcəyi ilə) imtahana çəkəcəyik. Biz onu eşidən, görən yaratdıq”. “Biz ona haqq yolu göstərdik. İstər (nemətlərimizə) minnətdar olsun, istər nankor (bu onun öz işidir)” (“İnsan”, 1–3).

“Biz əmanəti (Allaha itaət və ibatəi, şəri hökmləri yerinə yetirməyi) göylərə, yerə və dağlara təklif etdik. Onlar ona yüklənməkdən (götürüb özləri ilə daşımaqdan) qorxub çəkindilər. Ona insan yükləndi. Həqiqətən o, çox zalim, çox cahildir. (İnsan bu ağır əmanəti götürməklə özünə

zülm etdi və cahilliyi üzündən onun çətinliyini, ağır nəticəsini bilmədi) "Allah münafiq kişiləri və qadınları, müşrik kişiləri və qadınları əzaba uğratsın, mömin kişilərin və qadınların da tövbələrini qəbul buyursun deyə (əmanəti Öz razılığı ilə Adəm övladına tapşırdı). Allah (möminləri) bağışlayandır, rəhm edəndir!" ("Əhzab", 72–73).

Sonuncu ayələrin izahı ilə bağlı Ayətullah-üzma Nasir Məkarim Şirazinin "Təfsir"ində oxuyuruq: "İlahi əmanəti daşıması insanın ən böyük fəxridir: Böyük islam təfsirçiləri bu ayə haqqında müxtəlif mülahizələr irəli sürmüş, əmanətin nə olduğunu müəyyən etməyə çalışmışlar. Sözügedən əmanətin əsl mahiyyətinin nədən ibarət olduğunu dərk etmək üçün insana nəzər salınmalı, onun göylər, yer və dağlarda olmayan nəyə malik olduğu dəqiqləşdirilməlidir. İnsan elə fövqəladə potensiala malikdir ki, bu potensialı ilə "Allahın xəlifəsi" ifadəsinin kamil nümayəndəsinə çevrilə, maariflənmə və özünü təmizləmə vasitəsilə yaradılışın ən yüksək iftixar zirvəsinə yüksələ, mələklərdən də yüksəyə qalxa bilər. Bu istedad iradə azadlığı və ixtiyarla müşayiət olunur. Yəni insan sıfırdan başlayıb sonsuzluğa istiqamət alan bu yolu öz ixtiyarı və ayaqları ilə qət edir. Göy, yer və dağlar Allahı tanıyıb Ona müti olsalar da, bu mütilik obyektiv, qeyri-ixtiyari şəkildə kamillik zirvəsinə doğru pərvaz edə biləcək olan varlıq insandır. Bu, bütün mövcudatın qəbul etməkdən imtina etdiyi, təkcə insanın öz üzərinə götürdüyü ilahi əmanətdir. Buna görə də növbəti ayədə insanlar üç qrupa təsnif edilmişlər: möminlər, kafirlər və münafiqlər. Deməli, ilahi əmanət "iradi və ixtiyari şəkildə sonsuz kamilləşmə gücü, kamil insan, xüsusi bəndəlik məqamı və ilahi rəhbərliyi qəbul etmək"dir. Əhli-beyt (ə) imamlarından nəql edilən çoxlu sayda hədislərdə "ilahi

əmanət” deyilərkən möminlərin əmiri İmam Əli (ə) və övladlarının rəhbərliyinin nəzərdə tutulduğu qeyd edilmişdir. Bu da onunla bağlıdır ki, peyğəmbər və imamların rəhbərliyi bütün ilahi rəhbərliyin güclü bir şüasıdır. Allahın təyin etdiyi rəhbərlərin rəhbərliyini qəbul etmədən bəndəlik məqamına yüksəlmək və kamillik yolunu qət etmək qeyri-mümkündür” [2, s.427].

Belə bədii parçaların tərənnümünə digər sənətkarlarımızın yaradıcılığında da rast gəlirik.

*Əbdüləzim, çəksən nə qədər zillət,*
*Çaşmasın xəyalın, eyləmə küdrət,*
*Bu zari-fənada nə qədər möhnət,*
*Hər nə görsən, bir İlahi göstərir [8, s.93].*
*(Şair Əbdüləzim)*

***

*“Əhli-həqq”in tacidari, höccəti-dövran mənəm,*
*Əmri-məruf, nəhy-münkər, dərdinə dərman mənəm.*
*Həqq mənəm, iman mənəm, İslam mənəm, Quran mənəm,*
*Qoymaram əsla yetişsin zalım öz xülyasına!*

*“Həqq gələr, batil gedər”, hökmi-Xudadır, dönmərəm,*
*Mən hidayət nuruyam, tufani-şərdən sönmərəm.*
*Təxti-Merac üstəyəm, göylər enər, mən enmərəm,*
*Kərbəladandır fəqət yol məhşərin səhrasına.*

*Hərzəvü hədyan deyildi Heydəri-Kərrarıma,*
*Yüz xəyanət etdilər ol Əhmədi-Muxtarıma.*
*Verdilər zəhri-cəfa, sərdarimə, dildarıma,*
*Sığmayır qeyrət gəmim ta səbrimin dəryasına!*
*(Mirzə Dahi Almaslı) [9, s.116–117].*

İslam dinində kin saxlamaq və xəyanət etmək ən böyük günahlardan sayılır. Şair də son misrada çatdırır ki, müsəlman olan şəxs bu iyrənc sifətlərdən uzaq olmalıdır.

Ustad aşıq "Eylə" rədifli qoşmasının son bəndində müqəddəs Kərbəla ziyarətindən söz açır və hər kəsə bu ziyarətin nəsib olmasını arzulayır:

*Novrəs İman, sözün eylə müxtəsər,*
*Hər işin haqq bilir, olma mükəddər.*
*Dəşti-Kərbəlayə eylə bir səfər,*
*Öp qədəmgahını, ziyarət eylə! [3, s.42].*

Möhürbəndin bir neçə özəlliyi var. Hər bir şeir parçasında onun əsas hədəf yükünü daşıyan sözlər olur. Bu qoşmanın hədəf yükü elə möhürbəndin son misralarındadır:

*"Dəşti-Kərbəlayə eylə bir səfər,*
*Öp qədəmgahını, ziyarət eylə"*

– beytinə diqqət edək. Əvvəla, xatırlatmaq yerinə düşər ki, aşıq bu ziyarəti çox arzu edirdi, getdi və əbədiyyətə qovuşdu. Sonu bilinmədi… Bir də "Dəşti-Kərbəla" (Kərbəla çölü) ifadəsi altındakı dərin məna yükü. Ümumiyyətlə, Kərbəla torpağının kəramətləri və Kərbəla faciəsinin mahiyyəti barədə tarix boyu danışılıb və danışılacaq. Tarixə və xronikaya bir daha dönüb bəsirət gözüylə baxdıqda Aşıq Novrəs İmanın bu həsrətinin səbəbi aydın olur.

Kərbəla torpağı barədə mərhum Şeyx Abbas Qumminin "Məfatih əl-Cinan" (Cənnətin açarları) kitabından belə bir örnək göstərirlər. O, yazır: "İmam Rza (ə) bir nəfər

üçün Xorasandan hədiyyə göndərmişdi. Hədiyyəni alan adam boxçanı açanda içində bir az torpaq olduğunu görüb soruşur ki, bu nədir? Adam cavab verir ki, bu İmam Hüseyn (ə) türbətidir. İmam Rza (ə) hədiyyə göndərdiyi adama bu torpaqdan bir miqdar qoyur və buyrurur: "Bu torpaq Allahın izni ilə bütün bəlalardan amandır!"

Kərbəla torpağından düzəldilmiş möhür, təsbeh və s. bir çox gördüyümüz və görmədiyimiz bəlaların aradan getməsinə, körpə və mərəzi olan uşağa belə İmam Hüseynin (ə) türbətindən yedizdirilməsi şəfaətə səbəb olar. Mən həyatımda təsadüfən də olsa belə bir hadisənin şahidi olmuşam. O torpağın kəramətini gözümlə görmüşəm. Onu yeyən adam nəinki torpaq yemək bəlasından xilas oldu, həm də onun köməyi ilə xoşbəxt oldu. Həmin adamın belə dediyini eşitdim: "Yediyim torpaqların işində ondan dadlısı yox idi..."

Nə İmam Hüseynin (ə) Kərbəla torpağında şəhadətə qovuşması, nə də onun torpağının kəramətində təsadüf yoxdur. O torpaqdan düzəldilmiş möhürü və təsbehi əldə etməyə cəhd etmək, İmam Rzanın (ə) bu torpağın müqəddəsliyi barədə söylədikləri, İmam Sadiqin (ə) o torpaq üzərində namaz qılması rəvayət olunur. Lakin, rəvayətlərin hər birində bir həqiqət də var.

Eşitmişəm ki, ekzema xəstəliyindən əziyyət çəkən insanlara Kərbəla torpağından düzəldilmiş təsbehi çevirmək tövsiyə olunur. Həmin xəstəliyin o vaxtlar müalicəsi yox idi. Sovet dövründə belə şeylər tövsiyə etmək, insanlara kömək göstərmək xurafat adlandırılırdı. Odur ki, Mircəfər Bağırovun əlində çox vaxt bir topa tilli qələm görmək olardı. Əllərinin qaşınmasını gizlətmək, eyni zamanda qa-

şıntını qismən azaltmaq məqsədi ilə bu qələmləri daim yaxınlıqda gəzdirirdi.

Eyni problemi olan bir orta məktəb müəlliminin çox ehtiyatla Kərbəla torpağından düzəldilmş təsbeh gətizdirdiyini və bir müddətdən sonra onun bu "qələmlərdən" canını qurtardığını eşitdim.

Dədə Ələsgərin kiçik oğlu Aşıq Talıbın dili ilə desək, "Bədbəxt İman"ın səadət üçün o torpağa üz tutması, o ziyarətdən nicat umması nə qədər də məntiqlidir. Zənnimizcə ustad aşıq öz səadətini, dincliyini Kərbəla torpağında tapır və deyir:

*Hər an zikrimdədi ol şahi-əbrar,*
*Bahar buludutək yaş eylərəm car.*
*Həsrətin çəkirəm, bir səfərim var,*
*Orada olmaq üzüqarə çətindi.*

*Mətahım dürrdü, alan yox, satam,*
*Hüseyni-şəhidin matəmin tutam,*
*Oğul yolu gözlər binəva atam,*
*Həsrət çəkər o biçarə, çətindi [3, s.33].*

və yaxud

*Peyğəmbər nə lazım, gətirmə dilə,*
*Sən onun əmrinə gəl düzəl hələ.*
*Novrəstə İmanam, olmuşam belə,*
*Yön çevirib Kərbəlaya gəlmişəm [3, s.50].*

Şərh etdiyimiz qoşmanın əvvəlki bəndləri şəriət hökmlərini ("Firuiddin"in maddələrini) bəyan etmək olsa da

qıfılbənddə ustad aşıq əməldən üstün olan əqidə inancına qayıdır və bildirir ki, insanın əqidəsi düz olmasa onun heç bir əməli Tanrı qatında qəbul olunmaz.

**Ədəbiyyat:**


1. Qurani-Kərim. (Ərəb dilindən tərcümə edənlər: Z.M.Bünyadov, V.N.Məmmədəliyev). Bakı, 2005
2. Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017
3. Novrəs İman. "Seçilmiş əsərləri". (toplayıb tərtib edəni: İslam Ələsgər). Bakı, "Səda", 2004
4. "Nəhcül-Bəlağə" (toplayanı: Seyyid Rəzi; tərcümə və şərh, 2 cilddə). Bakı, 2017
5. Aşıq Ələsgər. Əsərləri, dastan-rəvayətlər, xatirələr. Bakı, "Şərq-Qərb", 1999
6. Əhməd Əmiripur. "Hər müsəlman bilməlidir". Bakı, "Zərdabi LTD MMC" NPM, 2011
7. Seyid İmadəddin Nəsimi. "İrak divanı", Bakı, "Yazıçı", 1987
8. "Ələsgər ocağı". Şeirlər. (toplayanı və tərtib edəni: İslam Ələsgər). Bakı, "Yazıçı", 1991
9. Mirzə Dahi Almaslı. "İşığın aşiqiyəm". Bakı, "SKYE", 2019
10. Hacı Həsən Hüseyni. "Əhli-beyt (ə) aşiqi Dədə Ələsgər". Bakı, "İmza", 2022
11. Hacı Həsən Hüseynov. "Sığın Haqq dərgahına", (məqalələr toplusu-I). Bakı, "Nərgiz", 2013
12. Famil Şirvanov, Təbriz Qasımov. "İslamda olanlar olduğu kimi". Bakı, "Zərdabi LTD", 2018

*Üz vermə nadana, sirr vermə pisə,*
*Bir gün nəzərindən salacaq səni.*
*Özgənin malına gözünü dikmə,*
*Dərin dəryalara salacaq səni.*

*Fanidi bu dünya, olmuşuq qonaq,*
*Nə qədər ucalsan, yenə yerə bax.*
*Göylər atadırsa, anadır torpaq,*
*Axırda qoynuna alacaq səni.*

*Mərd olmaq istəsən, əlini qısma,*
*Daldan deyilənə çox qulaq asma.*
*Yatmış bir ilanın quyruğun basma,*
*Qəfildən qayıdıb çalacaq səni.*

*Ahıla, qocaya çox hörmət elə,*
*Zəlilə, yetimə inaət elə,*
*Qəribə, mehmana sən xidmət elə,*
*Nə əməl eyləsən, bulacaq səni.*

*Halalı unudub, harama qaçma,*
*Haqqın düz yolunu unutma, çaşma,*
*İman deyər, şər-böytana qarışma,*
*Qarışsan da bir gün tapacaq səni.*

# NOVRƏS İMANIN DİNİ-ƏXLAQİ BAXIŞLARI

*Bismillahir-Rəhmanir-Rəhim!*
*Ya Allah ya Rəsul ya Əli səndən mədəd!*

Novrəs İmanın yaradıcılığında öyüd-nəsihət xarakterli bir çox divanilər və qoşmalar vardır. Bu səpgidə əsərlərdə aşıq bir tərəfdən insanı ucaldan mənəvi-əxlaqi keyfiyyətləri tərənnüm edir, digər tərəfdən onu ruhani aləmdən uzaqlaşdıran mənfi halların, heyvani xüsusiyyətlərin ifşasına çalışır. Bu baxımdan şairin "Səni" rədifli qoşması da istisna deyil:

*Üz vermə nadana, sirr vermə pisə,*
*Bir gün nəzərindən salacaq səni.*
*Özgənin malına gözünü dikmə,*
*Dərin dəryalara salacaq səni [3, s.87].*

İlk iki misrada şair bizi nadan və cahil insanlardan uzaq olmağa, qədirbilməz, ləyaqətsiz şəxslərə sirr açmamağa çağırır. Bu poetik düşüncənin əsasında bəzi islami hədislər və folklar vahidləri dayanır:

Allahın Peyğəmbər (s) buyurub: "Allaha itaətsizlik edən kəs, xoş sifət və mənsəb sahibi olsa belə nadandır" [10, s.1379].

"Nadanın xüsusiyyətləri bunlardır: Onunla münasibətdə olan hər kəsə zülm edər, əlinin altında olanlara əl qaldırar, özündən yüksəkdə olanlara qarşı itaətsizlik edər, düşünmədən söz danışar" [10, s.1380].

“Hər bildiyi şeyi bəyan etmək nadanlıqdandır” [10, s.1399].

İmam Əli (ə) buyurur: “Nadanın öz eyb və nöqsnından xəbəri olmaz, xeyrini istəyənin isə nəsihətini qəbul etməz” [10, s.1381].

“Həqiqətən nadan o kəsdir ki, nəfsi, istəkləri onu özünə qul etmişdir” [10, s.1385].

“Nadan məlumatı olmadığı bir şeydə özünü alim hesab edəndir. O, hər məsələdə öz rəyi və nəzəri ilə kifayətlənər. Daim alimlərdən uzaq gəzər, onların eybindən danışar və onlara irad tutar. Öz əleyhdarlarının səhv yolda olduğunu düşünər və başa düşmədiyi şeyi batil hesab edər. Qarşısına çıxan bir mətləbdən anlayışı olmayanda onu inkar edər, yalan hesab edər və öz nadanlığı ucbatından deyər: “Mən belə bir şey tanımıram və güman etmirəm ki, belə bir şey ola bilər. Haradadır həmin şey?” Öz nəzərinə və rəyinə arxalanar, halbuki, öz nadanlığınadan xəbəri yoxdur! Nadanlığına görə daim öz cahilliyindən bəhrələnərək haqqı inkar edər. Nadanlıqdan səfil qalaraq bilik qazanmaq əvəzinə təkəbbür göstərər” [10, s.1388].

“Nadanlığın zirvəsi insanın öz nadanlığı ilə fəxr etməsidir” [10, s.1392].

İmam Sadiq (ə) buyurur: “Nadanın xasiyyətlərindən biri də budur ki, mətləbə axıradək qulaq asmamış cavab verər, öz həmsöhbətinin məqsədini başa düşməmiş ona etirazını bildirər və (mətləbi) dərk etməmiş hökm verər” [10, s.1389].

Nadanlıq üç şeydədir: Dostu dəyişməkdə, dəlil sübut olmadan etiraz etməkdə, əhəmiyyətsiz şeylər barədə sorğu və araşdirmaqda [10, s.1403].

İmam Hadi (ə) buyurur: “Nadan öz dilinin əsiridir” [10, s.1390].

“Nadanlıq bilmədiyin şeylər barədə danışmaqdır”

“Nadanın qiyməti susmağındadır, əgər bunu anlayıbsa artıq o nadan deyil”

“Nadanın susmaqdan başqa yolu yoxdur, amma bunu anlasaydı nadan olmazdı”

“Nadanlıq – insanı dünyaya biganələşdirir, biganəlik isə xərçəng şişi kimi sağalacağına heç bir ümid olmadan yavaş-yavaş böyüyür”

“Nadanlıq hələ neçə-neçə faciələrə səbəb olacaq iblisanə bir qüvvədir”

“Nadanlıq insandan heç bir zəhmət tələb etmir, odur ki, dünyada nadanların sayı çoxdur”

“Nadanlıq – daxilində şərin eşələndiyi toranlıqdır”

“Cəhalət hələ bu vaxtacan heç kimə doğru yol göstərməyib”

“Tarixi bilənlərə sirr deyil ki, bəşəriyyəti bəlaya sürükləyənlər həmişə cahillər olub”

“Alim cahili ona görə anlayır ki, uşaqlıqda özü də elə olub. Cahil isə alimi heç vaxt onun kimi olmadığına görə anlaya bilməz”

*Cahillərə təsir etməz nəsihət də, tədbir də,*
*Doldursan da havayıdır, su qalarmı xəlbirdə*
*(A.A.Bakıxanov)*

Folklor nümunələrimizdə də buna bənzər düşüncə tərzi və deyimlərlə qarşılaşırıq: “Dil başa bəladır”, “Dilini saxlayan başını saxlar”, “Dil başı güdaza verər”, “Dil ki, var ətdəndir, hara döndərsən dönər”, “Dildən acı, dildən şirin şey yoxdur” [12, s.30].

Birinci bəndin ağırlıq yükü son iki misranın üzərinə düşür. Çünki, burada şair fərdi məsələlərdən çox ictimai çatışmazlıqlara, cəmiyyəti parçalayan mətləblərə işarə edir. Əlbəttə, "Özgənin malına gözünü dikmə" öyüdünü adi paxıllıq, həsəd, gözü götürməmək kimi də anlamaq olar. Ancaq dərindən düşündükdə bunu başqasının malını qəsb etmək, haram yollarla qazanc əldə etmək, nəyin bahasına olursa olsun, istədiyi hər şeyi mənimsəmək, özününkiləşdirmək mənalarında dəyərləndirmək daha doğru olar. Şairin bu dünyagörüşünün əsasını təşkil edən dini qaynaqlara diqqət yetirək:

"Yetimin malına, xeyirxah məqsəd (onu qoruyub saxlamaq, çoxaltmaq) istisna olmaqla, həddi-büluğa çatana qədər yaxın düşməyin. Ölçüdə və çəkidə düz olun. Biz hər kəsi yalnız qüvvəsi yetdiyi qədər yükləyirik. Söz söylədiyiniz zaman (lehinə və əleyhinə danışdığınız adam) qohumunuz olsa belə, ədalətli olun. Alah qarşısındakı əhdi (dini vəzifələrinizi, andlarınızı) yerinə yetirin. (Allah) bunları sizə tövsiyə etmişdir ki, bəlkə düşünüb öyüd-nəsihət qəbul edəsiniz!" ("Ənam", 152)

"Oruc gecəsi qadınlarınıza yaxınlaşmaq sizə halal edildi. Onlar sizin, siz də onların libasısınız (bir-birinizə həddən artıq yaxınsınız). Allah sizin özünüzə pislik (xəyanət) etdiyinizi (yaxud nəfsinizə qarşı zəiflik göstərəcəyinizi) bilib tövbələrinizi qəbul edərək sizi bağışladı; artıq siz onlara yaxınlaşın, Allahın sizə halal etdiyini onlardan istəyin; sübh açılınca, ağ sap qara sapdan fərqlənincəyə qədər yeyib-için; sonra gecəyə qədər orucunuzu tamamlayın; məscidlərdə ibadətdə (etikafda) olduğunuz zaman onlarla (qadınlarınızla) yaxınlıq etməyin. Bunlar (bu hökmlər) Allahın

hədləridir, bunları aşmayın! Allah (insanlara) hökmlərini bu cür bildirir ki, bəlkə, müttəqi olsunlar!” (“Bəqərə”, 187).

“Sələm (müamilə, faiz) yeyənlər (qiyamət günü) qəbirlərindən ancaq Şeytan toxunmuş (cin vurmuş dəli) kimi qalxarlar. Bunların belə olmaları: “Alış-veriş də sələm kimi bir şeydir!” – dedikləri üzündəndir. Halbuki, Allah alış-verişi halal, sələm (faiz) almağı isə haram (qadağan) etmişdir. İndi hər kəs Rəbbi tərəfindən gələn nəsihəti qəbul etməklə (bu işə) son qoyarsa, keçmişdə aldığı (sələmlər) onundur (ona bağışlanar). Onun işi Allaha aiddir. Amma (yenidən sələmçiliyə) qayıdanlar cəhənnəmlikdirlər və orada həmişəlik qalacaqlar! (“Bəqərə”, 275)

Bu ayənin izahı barədə təfsirdə oxuyuruq:

“Sələm yeyən adam əvəzsis pul alır, sədəqə verən isə əvəzsiz pul verir. Sələm siniflər arasında ixtilafa və düşmənçiliyə səbəb olduğu halda, sədəqə sevdi və dostluğu artırır. Sələm yoxsulların qanının sorulmasına, sədəqə isə vəhdətə, əmin-amanlığa səbəb olur. Allah-təala bu ayədə din düşmənlərinin hakimiyyətinin qəbul edilməsi istisna olmaqla, heç bir günaha münasibət zina, şərabxorluq, qumar, zülm və s. kimi digər bööyük günahlara olan münasibətdən fərqlənir. Çünki, pis təsirləri dinin əsasını, insan həyatını və ilahi fitrəti məhv edən bu iki günahdan fərqli olaraq digər günahların fəsadları təkcə bir neçə nəfəri və həyatın zahiri yönlərini əhatə edir. Quran və məsumlar (ə) sələmə qarşı çox ciddi və kəskin şəkildə mübarizə aparmışlar. Bu əməllə bağlı çoxlu sayda kəskin məzmunlu hədis və rəvayətlər nəql edilmişdir. İmam Sadiq (ə) buyurmuşdur: “Bir dirhəm sələm almağın günahı öz məhrəmi ilə Kəbədə yetmiş dəfə zina etmiş şəxsin günahındn böyükdür”.

İmam Sadiqə (ə) istinad edilən başqa bir hədisdə belə qeyd edilir: “Günahının böyüklüyü baxımından sələmin yetmiş dərəcəsi var. Ən kiçik dərəcəsi Kəbədə anasına təcavüz etmiş şəxsin günahı qədərdir”. Bu ayədə sələm yeyənlərin davranışı yaxşı ilə pisi fərqləndirməyən dəlinin davranışına bənzədilmişdir. Çünki, o, bir şeyi başqasına bir müddətliyə verir, əvəzində isə həmin şeyi daha çox miqdarda alır. Bu isə fitrətə və vicdana ziddir. Sağlam vıcdan insanın özündən ehtiyac duymadığını başqa ehtiyaclılara verməyi, başqalarında olanla isə öz ehtiyaclarını təmin etməyi tələb edir. Amma sələm birtərəflidir. Sələmçi yalnız alır, varlanır, nəticədə, başqalarını yoxsul və çarəsiz edir. Bu da sələm yeyən adamın ağlını itirməsinə, alqı-satqı ilə sələm arasında fərq qoymamasına, təkcə öz mənafeyini güdməsinə səbəb olur. Ayədə sələmçinin öldükdən sonra Qiyamət günü düşəcəyi bu vəziyyətin təsviri verilmişdir. Peyğəmbərə (s) aid edilən bir hədisdə belə buyurulmuşdur: “Merac gecəsi qarınları çox böyük olduğu üçün yerlərindən qalxa bilməyən adamlar gördüm. Cəbraildən soruşdum: “Bunlar kimdir?” Dedi: “Bunlar dünyada sələm yeyən şəxslərdir. Allah onların barəsində belə buyurmuşdur: “Sələm yeyənlər (Qiyamət günü) yalnız Şeytan toxunmuş kimi qalxarlar (müvazinətlərini saxlaya bilməz, gah yıxılıb, gah durarlar)”. Bunlar səhər-axşam oda atılan və: “İlahi, Qiyamət nə vaxt olacaq?” – deyən Firon davamçıları kimidirlər”.

Peyğəmbərə aid edilən başqa bir hədisdə belə qeyd edilir: “Sələm yeyən adam Qiyamətdə dəli kimi qaldırılacaq, ayaqlarını yerlə sürüyəcək” Bu sözdən sonra “sələm yeyənlər...” ayəsini oxumuşdur [2, s.47].

Hz. Peyğəmbər (s): “O kəs ki, sələm yeyər, həmin yediyi qədər Allah qarnını atəşlə doldurar. Əgər sələmdən mal əldə edərsə, onun heç bir həsənə əməli qəbul olunmaz”.

Məsum imamlar (ə) buyurmuşlar: “Allah sələmi ona görə haram etmişdir ki, insanların malının məhv olmasına səbəb olur”.

“Əgər sələm halal olasaydı, insanlar ticarəti və hər bir lazımlı işi tərk edərdilər”.

“Allah sələmi ona görə haram etmişdir ki, insanlar yaxşı iş görməkdə bir-birinə imtina etməsinlər”.

“Həqiqətən, yetimlərin mallarını haqsızlıqla yeyənlərin yedikləri qarınlarında oda çevriləcək və onlar (qiyamətdə) alovlu Cəhənnəmə girəcəklər” (“Nisa”, 10).

Əməllərin təcəssümü və yetim malını yeməyin cəzası barədə təfsirdə oxuyuruq: “Bu ayədən məlum olur ki, əməllərinizin zahiri siması olduğu kimi, bu dünyada görə bilmədiyimiz həqiqi siması da var. Bu sima o biri dünyada zahir olacaq, əməllərin təcəssümü orada gerçəkləşəcək. Quranın bu ayəsində bildirilir ki, yetim malı yeyənlərin əməllərinin zahiri ləziz və rəngarəng yeməklərdən faydalanmaq olsa da, həmin yeməklərin batini yanar oddur. Qiyamətdə məhz həmin batini sima aşkara çıxacaq. İmam Baqir (ə) buyurmuşdur: “Yetim malı yeyən şəxs Qiyamətə qarnında odla gələcək. Od qarnında elə alovlanacaq ki, şölələri ağzından çıxacaq və bütün məhşər əhli onun yetim malı yediyini başa düşəcək”. Əməlin həqiqi siması hər zaman onun zahiri keyfiyyəti ilə xüsusi bir tənasüb təşkil edir. Yetim malı yemək və onun hüquqlarını qəsb etmək yetimin qəlbini yandırdığı, ruhunu incitdiyi kimi, həmin əməlin həqiqi siması da yandırıcı oddur. Yetimlərin malına təcavüzün çox

pis bir əməl olmasını ifadə edən çoxlu sayda hədis mövcudddur. Bu hökm hətta yetimlərin malına edilən kiçik bir təcavüzə belə şamil olur. Məsumdan (ə) yetim malına hansı miqdarda təavüzün od əzabına səbəb olması ilə bağlı soruşduqda: “İki dirhəm miqdarında” – deyə cavab vermişdir” [2, s.78].

Qoşmanın ikinci bəndində Novrəs İman bu dünya həyatının müvəqqəti, ötəri olmasına diqqət çəkərək bizi lovğalıqdan, təkəbbürlükdən uzaqlaşmağa və əksinə, təvazökar olmağa, başqalarına sevgi və qayğı ilə yanaşmağa çağırır:

*Fanidi bu dünya, olmuşuq qonaq,*
*Nə qədər ucalsan, yenə yerə bax.*
*Göylər atadırsa, anadır torpaq,*
*Axırda qoynuna alacaq səni [3, s.87].*

Özünü tərifləmək, lovğalanmaq, başqaları qarşısında hər hansı bir cəhətdən üstün olduğunu büruzə vermək söz yox ki, təkəbbürlülüyün, özünü başqalarından yüksəkdə, digərlərini isə özündən aşağıda görməyin əlamətlərindəndir. Belə insanlar heç bir zaman cəmiyyət içərisində sevgi və hörmətlə qarşılanmır. Əksinə hamı onlardan üz döndərməyə çalışır. Lovğalıq, təkkəbbürlülük son olaraq insanı onu yaradan Allah qarşısında itaətdən və ibadətdən də uzaqlaşdırır. Məhz, buna görə də Quranda və hədislərdə bu məsələ üzərində geniş dayanılır: “İman gətirib yaxşı işlər görənləri Nəim cənnətləri gözləyir”.

“Adamlardan təkəbbürlə üz çevirmə, yer üzündə lovğalovğa gəzib dolanma. Nəqiqətən Allah heç bir özündən razını, lovğalanıb fəxr edəni sevməz” (“Loğman”, 7, 18)

“Rəhmanın (əsl) bəndələri o kəslərdir ki, onlar yer üzündə təmkinlə (təvazökarlıqla) gəzər, cahillər onlara söz atdıqları (xoşlarına gəlməyən bir söz dedikləri) zaman (onları incitməmək üçün) salam deyərlər”(“Furqan”, 63)

“Ey kafir olan insan, səni kərim olan Rəbbinə qarşı aldadan (və ya: məğrur edən) nədir?” (“İnfitar”, 6)

“Onlara: “Gəlin Allahın Peyğəmbəri (Rəbbinizdən) sizin bağışlanmağınızı diləsin” – deyildiyi zaman (istehza ilə) başlarını bulayar və sən (Ya Rəsulum!) onların təkəbbürlə üz çevirdiklərini görərsən” (“Münafiqun”, 5)

“Yer üzündə təkəbbürlə gəzib dolanma. Çünki, sən nə yeri yara bilər, nə də (boyca) yüksəlib dağlara çata bilərsən” (“İsra”, 37)

Bu mövzu ilə bağlı bir neçə hədisə müraciət etmək yerinə düşər.

Lovğalığın, təkəbbürlü olmağın bədii ifşasına divan ustadlarımızın və el aşıqlarımızın əsərlərində də rast gəlirik:

*Bir yerə gedəndə özünü öymə,*
*Şeytana bac verib, kimsəyə söymə.*
*Qüvvətli olsan da yoxsulu döymə,*
*Demə ki, zorluyam, qolum yaxşıdı [9, s.33].*

Bunu da qeyd edək ki, təhlil etdiyimiz bəndin üçüncü misrasında “Göylər atadırsa, anadır torpaq” Şərq aləmində yayılmış bir fəlsəfi fikrə işarə olunmuşdur. Bu görüşə əsasən göylər, planetlər “abayi-ülvi” (uca, yüksək atalar), yer aləmi isə “ümməhati-sufli” (aşağı analar) hesab olunur.

“Səni” rədifli qoşma bir sıra mənəvi-əxlaqi gözəlliklərin poetik tərənnümü ilə davam edir:

*Mərd olmaq istəsən, əlini qısma,*
*Daldan deyilənə çox qulaq asma.*
*Yatmış bir ilanın quyruğun basma,*
*Qəfildən qayıdıb çalacaq səni [3, s.87].*

İlk misrada şair əliçıqlığın, səxavətin, bütün mərd, özü və sözü bütöv olan insanlar üçün başlıca keyfiyyət olduğunu söyləyir və başqalarına yardım etməyin, nəcibliyin, mərdliyin ayrılmaz bir parçası hesab edir.

Bu əxlaqi sifətlər (mərdlik və əliaçıqlıq) dini və milli qaynaqlarımızda geniş əksini tapmışdır ki, müəllif də öz əsərlərində bu ölməz mənbələrə əsaslanmaqdadır. Bir neçə misal gətirək:

Yeri gəlmişkən qeyd edək ki, milli-dini ənənlərimizdə qonaqsevərliyin, onu göz bəbəyi kimi qoruyub ehtiram göstərməyin onlarla, yüzlərlə örnəyi vardır. Sözü çox uzatmadan həm Qurani-Kərimdən və hədislərdən, həm də Azərbaycan ata sözlərindən bir neçə misal verək.

Allah-təala "Hicr" surəsinin 51-ci ayəsində buyurur: "Həm də onlara İbrahimin yanına gələn qonaqlarından (yanına qonaq gələn mələklərdən) xəbər ver! "O zaman ki, onlar onun hüzuruna daxil olub: Salam!" dedilər (İbrahim də qonaqların yeməklərə əl uzatmadıqlarını görüb). "Biz, həqiqətən, sizdən qorxuruq!" – dedi. "Onlar: Qorxma, biz səni çox bilikli bir oğulla (oğlun olacağı ilə) müjdələyərik!" – deyə cavab verdilər…"

İbrahim (ə) bu sözü qonaqlar oturduqdan, İbrahim (ə) onlara buzov kəsdikdən və onların yemədiyini gördükdən sonra söyləyir. ("Hud" surəsinin 70-ci ayəsində də bu mövzuya işarə etmişdir). Yalnız bu qəribə davranışdan sonra İbrahim (ə) qorxu hissi keçirir və onlardan qorxduğunu

söyləyir. Bəzi təfsirçilər yazırlar ki, həm o dövrdə, həm də ondan sonrakı dövrlərdə, həm də müasir dövrdə bəzi xalqlarda təklif edilmiş duz-çörəyi yeyən adamdan heç bir təhlükə toxunmayacağı, duz-çörəkdən imtina edən şəxsin düşmənçiliyi, kin-küdurət niyyətində olması inancı olmuş və olmaqda davam edir. İbrahim (ə) də bu səbəbdən qorxu hissi keçirmişdir.

"Ya Rəsulum! İbrahimin möhtərəm qonaqlarının (mələklərin) söhbəti gəlib sənə çatdımı?" "Onlar (İbrahimə) yanına gəlib salam verdikdə (İbrahim salamı alıb) öz özünə: "Bunlar tanımadığım kimsələrdir!" – dedi. "O (bir bəhanə ilə) ailəsinin yanına getdi, bir buzov (kəsib, qızardaraq) gətirdi. Onu qabaqlarına (qonaqların qabağına) qoyub: "Bəlkə yeyəsiniz!" – dedi. (İbrahim qonaqların yeməyə əl uzatmadıqlarını gördükdə) onlardan qorxuya düşdü. Onlar: "Qorxma!" – dedilər və ona çox bilikli bir oğlun uşağı-İshaqın dünyaya gələcəyi ilə müjdə verdilər ("Əz-Zariyat", 24–28).

Peyğəmbərlərin (ə.m) bəyənilən sifətlərindən biri qonaqpərvər olmasıdır.

Bəzi peyğəmbərlər gecə vaxtı evində qonağı olmasaydı, yemək yeməzdi. Buna Həzrət-İbrahimi (ə) misal göstərmək olar.

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur:

"Qonaq getməyən evə mələk də getməz".

"Qonaq behiştə yol göstərəndir".

"Qonaqdan qabaq yatmayın".

"Əgər sizi bir qonaqlığa dəvət ediblərsə, övladlarınızı özünüzlə ora aparmayın. Əgər kimsə belə bir iş tutarsa, haram yemiş və o məclisə günahkar daxil olmuş olar".

"Möminlərə ehsan və qonaqlıq vermək beş yerdə sünnədir:

1. Toy məclisində,
2. Həccdən qayıdanda,
3. Övlad dünyaya gələndə,
4. Sünnət toyunda,
5. Ev alanda".

Bir kişi İmam Əlini (ə) qonaq dəvət etdikdə, o Həzrət (ə) buyurdu: "Üç şərtlə sizə qonaq gələrəm: Bazardan bir şey almayasan, evdə olan yeməklərdən gətirəsən və öz ailənə çətinlik yaratmayasan".

İmam Əli (ə) buyurmuşdur: "Qonağı sevən hər bir şəxsin çöhrəsi qiyamət günündə on dörd gecəlik ay kimi parlayar".

İmam Baqir (ə) buyurmuşdur: "Hər kəs dörd müsəlmana yemək versə, sanki İsmailin (ə) dörd övladını əsirlikdən azad etmişdir".

Ev sahibinin əxlaqi vəzifələrindən biri qonaqdan qabaq yeməyə başlayıb, ondan sonra yeməyi qurtarmasıdır.

İmam Sadiq (ə) buyurmuşdur: "Evinə bir qonaq gəldikdə, onun yemək yeyib-yeməməsini soruşma, hər nəyin varsa, gətir (yesin). Çünki olanını (qonağın yanına) gətirən şəxs comərd və gözəl xasiyyətlidir".

"Qonağın ayaq səsini eşidib, gəlişinə görə xoşhal olan elə bir mömin yoxdur ki, günahları bağışlanmasın".

"Hər kəs bir müsəlmanı doyuzdursa, qiyamət günündə onun savabının nə qədər olacağını Allah-taaladan başqa heç kəs bilməz".

"Qonaqlığa (təkcə) dəvət olunsanız, övladınızı özünüzlə ora aparmayın; çünki bu, günahdır və övladınızın da (o qonaqlıqda) yemək yeməsi haram sayılır".

“Qonağa doyunca təam vermək günahların bağışlanmasına səbəb olur”.

“Qonaq ev yiyəsinin bağlı quzusudur”, “Qonaq bərəkət gətirər”; “Qonaq evin gülüdür”; “Qonaq süfrənin yaraşığıdır”;“Qonaq umduğunu yox, olduğunu yeyər”; “Qonaq həyasız olsa, ev yiyəsi evdən qaçar”; “Qonaqsız ev susuz dəyirmandı”; “Qonağa “get” deməzlər, başmağını cütləyərlər”; “Qonağın ruzisi özündən qabaq gələr” [12, s.40].

Gətirdiyimiz bu nümunələrdən də görünür ki, qonaq hər bir evin bəzəyi və bərəkət mənbəyidir. Şair bu mənada deyir ki, Allahın min bir adını anaraq, ona təvəkkül edərək qonağa ehtiram göstərən şəxsin süfrəsindən çörək heç zaman əskik olmaz.

Mərdlik və qonaqpərvərliklə bağlı bədii parçalara digər sənətkarlarmızın yaradıcılığında rast gəlirik:

*Mərd oğulun xanəsinə hər vədə mehman gələr,*
*Zərrə qədər of da deməz, sübh açılar, dan gələr.*
*Min bir ismin sahibini dilində car eyləyər,*
*Ruzusu göydən tökülər, qismətinə nan gələr [11, s.61].*

***

*Arzum budur, bu dünyada*
*Mərdlər dəsbədəs ola.*
*Ömr edə həddən ziyada,*
*Həyat zər libas ola.*
*Namərdə heç nə saymaram,*
*Hökmü kəshakəs ola,*
*Kamandaram, mərdlər üçün*
*Gedərəm qurbanə mərd [11, s.193].*

İkinci misrada (Daldan deyilənə çox qulaq asma) Novrəs İman mərd, sözü bütöv insanların başqa bir əxlaqi üstünlüyünə – qeybətdən, dedi-qodudan uzaq olmağına işarə edir (qeybət barədə yaz, Xəstə Qasım məqaləsinə bax).

Bəndin son iki misrasında (Yatmış bir ilanın quyruğun basma, qəfildən qayıdıb çalacaq səni) Novrəs İman zənnimizcə, namərd, xain, xəbis insanları nəzərdə tutur. Onların iyrənc və üfunətli daxili aləmini gözlərimiz önündə canlandırır. Bu mənada aşığın ilan obrazından istifadə etməsi, belə şəxsləri yatmış ilana bənzətməsi ədəbi-bədii baxımdan gözəl və qüvvətli təsir bağışlayır.

Aşıq qoşmanın dördüncü bəndində də həqiqi insanlığın və əsl müsəlmanlığın mənəvi simasını göstərən bir neçə mühüm ictimai-əxlaqi məsələyə toxunur:

*Ahıla, qocaya çox hörmət elə,*
*Zəlilə, yetimə inaət elə,*
*Qəribə, mehmana sən xidmət elə,*
*Nə əməl eyləsən, bulacaq səni [3, s.87].*

Yaşlı insanlara, xüsusən də valideynlərə hörmət və qayğı ilə yanaşmaq dinimizin başlıca tələblərindən biridir. Təsadüfi deyil ki, müqəddəs kitabımızda Uca Yaradanımız ən azı dörd dəfə özünə ibadətdən sonra ata-anamıza, böyüklərimizə yaxşılıq etməyi, hörmət və qayğı ilə yanaşmağı bizə əmr edir. Həmçinin, Qurani-Kərimdə peyğəmbərlərin (ə) dilindən verilən ibrətamiz dualarda da bu məsələ öz əksini tapmışdır.

Bir neçə örnək verək: "Rəbbin yalnız Ona ibadət etməyi və valideynlərə yaxşılıq etməyi (onlara yaxşı baxıb

gözəl davranmağı) buyurmuşdur. Əgər onların biri və ya hər ikisi sənin yanında yaşayıb qocalığın ən düşkün çağına yetərsə, onlara: “Uf!” belə demə, üstlərinə qışqırıb acı söz söyləmə. Onlarla xoş danış! Onların hər ikisinə acıyaraq mərhəmət qanadının altına alıb: “Ey Rəbbim! Onlar məni körpəliyimdən (nəvazişlə) tərbiyə edib bəslədikləri kimi Sən də onlara rəhm et” – de (“İsra”, 23–24).

“Ey Rəbbim! Məni, ata-anamı, mənim evimə (yaxud məscidimə) mömin kimi daxil olan kimsəni və (qiyamət gününə qədər olacaq) bütün mömin kişiləri və qadınları bağışla. Zalımların isə ancaq və ancaq həlakını (ölümünü) artır” (“Nuh”, 28).

“Yadınınza gətirin ki, Biz bir zaman İsrail oğullarından: “Allahdan qeyrisinə ibadət etməyin, valideynlərinizə, yaxın qohumlarınıza, yetimlərə, yoxsullara ehsan (yaxşılıq, kömək) edin, insanlarla xoş danışın namaz qılın və zəkat verin!” – deyə əhd-peyman aldıq. Sonra az bir qisminiz istisna olmaqla əhdinizdən döndünüz, çünki siz (İsrail övladı haqdan) üz döndərənsiniz (“Bəqərə”, 83).

“Allaha ibadət edin və Ona heç bir şeyi şərik qoşmayın! Ata-anaya, qohum-əqrəbaya, yetimlərə, yoxsullara, yaxın və uzaq qonum-qonşuya, yaxın (yoldaş və) dosta, (pulu qurtarıb yolda qalan) müsafirə (yolçulara) əlinizin altında olana (sahib olduğunuz qul və kənizlərə) yaxşılıq edin! Həqiqətən, Allah özünü bəyənənləri, lovğalıq edənləri sevməz” (“Nisa”, 36).

“Biz insana, ata-anasına (yaxşılıq etməyi, valideyninə yaxşı baxmağı, onlarla gözəl davranmağı) tövsiyə etdik. Anası onu (bətnində) çox zəif bir halda daşımışdı. (Uşağın süddən) kəsilməsi isə iki il ərzində olur. (Biz insana buyurduq:) “Mənə və ata-anana şükr et. Axır dönüş Mənədir!”

Əgər (ata-anan) bilmədiyin bir şeyi Mənə şərik qoşmağa cəhd göstərsələr (bu işdə) onlara itaət etmə. (Qalan) dünya işlərində onlarla gözəl keçin (onlara itaət et). Tövbə edib mənə tərəf dönənlərin (İslamı qəbul edənlərin) yolunu tut. Sonra (qiyamət günü) Mənim hüzuruma qayıdacaqsınız. Mən də (dünyada) nə etdiklərinizi (bir-bir) sizə xəbər verəcəyəm!" ("Loğman", 14, 15).

Valideynlərimizə, yaşlı insanlara ehtiramla yanaşmaq, onlara qayğı göstərmək hədislərdə və atalar sözlərində də təkidlə tösiyə edilir: Bir hədisi-şərifdə Peyğəmbər (s) buyurur: Bir gənc bir qocaya yaşlı olduğuna görə hörmət edərsə, Uca Allah o yaşlananda ona hörmət edən insanlar xəlq edər.[1] Peyğəmbər (s) buyurur: "Bərərkət böyüklərin yanındadır".

"Zəlilə, yetimə inaət elə" – deyərkən Novrəs İman yenə də islam dininin mühüm bir tapşırığını, ehtiyac sahiblərinə, yoxsullara, ata-ana himayəsindən məhrum olan uşaqlara diqqət və qayğı ilə yanaşmaq məsələsini önə çəkir.

Həqiqətən, də ayə və hədislərə baxarkən bu məsələnin belə demək olarsa islamın qırmızı cizgisi olduğunu söyləyə bilərik. Məhz, buna görə də bu mövzu Qurani-Kərimdə və din böyüklərimizin kəlamlarında müxtəlif aspektlərdən işlənmişdir.

"(Ya Rəsulum!) Səndən (Allah yolunda) nə verəcəkləri haqqında soruşsalar söylə: "(Malınızdan) verəcəyiniz şey ata-anaya, (yoxsul) qohumlara, yetimlərə, miskinlərə (pulu qurtaran) müsafirə (yolçuiara) məxsusdur". Şübhəsz ki, Allah etdiyiniz xeyirli işi biləndir" ("Bəqərə", 215).

---

[1] Termizi 1–15, Əbu Davud "Ədəb"–52

"Ay tutulacağı; Günəşlə ay birləşəcəyi (hər ikisinin Qərbdən çıxacağı, nurunun gedəcəyi) zaman" ("İnsan", 8–9).

"Ey möminlər! Əgər siz Allaha və haqla batilin ayırd edildiyi gün – iki dəstənin bir-birilə qarşılaşdığı gün (Bədr günü) bəndəmizə Məhəmmədə" nazil etdiyimizə (ayələrə) iman gətirmisinizsə, bilin ki, ələ keçirdiyiniz hər hansı qənimətin beşdə biri Allahın, Peyğəmbərin, onun qohum-əqrəbasının, yetimlərin, yoxsulların, və müsafirindir (pulu qurtarıb yolda qalan yolçularındır). Allah hər şeyə qadirdir! ("Ənfal", 41).

"Səni yoxsul ikən tapıb dövlətli etmədimi?! Elə isə yetimə zülm etmə!" ("Züha", 8, 9).

"Günahkarlar barəsində (və sonra həmin günahkarlara müraciət edib belə deyəcəklər): "Sizi Səqərə (Cəhənnəmə) salan nədir?" Onlar deyəcəklər: "Biz namaz qılanlardan deyildik"; Yoxsulu da yedirtməzdik; Batilə dalanlarla birlikdə biz də dalardıq" ("Müdəssir", 41, 45).

"O, elə adamdır ki, yetimi itələyib qovar (haqqını verməz) " ("Maun", 2).

"O kəslər ki, onların mallarında müəyyən bir haqq (pay) vardır, dilənən və (hər şeydən) məhrum olan (lakin abırına qısılıb dilənməyən) kimsə üçün" ("Məaric", 24, 25).

"Xeyr! (Belə deməyin). Doğrusu,siz özünüz yetimə hörmət etmirsiniz (yetimin haqqını vermırsiniz). Bir-birinizi yoxsulu yedirtməyə rəğbətləndirmirsiniz" ("Fəcr", 17, 18).

Həzrəti-Əli (ə) belə buyurmuşdur: "Əgər yaxşı işlərə dəvət və pis əməllərdən çəkindirmə tərk olunsa, aradan getsə, xeyir işlər dayanar və şər adamlar hakim olar" [5].

Ustad Möhsün Qiraəti bu məsələ ilə bağlı bəzi incə mətləblərə də işarə edərək yazır ki; "Başqalarını yaxşılığa çağıran və pisliklərdən çəkindirən şəxs özü elm və mərifət sahibi, səlahiyyətli bir şəxs olmalıdır. Bu iş ötəri xarakterdə olmayıb, daimi və nizamlı bir prosesə çevrilməlidir" [14, s.478–479].

M.Füzuli "Hədisi-ərbəin" ("40 hədis") əsərində Həzrəti-Məhəmmədin (s) buyurduğu bu hədisi ("Əsl müsəlman odur ki, müsəlmanlara onun dilindən və əlindən xətər toxunmasın") aşağıdakı kimi nəzmə çəkib:

*Müslüm oldur ki, əhli-aləm ilə*
*Sidq ola qövli, xeyr ola əməli.*
*Zərərin görməyə müsəlmanlar,*
*Ola pakizə həm dili, həm əli [13, s.49].*

*(Əsl müsəlman odur ki, dünya əhli ilə danışığında (sözündə) doğru, əməlində isə xeyirli olsun; Müsəlmanlar (ondan) zərər görməsin. Həm dili, həm də əli təmiz olsun).*

Bu mövzular daim insanpərvərliyi ilə seçilən Azərbaycan ədiblərinin yaradıcılığı üçün də səciyyəvidir.

*Arif ola, eyhamınan söz qana,*
*Naməhrəmdən şərm eyləyə, utana.*
*Saat kimi meyli haqqa dolana,*
*Doğru qəlbi, doğru yolu gərəkdir [6, s.43].*
*(Aşıq Ələsgər)*

***

*“Kim saxlasa dilini, görməz canı xətanı,*
*Dil gətirər başlara hər xətanı, bəlanı” [7, s.109].*
*(N.Gəncəvi)*

***

*Doğruluq dost qapısıdır, doğru gəl gir bu yola,*
*Əgri meydanda utanur, onda iqrar olmasa [15, s.36].*
*(Ş.İ.Xətai)*

Təhlil etdiyimiz şeirə qayıdaq: “Qəribə, mehmana sən xidmət elə, Nə əməl eyləsən, bulacaq səni”. Bu misralarda Azərbaycan xalqının qəriblərə sığınacaq vermək, qonaqpərvərlik kimi gözəl xüsusiyyətləri bədii əksini tapmışdır. Məhz, belə əxlaqi xüsusiyyətlər hər bir insanın, öz yaradıcısı qarşısında məsuliyyətini dərk edən hər bir müsəlmanın ruhi-mənəvi aləmini açıb göstərməkdədir. Yeri gəlmişkən qeyd edək ki, milli-dini ənənələrimizdə qonaqsevərliyin, qəriblərə, səfər zamanı çətinliyə düşənlərə yardım göstərməyin onlarla, yüzlərlə örnəyi vardır: “Sədəqələr (zəkatlar) Allah tərəfindən müəyyən edilmiş bir fərz (vacib əməl) olaraq ancaq yoxsullara, (ehtiyacı olan, lakin utandıqlarındn əl açıb dilənməyən) miskinlərə, zəkatı yığıb paylayanlara, ürəkləri (müsəlmanlığa) isinişib bağlanmaqda olanlara (iman gətirib hələ kamil mömin olmayanlara), azad ediləcək kölələrə (və ya boynuna kəffarə düşüb verə bilməyənlərə), həmçinin (borcu ödəməyə imkanı olmayan) borclulara, Allah yolunda cihad edənlərə və yolçulara (pulu qurtardığı üçün yolda qalan, bətəninə qayıda bilməyən müsafirlərə) məxsusdur. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!” (“Tövbə”, 60).

“Yaxşı əməl heç də (ibadət vaxtı) üzünüzü günçıxana və günbatana tərəf çevirməkdən ibarət deyildir. Yaxşı əməl sahibi əslində Allaha, axirət gününə, mələklərə kitaba (Allah nazil etdiyi bütün ilahi kitablara) və peyğəmbərlərə inanan, (Allaha) məhəbbəti yolunda (və ya mal-dövləti çox sevməsinə baxmayaraq) malını (kasıb) qohum-əqrəbaya, yetimlərə, yoxsullara, (pulu qurtarıb yolda qalan) müsafirə (yolçulara), dilənçilərə və qulların azad olunmasına sərf edən, namaz qılıb zəkat verən kimsələr, eləcə də əhd edəndə əhdinə sadiq olanlar, dar ayaqda, çətinlikdə (ehtiyac, yaxud xəstəlik üz verdikdə) və cihad zamanı (məşəqqətlərə) səbr edənlərdir. (İmanlarında, sözlərində və əməllərində) doğru olanlardır. Müttəqi olanlar da onlardır” (“Bəqərə”, 177).

“Ya Rəsulum! İbrahimin möhtərəm qonaqlarının (mələklərin) söhbəti söhbəti sənə gəlib çatdımı? Onlar (İbrahimin) yanına gəlib salam verdikdə (İbrahim) salamı alıb (öz-özünə): “Bunlar tanımdığım kimsələrdir! – dedi. O (bir bəhanə ilə) ailəsinin yanına getdi və bir buzov (kəsib qızardaraq) gətirdi. Onu qabaqlarına (qonaqların qabağına) qoyub: “Bəlkə yeyəsiniz!” – dedi. (İbrahim qonaqların yeməyə əl uzatmadıqlarını gördükdə) onlardan qorxuya düşdü. Onlar “Qorxma!” – dedilər və ona çox bilikli bir oğlan uşağı (İshaqın dünyaya gələcəyi) ilə müjdə verdilər (“Zariyar”, 24–28).

Qərib kimsələrin ümumiyyətlə insanların yanında qiyməti yoxdursa da Allah-təalanın qatında dəyəri böyükdür. Hədisi-şəriflərdə buyurulur ki:

“Qərib qürbətdə Allah yolundakı mücahid kimidir. Qəriblərə hörmət edin. Çünki qiyamətdə onların şəfaət haqqı

vardır. Ümid var ki, onların şəfaət səbəbi ilə qurtulasınız" (Əbu Nuaym).

"Qərib xəstələndiyi zaman sağına, soluna, önünə, arxasına baxıb tanıdığı bir kimsəni görmədiyi vaxt Allahu təala onun günahlarını bağışlayar" (Deyləmi).

"Qərib ikən ölən şəhiddir" (İ. Əsakir).

"Qəribə yardım edən Cənnəti qazanar" (Deyləmi).

"Möminin doğulduğu yerdən kənarda qərib olaraq ölməsi nemətdir" (Tabərani).

"Qəriblərin dost və yardımçısı Allah və Rəsuludur" (Tirmizi).

"Qəriblər çoxluqda az olan salehlərdir. Onları sevməyən sevəndən çoxdur" (İ. Əhməd).

Allahu təala buyurur ki: Təkəbbürlənməyən, gününü Allahı anmaqla keçirən, (Allahın razı olduğu işlərlə məşğul olan) günahda israr etməyib istiğfar edən, ac doyurdan, qəribi qoruyan, kiçiyə mərhəmət, böyüyə hörmət edənin namazlarını qəbul edərəm. Belə bir kimsələrin istədiklərini verərəm. Dua edərlərsə dualarını qəbul edərəm" (Darəqutni).

"Mömin dünyada qəribdir" (Əbu Nuaym).

Böyüklər, "Mal qürbətdə vətəndir. Kasıbçılıq vətəndə qürbətdir. Bir kimsə kasıbdırsa, harada olursa olsun qəribdir" buyurur. Şair də, "Mən qürbətdə deyiləm, qürbət mənim içimdədir" deyir. Bu qəribliyin səbəbi isə insanların getdikcə pozulmasındadır.

"Qiyamətə yaxın elim azalar, cəhalət artar" (İbni Macə).

"Bu din qərib olaraq başladı, axırı da qərib olar. Xalqın pozduğu sünnətimi düzəldən qəriblərə müjdələr olsun!" (Tirmizi).

"Bir zaman gələcək sünnətim unudulacaq, bidətlər yayılacaq. Sünnətə uyanlar qərib olacaq, tənha qalacaq. Bidətçilər özlərinə çoxlu dost, yardımçı tapacaq. O zamandakı müsəlmanlar sudakı duz, sirkə içindəki qurdcuq kimi çətin şərtlər altında yaşayarlar, dinlərini qorumaqları çətinləşər, ovucdakı atəş kimi, atsalar sönər, saxlasalar əllərini yandırar" (Şira).

"Qəriblər dörddür: Zalımın sinəsindəki Quran, içində namaz qılınmayan məscid, bir evdəki oxunmayan müqəddəs kitab, pis kimsələr arasında olan saleh insan" (Deyləmi).

"İki qərib şey var: Biri səfeh (keyfinə düşgün) kimsədən çıxan "hikmətli sözü" ki, onu qəbul edin. Digəri hikmət əhlindən çıxan səfeh sözü ki, onu əfv edin. Çünki heç bir hikmət əhli yoxdur ki, ayağı sürüşməsin və təcrübə sahibi olmasın" (Deyləmi).

"Haqqın arxasında olmaq qərib və tənha qalmaq deməkdir" (İbni Əsakir).

Qoşmanın möhürbəndində Nörəs İman mənəvi aləmimizin, ruhani varlığımızın bünərə daşı sayıla biləcək son dərəcə mühüm bir məsələyə toxunur:

*Halalı unudub, harama qaçma,*
*Haqqın düz yolunu unutma, çaşma,*
*İman deyər şər-böytana qarışma,*
*Qarışsan da bir gün tapacaq səni [3, s.87].*

Göründüyü kimi bu mühüm məsələ ömür boyu Allahın halal buyurduqlarına riaət etmək, qadağan olunmuş, pislənmiş hər bir şeydən çəkinmə, həmçinin onları digər insanlara da təkidlə çatdirmaqdır. Xalq arasında deyildiyi ki-

mi halal-haram məsələsi ruzi qazanmaqdan tutmuş ailə münasibətlərinə qədər geniş ailə-məişət məsələlərinə, ictimai-siyasi münasibətlərə qədər geniş bir sferanı (sahəni) əhatə etməkdədir. Şairin fikrincə yalnız "haqqın düz yolu"na sadiq qalanlar bu imtahandan üzü ağ, alnı açıq çıxa bilərər.

Mövzu ilə əlaqədar bir neçə ayəyə diqqət yetirək: "(Müxtəlif zamanlarda ayrı-ayrı ümmətlərə göndərdiyimiz peyğəmbərlərə bel buyurduq:) "Ey peyğəmbərlər! Təmiz (halal) nemətlərdən yeyin və yaxşı işlər görün! (Vacib və könüllü ibadətləri həm zahirən, həm də gizli, həmişə yerinə yetirin!) Mən həqiqətən, sizin nə etdiklərinizi bilirəm"("Muminun", 51).

"Ey iman gətirənlər! Allahın sizə halal buyurduğu pak nemətləri (özünüzə) haram etməyin və həddi aşmayın. Doğrudan da Allah həddi aşanları sevməz! Allahın sizə verdiyi ruzidən halal və təmiz olanını yeyin. İnandığınız Allahdan qorxun!" ("Maidə", 87, 88)

"Ey insanlar! Yer üzündəki qidaların təmiz, halal olanlarını yeyin, Şeytanın izi ilə getməyin! Həqiqətən o, (Şeytan) sizinlə açıq-qçığına düşməndir" ("Bəqərə", 168)

"Zinaya da yaxın düşməyin. Çünki o, çox çirkin bir əməl və pis bir yoldur!" ("İsra", 32)

"Ya Peyğəmbər! Mömin qadınlar Allaha heç bir şərik qoşmayacaqları, oğurluq və zina etməyəcəkləri, övladlarını öldürməyəcəkləri (qız uşaqlarını diri-diri gömməyəcəklərini), özgə kişilərdən olan uşaqlarını yalandan ərlərinə isnad etməyəcəkləri və heç bir yaxşı (bəyənilən) işdə sənin əleyhinə çıxmayacaqları barədə sənə beyət etmək üçün yanına gəldikləri zaman onların beyətini qəbul et ə Allahdan onların bağışlanmasını dilə. Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!" ("Mümtəinə", 12).

“Oğru kişi ilə oğru qadının gördükləri işin əvəzi kimi Allahdan cəza olaraq (sağ) əllərini kəsin. Allah yenilməz qüvvət sahibi, hikmət sahibidir” (“Maidə”, 38).

“Ey iman gətirənlər!Sələmi(borc üzərinə qoyduğunuz faizi) qat-qat artırıb yeməyin. Allahdan qorxun ki, bəlkə nicat tapasınız!” (“Ali-İmran”, 130).

“Ey iman gətirənlər! Şərab da (içki də), qumar da, bütlər də, fal oxları da Şeytan əməlindən olan murdar bir şeydir. Bunlardan çəkinin ki, bəlkə nicat tapasınız! Şübhəsiz ki, Şeytan içki və qumarla aranıza ədavət və kin salmaqdan və namaz qılmaqdan ayırmaq istər. Artıq bu işə son qoyacaqsınızmı?” (“Maidə”, 90, 91).

Göyü O ucaltdı, tərəzini (ədalət tərəzisini) O qoydu!

Ona görə də çəkidə həddi aşmayayasınız (insafı əldən verməyəsiniz),

Tərəzini düz tutun, çəkini əskiltməyin! (Çəkidə insaflı olun, tərəzini korlamayın!) (“Rəhman” 7, 8, 9).

“Vay halına çəkidə və ölçüdə aldadanların!”

O kəslər ki, özləri insanlardan (bir şey)aldıqları zaman onu tam ölçüb alar”,

“Onlar üçün ölçdükdə və ya çəkdikdə isə (onu) əskildərlər” (“Mutəffifin” 1, 2, 3).

Göründüyü kimi bu ayələrdə halal-haram məsələsi bir çox yönlərdən işıqlandırılmış və bu məsələlərin insanın həm dünya, həm də axirət həyatı üçün həlledici əhəmiyyəti qeyd olunmuşdur. Əzizi islam peyğəmbərinə və onun pak Əhli-beytindən (ə) gələn ibrətamiz kəlamlarda da bu məsələlər mühüm yer tutur.

Həzrəti-Peyğəmbər (s) buyurub: “Bu dünyada insanlara əzab verən kimsələr qiyamət günü ən şiddətli əzaba düçar olar”. “Bu dünyada iki üzü olanın axirət günü alovdan iki

dili olar”. “Bu dünya evi olmayanın evi, malı olmayanın malıdır”. “Dünya malını ağlı olmayan toplar”.

İmam Baqir (ə) buyurur: “Heç bir ibadət, qarını haram yeməkdən qorumaq və iffətli olmaq kimi fəzilətli deyil”. İmam Səccad (ə) buyurur: “Qarnının sənin boynunda olan haqqı budur ki, onu haram yeməklərə qab etməyəsən”. O həzrət (ə) başqa bir hədisdə buyurur: “Allaha iman gətirdikdən sonra, heç bir ibadət Allah dərgahında qarını haramdan qorumaq və iffətli olmaq qədər xoşa gələn deyil”.

İslam Peyğəmbəri (s) buyurur: “Özümdən sonra ümmətim haqqında üç şeydən qorxuram: Allaha iman gətirdikdən sonra dindən çıxmaq, çaxnaşmalarda yolunu azmaq və qarnın və cinsi istəklərin qeyri-qanuni (haram) yolla doydurulması”.

İmam Hüseyn (ə) buyurub: “Dünyanın Allah-talanın yanında xar və ucuz olmağındandır ki, Yəhya ibn Zəkəriyyənin (ə) başı bəni-İsrail fahişələrindən birinə hədiyyə verildi” [16, s.365].

Bu barədə alimlərimizin verdiyi bəzi mühüm izahları nəzərinizə çatdırırıq:

“Qidalanmanın insanın ruhiyyəsinə, fərqli qidaların insanların əxlaqına fərqli təsirlər qoyduğunu nəzərə alsaq, “pak yeməklərdən yeyin” “yaxşı işlər görün” cümlələri arasında əlaqə olduğunu görərik.

Hədislərdə var ki, haram yemək duanın qəbul olunmasının qarşısını alır. İslam peyğəmbərinin (s) məşhur bir hədisi bu iddianı təsdiq edir. Bir kişi peyğəmbərin (s) yanına gəlib deyir: “Duamın qəbul olunmasını istəyirəm”. Peyğəmbər (s) buyurur: “Yeməyini pak et, haram yeməkdən çəkin” [2, s.345].

İmam Baqir (ə) buyurmuşdur: “Yetim malı yeyən şəxs Qiyamətə qarnında odla gələcək. Od qarnında elə alovlanacaq ki, şölələri ağzından çıxacaq və bütün məhşər əhli onun yetim malı yediyini başa düşəcək”.

Əməlin həqiqi siması hər zaman onun zahiri keyfiyyəti ilə xüsusi bir tənasüb təşkil edir. Yetim malı yemək və onun hüquqlarını qəsb etmək yetimin qəlbini yandırdığı, ruhunu incitdiyi kimi, həmin əməlin həqiqi siması da yandırıcı oddur. Yetimlərin malına təcavüzün çox bir pis əməl olmasını ifadə edən çoxlu sayda hədis mövcuddur. Bu hökm hətta, yetimlərin malına edilən kiçik bir təcavüzə belə şamil olur. Məsumdan (ə) yetim malına hansı miqdarda təcavüzün od əzabına səbəb olması ilə bağlı soruşulduqda: “İki dirhəm miqdarında” – deyə cavab vermişdir [2, s.78].

Azərbaycan poeziyası bu ayə və hədislərlə səsləşən bədii örnəklərlə zəngindir:

*Dünyada qalmayıb zərrəcə hörmət,*
*Qardaş qardaşına eylər xəyanət.*
*Gədalar bəy olub, bəylər rəiyyət,*
*Ağ pullar çevrilib ribaya dönüb [4, s.115].*
*(Qurbani)*

***

*Aldanıb dünyanın cəh-cəlalına,*
*Haram qarışdıran öz halalına,*
*Xəyanət eyləyən qonşu malına*
*Haqqın divanında qaldı da getdi [17, s.80].*
*(Aşıq Ələsgər)*

***

*Ələsgərə şərü-böhtan deyənlər,*
*Şeytana qul olub, riba yeyənlər,*
*Zəkatsız dövlətə halal deyənlər,*
*Onlardan halaldır bu sazım mənim [17, s.113].*
*(Aşıq Ələsgər)*

Novrəs İman möhürbəndin son iki misrasında (İman deyər şər-böytana qarışma, Qarışsan da bir gün tapacaq səni) – bir sıra başqa şeirlərində olduğu kimi, yenə də böhtan atmaq, başqalarını şərləmək kimi iyrənc bir qeyri-insani xüsusiyyətin üzərində dayanır. Görünür bu, aşığın ömrünün gənc çağlarında başına gələn hadisələrlə bağlıdır. Ona görə də bu ağrılı-acılı süjet xətti şairin bütün yaradıcılığı boyu qırmızı cizgi kimi keçir. Şair burada şər-böhtan məsələsini hər bir insanın öz əməllərinə görə layiqincə cəzalandırılması, heç bir yaxşı və pis işin əvəzsiz qalmaması ideyası ilə birlikdə götürülmüşdür. Elə bu qoşmanın dördüncü bəndindəki "Nə əməl eləsən bulacaq səni" – misrası bu deyilənlərin təsdiqi kimi səslənir. Deməli, bu məsələ Novrəs İmanın dini-fəlsəfi görüşünün təməl daşlarından biridir. Bu dünyagörüşünün əsası, qaynağı olan bir neçə dini-milli örəyə diqqət yetirək:

"Kim dünyada zərrə qədər yaxşı iş görmüşdürsə, onu (onun xeyrini) görəcəkdir (mükafatını alacaqdır). Kim də zərrə qədər pis iş görmüşdürsə, onu (onun zərərini) görəcəkdir (cəzasını çəkəcəkdir) "("Zəlzələ", 7, 8)

"Bu gün heç kəsə heç bir haqsızlıq edilməyəcəkdir. Siz ancaq etdiyiniz əməllərin "cəzasını çəkəcəksiniz!" ("Yasin", 54)

"Sizə üz verən hər bir müsibət öz əllərinizlə qazandığınız günahların (etdiyiniz əməllərin) ucbatındandır! (Bütün bunlara baxmayaraq) Allah (günahlarınızın) çoxunu əfv edər" ("Şura", 30)

"Həqiqətən, yaxşı əməl və itaət sahibləri (möminlər) Cənnətdə qərar tutacaqlar. Pis əməl sahibləri (kafirlər) isə Cəhənnəmdə olacaqlar" ("İnfitar", 13, 14)

"Mömin kişilərlə mömin qadınlar bir-birinə dost, hayandırlar. Onlar yaxşı işlər görməyə əmr edir, pis işləri qadağan edir…" ("Tövbə", 71).

Namaz qılın, zəkat verin! Özünüzdən ötrü (əvvəlcə) etdiyiniz xeyri (yaxşı əməllərin əvəzini) Allah yanında taparsınız. Həqiqətən, Allah nə etdiklərinizi görəndir ("Bəqərə", 110).

"Bəli, günah qazanan və qazandığı günahlarla əhatə olunan şəxslər cəhənnəmlikdirlər və orada həmişəlik qalacaqlar. İman gətirənlər və yaxşı işlər görənlər isə behiştlikdirlər və orada əbədi olacaqlar" ("Bəqərə", 81, 82).

"Yaxşılıq da etsəniz özünüzə etmiş olursunuz, pislik də!..." ("İsra", 7)

"Həqiqətən, Biz sizi yaxın bir əzabla (qiyamət gününün əzabı ilə) qorxutduq. O gün insan öz əlləri ilə etdiyi (yaxşı, pis) əməlləri görəcək, kafir isə: "Kaş (bu əzabı görməmək üçün) torpaq olaydım!" – deyəcəkdir" ("Nəba", 40).

Həzrəti-Peyğəmbər (s) buyurub: "Əmr bil-məruf və Nəhy ənil-Munkəri yerinə yetirin, əks təqdirdə Allahın qəzəbi hamınızı yaxalayacaq". Həzrəti-Əli (ə) buyurur: "Əmr bil-məruf və Nəhy ənil-Munkəri tərk etməyin, yoxsa pis insanlar sizə hakim olar. Belə olduğu təqdirdə nə qədər dua etsəniz də qəbul olunmaz" [5, s.978].

Həzrəti-Əli (ə) buyurur: "Əmr bil-məruf edib, özü ona əməl etməyənə və Nəhy ənil-Munkər edib özü ona əməl edənə Allah lənət etmişdir" [5, s.401].

Həzrəti-Peyğəmbər (s) buyurub: "Mənim ümmətim Əmr bil-məruf və Nəhy ənil-Munkər edənədək bir-birinə köməklik göstərib əl tutanadək onların vəziyyəti yaxşı olar. Amma, elə ki, bu iki ilahi vəzifəni tərk etdilər, bərəkət onların üzərindən çəkilər və onların bəziləri (zalımları) digərlərinə hakim kəsilər. Bu vaxt yerdə və göydə onların dadına çatan olmaz".

İmam Əli (ə) buyurur: "Bütün yaxşı işlər və Allah yolunda cihad Əmr bil-məruf və Nəhy ənil-Munkərin müqabilində böyük bir dənizə ağız suyu atmağa bənzəyir" [5, s.1263].

Məlum məsələdir ki, əgər ilahi qanunlar bəyan edilməsə, "yaxşı" və "pis" insanlara tanıtdırılmasa, yaxşı işlər təbliğ olunmasa və pis işlərin qarşısı alınmasa bu vaxt pis əməllərin qəbahəti tədricən aradan gedəcək, günah və azğınlıq adiləşəcəkdir. Nəticədə, fəsad hər tərəfi bürüyəcək və cəmiyyət korlanacaqdır, ictimai asayiş aradan gedəcək və həyat cəhənnəmə dönəcəkdir. Kamillik, mənəviyyat, dünya və axirət səadəti anlamsız məfhumlara çevriləcəkdir. Bu səbəbdən də cəmiyyətdə günah və fəsadın qarşısının alınması, insanların mənəvi saflığı və kamilliyi üçün "Əmr bil-məruf və Nəhy ənil-Munkər" göstərişinə layiqincə əməl olunmalıdır.

Həzrəti-Peyğəmbər (s) buyurub: "Hər kim gizlində günah işlədərsə ziyanı yalnız onun özünə dəyər, amma, əgər bir kəs aşkarda günah işlədərsə və bu günahın qarşısı alınmazsa, bunun ziyanı hamıya dəyər".

İmam Sadiq (ə) buyurub: "Belə şəxs öz əməli ilə Allahın dinini xar etmişdir. (Çünki, Allahın əmrini yüngül saymış və pis əməlin qəbahətini aradan aparmışdır). Allahın düşmənləri onun yolunu davam etdirər" [18, s.166].

"Nə tökərsən aşına, o da çıxar qaşığına", "Özgəsinə quyu qazan özü düşər", "Döymə özgə qapısını, bir gün döyərlər qapını" və s. [12].

*Ləliyəm, azmamışam,*
*Oxuduğumu yazmamışam.*
*Quyu qazan özü düşsün,*
*Mən ki, quyu qazmamışam.*

Bütün bu deyilənlər göstərir ki, Nörəs İmanın "Səni" rədifli qoşması bir sıra mənəvi-əxlaqi və dini-fəlsəfi görüşlərlə zəngindir. Şair poetik imkanları daxilində mərdlik, təvazökarlıq, əliaçıqlıq, qonaqpərvərlik, ehtiyac sahiblərinə qarşı qayğı, kişilik, qayğı, halallığa bağlılıq və s. bu kimi mənəvi-əxlaqi gözəllikləri ön plana çəkmişdir ki, bütün bu mənəvi fəzilətlərin həm dinimizdə, hə də milli düşüncəmizdə mökəm əsasları vardır. Eyni zamanda aşıq bu şeirdə təkəbbürlülük, tamahkarlıq, qəsbkarlıq, xainlik, həsəd, namərdlik, xəyanətkarlıq, haramlara meyllik, başqalarına böhtan atmaq kimi insana yaraşmayan çirkin sifətləri də tənqid atəşinə tutmuş, müəyyən bədii vasitələr və deyilənlərlə ifşa etmişdir. Bu baxımdan "Səni" rədifli qoşması Novrəs İmanın dini-əxlaqi və milli-mənəvi baxışlarını əks etdirən poetik bir güzgüdür.

**Ədəbiyyat:**


1. Qurani-Kərim. (Ərəb dilindən tərcümə edənlər: Z.M.Bünyadov; V.N.Məmmədəliyev). Bakı, 2005
2. Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017
3. Novrəs İman. "Seçilmiş əsərləri". (toplayıb tərtib edəni: İslam Ələsgər). Bakı, "Səda", 2004
4. Qurbani. Bakı, Bakı Universiteti Nəşriyyatı, 1990
5. "Nəhcül-Bəlağə" (toplayanı: Seyyid Rəzi; tərcümə və şərh, 2 clddə). Bakı, 2017
6. Aşıq Ələsgər. Seçilmiş əsərləri. Şeirlər. Bakı, "Yazıçı", 1988
7. Nizami Gəncəvi. "Xəmsə". Bakı "Gənclik", 1981
8. Məhəmməd Füzuli. "Seçilmiş əsərləri". Bakı, "Yazıçı" 1984
9. Xəstə Qasım. Bakı, "Folklor İnstitutu", 2010
10. Məhəmməd Reyşəhri. "Mizanul-hikmət" (xülasəsi). I cild. Bakı, "Nurlar", 2009
11. Aşıq Kamandar (Əfəndiyev). "Mən ellər aşığı xan Kamandaram" (şeirlər). Bakı, "Pedoqogika", 2008
12. Rasim Nəbioğlu. "Aforizmlər və hikmətli sözlər". Bakı, 2007
13. Atəmi Mirzəyev. "Cami, Nəvai və Füzuli yaradıcılığında 40 hədis". Bakı, "Ozan", 1997
14. Möhsün Qiraəti. "Nur" təfsiri. 12 c. Bakı, 2015
15. Ş.İ.Xətai. "Keçmə namərd körpüsündən". Bakı, "Yazıçı", 1988
16. Əllamə Məclisi. "Biharül-ənvar". 110 cilddə, 44-cü cild.
17. Aşıq Ələsgər. Əsərləri, dastan-rəvayətlər, xatirələr. Bakı, "Şərq-Qərb", 1999
18. Əhməd Əmiripur. "Hər müsəlman bilməlidir". Bakı, "Zərdabi LTD MMC" NPM, 2011

*Şiri-davər, ismi-Heydər, Şahi-mərdan, ya Əli!*
*Fəthi-Xeybər, qətli-Əntər, mərdi-meydan, ya Əli!*
*Tifil vaxtı əjdahanı şəqq edən kəhvarədə;*
*O səbəbdən bir adındı "Şiri-Yəzdan", ya Əli!*

*Ustad olan Cəbrailə şəksiz, sənsən, ağa!*
*Ol Adəmin təlimini yəqin, verənsən, ağa!*
*Ənbiyalar rəhbərisən, müşgül görənsən, ağa!*
*Yəqin billəm, sən verənsən dərdə dərman, ya Əli!*

*Bu dünyaya gəlməmişdən ağ devin bəndini çatan,*
*Qərran kimi şir donunda Merac yolunda yatan.*
*Qeyrət ilə qul adına özün Bərbərdə satan;*
*Şəninizə nə deyilsə, yoxdu böhtan, ya Əli!*

*Nə ki, darda qalan olsa, səndən gözləyər nicat,*
*Məhəmmədin dinin açan, sərvəri cəm kainat.*
*Xəlilullah od içində səndən istədi imdad;*
*Möcüzəndən ataş oldu, şux gülüstan, ya Əli!*

*Ol Xudadan nüsrət oldu, sən yeridin göylərə;*
*Möcüzatın bəyan oldu, yetişdi Peyğəmbərə.*
*Novrəs İman dərdi dildə, yazar vəsfin dəftərə;*
*Zəlil qoyma məhşər günü, çoxdu üsyan, ya Əli!*

## NOVRƏS İMANIN HƏZRƏTİ-ƏLİ (Ə) SORAQLI BİR DİVANİSİ

*Bismillahir-Rəhmanir-Rəhim!*
*Ya Allah ya Rəsul ya Əli səndən mədəd!*

Aşıq yaradıcılığının klassik ədəbiyyatda ən çox bağlı olan janri divanilərdir. Çox güman ki, "Divani" sözü bir janr və şəkil adı kimi divan kəlməsindən götürülmüşdür. Bu səpgili şeirlər mövzu, məzmun və bədii xüsusiyyətlərindən aydın olur. Novrəs İmanın əlimizdə hələ ki, 22 divanisi var. Bu divaniərin demək olar ki, hamısı epik-didaktik xarakterli olub, xalq pedaoqogikası üzərində qurulmuşdur. "Ya Əli" rədifli divani isə nakam aşığın coşqun bulaq kimi aşıb-daşan Əhli-beyt (ə) məhəbbətinin ən parlaq bədii təzahürlərindən biridir:

*Şiri-davər, ismi-Heydər,*
*Şahi-mərdan, ya Əli!*
*Fəthi-Xeybər, qətli-Əntər,*
*Mərdi-meydan, ya Əli!*
*Tifil vaxtı əjdahanı,*
*Şəqq edən kəhvarədə;*
*O səbəbdən bir adındı*
*"Şiri-Yəzdan", ya Əli! [3, s.146].*

Qətiyyən ötəri deyildir ki, bənd Həzrəti-Əli (ə) ilə bağlı yeddi məşhur epiteti özündə birləşdirir. Onlar bunlardır:

1) Şiri-davər – hərfən dövr etdirənin Allahın şiri olan bu epitet məmduhun (öyülənin – yəni Həzrəti-Əlinin (ə)) ən çox yayılmış ad və ləqəblərindən biridir. Yəqin elə buna

görədir ki, bu deyim folklor-danışıq üslublu ədəbiyyatımızda olduqca çevik və işləkdir.

*İbtidadan sirrin aldın,*
*Həyyi-davərdən, ağa!*
*Nəqş olunub xilqətimiz,*
*Nuri-ənvərdən, ağa!*
*Əşrəf oldun kainata,*
*Bəhrü həm bərdən, ağa!*
*Bir ilahi xətti çaldı*
*Gərdişi-əflakına,*
*Zikr olmasa ismi-pakın,*
*Düşər ləngərdən, ağa! [3, s.119].*
*(Novrəs İman)*

2) İsmi-Heydər – bəllidir ki, "şir" demək olan Heydər sözü isə məmduhun adı – Əli qədər məşhurlaşmışdır. Klassik aşıqlarımız məmduhu bu ad ilə sevə-sevə tərənnüm etmişlər: Məsələn,

*Əlidir vəsf olan Heydər, Əlidir qəleyi-Xeybər,*
*Əlidir qatili-Əntər, Əlidir miri hər keşfər.*
*(S.İ.Nəsimi)*

***

*Haqq buyurdu Şiri-Əzəm Heydərə,*
*Şəhadət barmağın saldı Xeybərə.*
*Şəmameynən getdi ol Şəhrizərə,*
*Ağam orda boran-qarı çəkibdi [14, s.101].*
*(Qurbani)*

***

*“Bismllahir-rəhmanir-rəhim” deyib*
*Sidq ilə çağırram Şahi-Heydəri!*
*Qeyzə gəlib bir əlində götürdü,*
*Səksən min batmanlıq dəri-Xeybəri [6, s.46].*

*(Aşıq Ələsgər)*

***

*Gəl, verim duanı əziz, bəradər,*
*Əvvəl kirdigara tapşırram səni.*
*Düldülün sahibi, Qənbər ağası,*
*Heydəri-Kərrara tapşırram səni [15, s.111].*

*(Göyçəli Aşıq Nəcəf)*

***

*Aşıq Talıb, qəm eyləmə,*
*Çağır Şahi-Heydəri.*
*Möminlərin pənahıdır,*
*Aləmlərin sərvəri.*
*Könlümüzə işıq salan,*
*Dilimizin əzbəri,*
*Məhəmmədə nazil olan*
*Ayeyi-Quran da var [16, s.86].*

*(Aşıq Talıb)*

***

*Mətlubum istərəm Şahi-Heydərdən,*
*Sahibi-Zülfüqar, Şahi-Qənbərdən,*
*Biçarə Vaqifi salma nəzərdən,*
*Qul xətasız olmaz, ağa kərəmsiz!*

***(M.P.Vaqif)***

3) Şahi-Mərdan – mərd igidlərin, (kişilərin) şahı kimi başa düşülə bilən bu ifadə Həzrəti-Əlinin (ə) demək olar ki, bütün kimliyini əks etdirir. Məs.

*Bir insan Heydərdi – Qəşəmşəm adı,*
*Darda qalanların odur fəryadı.*
*Şahi-Mərdan ilə on bir övladı,*
*Qənbər qabağında qulamkarıydı [17, s.21].*
*(Daşkəndli Aşıq Nəcəf)*

***

*Biz əzəldən ta əbəd meydana gəlmişlərdəniz,*
*Şahi-Mərdan eşqinə mərdanə gəlmişlərdəniz [18, s.98].*

***

*"Şahi-Mərdan"ın, Əlinin aliyəm, övladiyəm,*
*Zülfüqarü tacü Düldül, uş bu nişan məndədir*
*[18, s.52].*
*(Ş.İ.Xətai)*

***

*Seyyida, sən eylə daim Şahi-Mərdan vəsfini,*
*Şahi-Mərdan çeşmüvi məşhərdə giryan istəməz*
*[19, s.260].*
*(S.Ə.Şirvani)*

***

*Sənsən qibləgahım, ya Şahi-Mərdan,*
*Bir zəlil bəndənəm, salma nəzərdən,*
*Dəmirçini sən qaldırdın məzardan,*
*Yaşadırsan bu dünyada ya Əli!*
*(Kəlbəcərli Dəmirçi Abbas)*

4) Fəthi-Xeybər – əslində Fatehi-Xeybər (Xeybər qalalarının fəth edəni) demək olan bu ifadə heca vəzninin tələblərinə görə "Fəthi-Xeybər" şəklində verilmişdir. Məsələn:

*Sidqinən tutmuşam çağırram səni,*
*Xeybərin qalasın alan, ya Əli!*
*Hər kim ayırırsa yarı-yarından,*
*Elə tacü taxtın talan, ya Əli! [7, s.100].*
*(Aşıq Ələsgər)*

***

*Qaldırıb Xeybəri yerindən atan,*
*Tifilkən Ağ Divin bəndini çatan.*
*Özünü qul edib Bərbərdə satan,*
*Sən Əliyyi-Mürtəzanı neylədin? [21, s.30].*
*(Xındı Məmməd)*

***

*Qaldırıb bir dəstinə, atan babi – Xeybəri,*
*Atı Düldül, qulu Qənbər, şirin dillər əzbəri,*
*Ərşi-kürsün, səmavatin, yerin-göyün ləngəri,*
*Din islama şəfa verən Şahi-Mərdan Qırmızı [21, s.21].*
*(Xındı Məmməd)*

5) Qətli-Əntər – əslində qatili Əntər (Əntəri qətlə yetirən) anlamına gələn bu ifadə burada poetik ölçülərə görə Qətli-Əntər şəklinə salınmışdır. məs.

***

*İgid lazım bu meydanda durmağa,*
*Müjgan oxun şirin cana vurmağa,*

*Bir əbu Əntərə qılınc vurmağa,*
*Ağam Əli əldə Zülfüqar gərək [20, s.56].*
*(Aşıq Alı)*

***

*Möminlərin pənahısan,*
*Aləmlərin sərvəri.*
*Fəth etdin Büllur əzəmi,*
*Neçə tilisimləri.*
*Əntərə zərbət vuranda,*
*Lərzə saldın yerləri;*
*Ol Xudadan əmr olundu,*
*Cəbrayıl tutdu pəri,*
*Şəninə "Afərin!", "Əhsən!"*
*Gəldi göylərdən, Ağa! [6, s.191].*
*(Aşıq Ələsgər)*

***

*Saldı şəhadət barmağın,*
*Götdü dəri-Xeybəri;*
*Hökm qıldı Zülfüqara,*
*İki böldü Əntəri.*
*Çəkəndə "Allahü-Əkbər",*
*Qırdı min-min leşkəri.*
*Zəlillərin ümidvarı,*
*Möminlərin sərvəri,*
*Şahi-Mərdan, Şiri-Yəzdan,*
*Mən ona yalavarıram. [6, s.203]*
*(Aşıq Ələsgər)*

***

*Çaldı Zülfüqarı, böldü Əntəri,*
*Tamaşaya gətdi o mələkləri.*
*Mübarək dəstiylə dəri-Xeybəri,*
*Götürüb kənara atdığın deyim [15, s.36].*
*(Göyçəli Aşıq Nəcəf)*

***

*Səni görən dedi: – sirri-sürətdi,*
*Hər addımı möcüzədi, qüdrətdi.*
*Həsrətin Daloğlu Dalı göynətdi,*
*Salsalı dünyadan itirən Əli! [38, s.124].*
*(Həsən Xəyallı)*

6) Mərdi-meydan – bütün qaynaqların yekdilliklə təsdiq etdiyinə görə, milli folklor danışıq üslublu ədəbiyyatımızda məxsus bir meydan motivi vardır. Çünki bu anlayış bütün xəlqi mədəni inkişaf qnunlarımızda geniş yer tutmuşdur. Hərfən meydan igidi demək olan bu ifadə Həzrəti-Əlinin (ə) ərəb kimliyinə bir türk kimliyi də gətirir. Elə Ş.İ.Xətainin aşağıdakı,

*"Xətaiyəm, al atlıyam,*
*Sözü şəkərdən tatlıyam.*
*Murtəza Əli zatlıyam,*
*Qazilər deyən Şah mənəm"*

– sözlərinə də bu baxımdan yanaşmaq gərəkdi: məs,

*Biz əzəldən ta əbəd meydana gəlmişlərdəniz,*
*Şahi-Mərdan eşqinə mərdanə gəlmişlərdəniz [18, s.98].*
*(Ş.İ.Xətai)*

***

*Xəstə Qasım, sən düşmanın atgınan,*
*Mətahını xiridara satgınan.*
*Şahi-Mərdan damənindan tutgınan,*
*Allahı sən çağır, etmə təşvişi [5, s.28].*
*(Xəstə Qasım)*

***

*Dar günümdə yetiş dada,*
*Ya Şahi-Mərdan Ağa!*
*Nitq ver meydan içində,*
*Qoyma sərgərdan, Ağa!*
*Həm Əlisən, həm Vəlisən,*
*Həm səxisən, həm səxa,*
*Həmi dildə zikrim sənsən,*
*Həmi əzbərdən, Ağa! [6, s.190].*
*(Aşıq Ələsgər)*

***

*Yazıq Ələsgərəm, bir kəminə qul,*
*Əysik sözü hərgiz etmərəm qəbul!*
*Bəndeyi-Xudayam, ümməti- Rəsul,*
*Dost tutmuşam Şahi-Mərdan Əlini [6, s.145]*

***

*Qul odur ki, qulluq etsin Sübhana,*
*Qulluq yoxsa, əxrət gedər tufana.*
*Mən Nəbiyəm, mərd çıxaram meydana,*
*Sığınnam Mövlaya, hazır-əl yaraq [22, s.88].*
*(Nəbi Borçalı)*

7) Şiri-Yəzdan – Yəzdan qədim fars dilində Allah deməkdir. Bu ifadə Şiri-davər deyiminin (Allahın şiri demək olub) başqa bir versiyasıdır. Məs:

*Gedən, getmə, mən də gəlim yetirim,*
*Sən getdiyin Kərbəlaya ərzim var!*
*Düldülün sahibi, Qənbər ağası,*
*Şiri-Yəzdan Mürtəzaya ərzim var! [17, s.19].*
*(Daşkəndli Aşıq Nəcəf)*

***

*Əs-səlam, ey Şahi-Mərdan əs-səlam,*
*Əs-səlam, ey Şiri-Yəzdan əs-səlam [23, s.44].*
*(S.İ.Nəsimi)*

*(Ey mərd kişilərin hökmdarı olan Həzrəti-Əli (ə), sənə salam olsun, Sənə salam olsun, ey Allahın Şiri!).*

Daha çox mərd kişilərin rəhbəri şəklində başa düşülən bu ifadə istər klassik poeziyada, istərsə də aşıq şeirində tez-tez dilə gətirilir:

*Bu Xətainin günahın sən götürmə üzünə,*
*Şahi-Mərdan, Şiri-Yəzdan, sirri-sübhanım mədəd*
*[18, s.44].*
*(Ş.İ.Xətai)*

***

*Mən əzəldən nuri-paki Mustafanı sevmişəm,*
*Şahi-Mərdan, Şiri-Yəzdan Mürtəzanı sevmişəm*
*[24, s.306].*
*(M.Füzuli)*

Bəndin Həzrəti-Əli (ə) soraqlı bilgiləri bununla bitmir. Belə ki, üçüncü misra ilə aşıq Həzrəti-Əlinin (ə) uşaqlıq illəri ilə bağlı məşhur bir rəvayəti də bəndə gətirir. Həmin rəvayətə əsasən bir ilan Həzrəti-Əlini (ə) beşikdə yatarkən çalmaq istəyəndə onu bir əlilə iki yerə parçalamışdır. Bu səpgili bədii parçalara həm aşığın, həm də digər sənətkarlarımızın yaradıcılığında da tez-tez rast gəlirik:

*Novrəs İman Göyçə elli,*
*Sidqi Şahi-Heydərə;*
*Ərşi-əladan mədh gəldi,*
*Biz də yazdıq dəftərə;*
*Tifil ikən məhd içində*
*Hökm qıldı əjdərə;*
*Xaliq özü şəfaətçi*
*Yazdı ruzi-məhşərə;*
*Qorxum yoxdu qurulanda*
*Ədalət divan mənim.*

*(Novrəs İman)*

***

*Anadan olmamış möcüzat səndə,*
*Ağ devin barmağın sən saldın bəndə.*
*Göründün Rəsula Merac evində,*
*Almanın nisbini gətirən Əli!*

*(Həsən Xəyallı)*

***

*Şənüvə nazil olubdur Zülfüqar adlı qılınc,*
*Tifl ikən bir əjdaha böldün xəlayiq oldu dinc.*
*Rəzmdə Allahu Əkbər pozdu nərən təblü sinc,*

*Pənceyi-qəhrində qaldı cümlə kafərlər girinc,*
*Dinə soltan, şahi-Mərdan şiri-Yəzdan, ya Əli.*
*(Hacı Kazım)*

*(Ya Əli, Zülfüqar adlı qılınc yalnız səndən ötrü göydən endirilmişdir. Sən hələ uşaq vaxtı, beşikdə yatarkən səni çalmağa gələn iri bir ilanı iki yerə bölüb insanları təhlükədən qurtarıbsan. Döyüş zamanı sənin gətirdiyin təkbir, uca səslə söylədiyin "Allahu-Əkbər" şüarı (düşmənin çaldığı iki iri dəmir parçasından ibarət olub) qorxunc səs çıxaran sinc və təbil alətlərinin səsini batırmışdır. Bütün küffar qoşunu sənin pəncənin altında əyilib məhv oldu. Odur ki, ya Əli, sən dinin hökmdarı, mərd kişilərin şahı və Allahın şiri kimi dinin hökmdarısan).*

***

*Gəhvarədə sən əjdəri böldün ki parə,*
*Bu sehr deyil, qüdrəti-Yəzdandı Əlican,*
*(Sifyari Dilxun Təbrizli)*

Divani davam etdikcə Novrəs İman məmduhunun daha beş keyfiyyətini poetik qavrayışa təqdim edir:

*Ustad olan Cəbrailə,*
*Şəksiz, sənsən, ağa!*
*Ol Adəmin təlimini,*
*Yəqin, verənsən, ağa!*
*Ənbiyalar rəhbərisən,*
*Müşgül görənsən, ağa!*
*Yəqin billəm, sən verənsən,*
*Dərdə dərman, ya Əli! [3, s.147].*

Həmin keyfiyyətlər aşağıdakı motivlərdən ibarətdir:

1) Həzrəti-Əlinin (ə) Həzrəti-Cəbrailə (ə) ustad olması;
2) Həzrəti-Əlinin (ə) Adəmə təlim verməsi;
3) Həzrəti-Əlinin (ə) peyğəmbərlərə rəhbərlik etməsi;
4) Həzrəti-Əlinin (ə) müşkülləri açması;
5) Həzrəti-Əlinin (ə) dərdlərə dərman etməsi.

Bu motivlərin son ikisi özlüyündə kifayət qədər bəlli olduğundan burada onların ilk üçü üzərində ayrıca dayanacağıq.

**Həzrəti-Əlinin (ə) Həzrəti-Cəbrailə (ə) ustad olması:**

Bəndin birinci misrasında "Ustad olan Cəbrailə, Şəksiz, sənsən, ağa!" – deyərkən şair vəhy mələyi Cəbrail (ə) və Həzrəti-Əli (ə) arasında baş vermiş bir hadisəyə toxunur. Bu rəvayət Axund Hacı Soltanın "Həzrəti-Əli (ə) və dünya ədəbiyyatı" kitabında belə verilmişdir:

Hələ Adəm peyğəmbəri (ə) yaratmamışdan əvvəl Allah-təala Cəbrail (ə) adlı böyük mələyi imtahan edir. Ondan soruşur ki, sən kimsən və mən kiməm? Mələyin cavabı düz olmadığına görə Allah tərəfindən onun qanadları yanır və bir cəzirədə həbs edilir. Uzun illər bu cəzirədə qanadsız qalan Cəbrail nagahan Həzrəti-Əlinin (ə) nurunu görür və başına gələn əhvalatı ona danışır. İmam Əli (ə) Cəbrailə deyir ki, bu dəfə də Allah-təala səndən bu sualı etsə de ki: "Sən Xaliqsən (yəni sən xəlq edənsən) mən məxluq (mən xəlq olunan). Sənin adın Cəlildir, mənim adım Cəbrail". Təkrar bu sual Allah tərəfindən Cəbrailə veriləndə o, Həzrəti-Əlinin (ə) təlim etdiyi cavabları deyir. Allahın ərşindən səs gəlir ki, "Əhsən sənə təlim verən ustada". Beləliklə, Cəbrailin (ə) qanadları yenidən özünə

qayıdır. Vəhy mələyi Cəbrail (ə) həmin gündən həmişə fəxr edir ki, Həzrəti-Əli (ə) onun ustadıdır [25, s.156–157].

Bu mövzu həm aşığın öz yaradıcılığında, həm də müxtəlif söz ustadlarımız tərəfindən geniş və rəngarəng çalarlarda işlənilmişdir:

*Yetişdi Rəsula nuri-hilalın,*
*Mürşüd oldu Cəbrailə kamalın... [3, s.51].*
*(Novrəs İman)*

***

*...Qalanda Cəbrail dərya üzündə,*
*Ustad olub öyrədibsən sən ayə [3, s.86].*
*(Novrəs İman)*

***

*Göstərən dəryada rahi-Cəbrail,*
*Yunisi bəlada qoymayan zəlil... [3, s.187].*
*(Novrəs İman)*

***

*Ruzi-əvvəl Cəbraildən ta ki, həqq etdi sual,*
*“Sən nə kimsən?” “Mən kiməm?” – söylə cavabın olma lal.*
*Dedi: “Sən sənsən, Mən mənəm” – od tutdu yandı pərü bal,*
*Mültəci oldu bu ismə, ta ki, rəf oldu məlal,*
*“Şahi-Mərdan, şiri-Yəzdan, Heydəri-Düldülsəvar,*
*La fəta illa Əli, la seyfə illa Zülfüqar!” [26, s.123].*
*(S.Ə.Nəbati)*

***

*“Bey” bismillah əzbərimdi, hey xudadan, ya Əli,*
*Ən ibtida gəldi səda, ərş-əladan, ya Əli.*
*Badi sər-sər, lohü-qələm, oldu dünya olmamış,*
*Bir Cəbrail qalxdı göyə, tək dəryadan ya Əli.*

*Səlli-aləm, mahi-aşkar, zülmətdən var pərdəsi,*
*Sey-Sirrdən səda gəldi, Cəbrail çəkdi bəhsi.*
*Həqiqqəti düz bilmədi, tərsə döndü kəlməsi,*
*Alışıb yandı şahpəri, oldun fərman, ya Əli!*

*Yandı şahpər, endi suya, nələr gəldi yadına,*
*Xaki-kəlam verdi salam, yetişdi muradına.*
*Haqq-təala özü dedi irəhmət ustadına,*
*Hər tərəfdən səda gəldi “Əhsən!”, “Əhsən!”, ya Əli!*

*[27, s.47].*
*(Miskin Abdal)*

***

*Fəthi-şəhri – Zərrin qatili-Salsal,*
*Mürşidü Cəbrail şahi-beyzaval.*
*Qəşəmşəm, Qəzənfər, Şiri-Zülcəlal,*
*Müsəmmasan, bir Minada, ya Əli [27, s.32].*

*(Miskin Abdal)*

***

*Qurbani qurbandı şahın dərinə,*
*Dərviş bilər, xirqə nədi, dəri nə.*
*Ağam qıya baxdı, atdı dərinə*
*Yetmiş il bənd etdi Cəbrail, pərim!*

*(Qurbani)*

***

*Dirili Qurbaniyə göstərdin pəndi,*
*Boynunda var məhəbbətin kəməndi.*
*Dərya üstə oynadırdın səməndi,*
*Sən özün Cəbraili pir eylədin, şah [14, s.133].*
*(Qurbani)*

***

*Zitaha qəbasi, ziyasin kəmər,*
*"İnna fətəh"nayə hüvvət taci-sər,*
*O gün ki, Cəbrail qalmışdı bisər,*
*Ona təlim verib ifad edəndi [28, s.154].*
*(Abbas Tufarqanlı)*

***

*Bu Qasımın imdadır,*
*Peyğəmbərin damadıdır,*
*Cəbrailin ustadıdır,*
*Yerdə, göydə birdi Əli! [5, s.95].*
*(Xəstə Qasım)*

***

*Cəbrail dəryada qaldı, sən yetişdin dadına.*
*Səda gəldi, cavab verdin, o fəryada, ya Əli. [5, s.124].*
*(Xəstə Qasım)*

***

*Rəbbimi şərh etdi, xilqət anladı,*
*Dünyam şükr eyləsin, o, bəndəlidi.*
*Pünhan ikən Cəbrailin ustadı,*
*Kəlamında ilk misra, bənd Əlidir [20, s.309].*
*(Aşıq Alı)*

***

*İrahınan gedən bulmaz müşgülü,*
*Bir ismin "Həl-əta", bir ismin "Vəli".*
*Cəbrailin ustadısan, ya Əli!*
*Sirrlərini kimsə bilməz cabəcah [29, s.19].*
*(Aşıq Musa)*

***

*Şahi-Mərdan doğulmamış verdi Cəbrailə pər,*
*Həsən, Hüseyn, həm Fatiməyə o verən fərmana, gəl*
*[30, s.184].*
*(Qəmgin Fəzi)*

***

*Dərs aldı Cəbrail, yanmadı pəri,*
*Günü günortadan qaytardı geri... [15, s.36].*
*(Göyçəli Aşıq Nəcəf)*

***

*Xındı Məmməd, oxu sözlərin xası,*
*Dilim əzbəridir Qənbər ağası.*
*Qüdrətindən Cəbrailin ustası,*
*Murtuzaye Seyfullaha qulam mən [21, s.32].*
*(Xındı Məmməd)*

***

*Beş kimsənə olmasaydı, dünya tutmazdı qərar,*
*Cəbrailə ustad oldu, su üstündə aşikar... [16, s.85].*
*(Aşıq Talıb)*

***

*Ya Əli, səndən ibarət: doğru məzhəb, doğru din,*
*Yaradıcı bir Allahdır, Cəbrailə sən dedin.*
*Rəsulu-Əkrəm ilə Meracda birinc yedin,*
*Canımı qurban demişəm ol Şahi-Mərdanə mən*
*[31, s.72].*
*(Aşıq Şəmşir)*

***

*Yeddi yer, yeddi göy hökmdarıdı,*
*Yerlə göy yox ikən Əli varıdı.*
*Cəbrailə dərya üstə yar idi,*
*Mənim yarım Şahi-Mərdan Əlidi [25, s.171].*
*(Aşıq Məhbub Xəlili)*

***

*Cəbrail dərsini Əlidən aldı,*
*Ustadlar ustadı odur, timsaldı.*
*Aslan libasında kimə rast oldu,*
*Asimanlar şiri Əlidir, Əli.*
*(Bəhmən Vətənoğlu)*

***

*Cəbrailə ustad o idi xilqəti-əvvəl,*
*Həqdir bu sözüm qeyri səzavər ola bilməz.*
*Kim tutsa Əli damənini "Dağli" ürəklə,*
*La şübhə qiyamətdə günahkar ola bilməz.*
*(Şair Dağlı)*

***

*Ya Əli, "ruzi-ələst" Cəbrailin rəhbərisən,*
*Təkcə nə Cəbrailin, ənibiyalar sərvərisən.*
*Həsəneynin atası, Fatimənin həmsərisən,*
*Gəlməyib, gəlməyəcək sən təki dövranə, Əli,*
*Necə ləbbeyk deməyim, sən təki Sultanə, Əli*
*[25, s.241].*
*(Seyid Əsəd Hüseyni)*

**2) Həzrəti-Əlinin (ə) Adəmə təlim verməsi:**
İmam Əlinin (ə) mübarək adı Adəmə(ə) nicat verdi.

فَتَلَقَّى آدَمُ مِن رَّبِّهِ كَلِمَاتٍ فَتَابَ عَلَيْهِ إِنَّهُ هُوَ التَّوَّابُ الرَّحِيمُ

"Adəm öz Allahından (bəzi, xüsusi) kəlmələr öyrəndi ki, onun tövbəsinin qəbul olmasına səbəb oldu. Həqiqətən, Allah tövbə qəbul edən və mehribandır" ("Bəqərə", 37).

İbn ən Nəcar İbn Abbasdan nəql edir: "Bu kəlmələr Muhəmməd (s), Əli (ə), Fatimə (ə), Həsən (ə) və Hüseynin (ə) mübarək adlarından ibarətdir".

İbn Abbas deyir ki, bir gün Peyğəmbərdən (s) soruşdum: "Adəmin Allahdan öyrəndiyi və tövbə etmək vasitəsi olan sözlər hansılardır?" Buyurdu: "Allahı Muhəmmədə (s), Əliyə (ə), Fatiməyə (ə), Həsənə (ə) və Hüseynə (ə) and verdi, tövbəsi də qəbul oldu."

Hədisi-qüdsidə İbn Abbas Peyğəmbərdən (s) belə nəql edir: "Rəsuli-Əkrəm (s) buyurdu: "Allah Adəmi yaradıb öz ruhundan ona daxil etdikdən, mələkləri ona səcdə etdirdikdən, ona cənnətdə yer verib Həvva ilə evləndirdikdən sonra Adəm (ə) başını ərşə tərəf qaldırdı, gördü ki, orda beş nəfərin adı yazılmışdır. Adəm (ə) soruşdu: "Pərvərdigara,

bunlar kimlərdir? Allah-təala buyurdu: “Bunlar o şəxslərdir ki, əgər məxluqatım üçün Mənim dərgahımda şəfaət etsələr, Mən onların şəfaət və vasitəçiliklərini qəbul edərəm.” Adəm (ə) dedi: “Pərvərdigara, səni and verirəm onların sənin dərgahında olan qədir-qiymətinə, onların adları nədir? Allah buyurdu: “Birincisinin adına gəldikdə, Mən Məhmud olduğuma görə, o da Muhəmməddir. İkincisinin adı: Mən Ali olduğuma görə, o da Əlidir. Üşüncüsünün adı: Mən Fatih olduğuma görə, o da Fatimədir. Dördüncüsünün adı: Mən Möhsün olduğuma görə, bu da Həsəndir. Beşincisinin adı: Mən ehsan sahibi olduğuma görə, o da Hüseyndir. Onların hamısı Allaha həmd və səna edirlər”.[1]

“Ənvarul-aşiqin” kitabında belə bir hədis nəql olunur: “Həzrət Adəm (ə) etdiyi günahın bağışlanması üçün neçə illər ağlayaraq dua etdi, amma bağışlanmadı. Bir gün o, Allah dərgahına üz tutarkən orada nurdan bir qübbə gördü və soruşdu: “Pərvərdigara! O nə qübbədir?”

Allah-Təala buyurdu: “Gördüyün Qübbə Həzrət Fatimədir. Başındakı Tac Həzrət Muhəmməddir. Belindəki kəmər Həzrət Əli, sağındakı və solundakı nur isə Həzrət Həsən və Həzrət Hüseyndir.”

Ya Adəm, mən Fatihəm, O, Fatimədir. Mən Həmidəm (həmd olunan), O Muhəmməddir. Mən Aliyəm (uca), O, Əlidir. Mən Sahibi-ehsanam, o, Həsəndir. Mən Hüsnəm (gözəl), o Hüseyndir. Bil ki, ey Adəm, bu adlar mənim üçün ən əziz olan isimlərdir.

Adəm (ə) dedi: “Pərvərdigara! Səni and verirəm bu isimlərə, məni bağışla.” Allah-Təala buyurdu: “Ey Adəm,

---

[1] Şeyx Hürr Amili. “Hədisi-qüdsinin külliyyatı”.

bu isimlərə xatir mən nəinki səni, sənin bütün nəslini bağışlamağa hazıram.”

İmam Həsən Əsgəri (ə) buyurub: “Bir mömin öldüyü zaman, biri digərindən daha xoş ətirli və daha gözəl üzlü altı nurani şəxs onunla birgə qəbrə doğru hərəkət edər. Onun sağında, solunda, üstündə, altında, arxasında və önündə durarlar. Bu zaman onların ən gözəli soruşacaq: Sizlər kimsiniz? Sağda duran deyəcək: – Mən namazam; soldaki deyəcək: Mən zəkatam; Öndəki deyəcək: – Mən orucam, arxadakı deyəcək: – Mən həcc və ümrəyəm; altdakı deyəcək: – Mən onun din qardaşlarına elədikləri yaxşılıqlaram. Bu arada hamısı bir ağızdan ən gözəl üzlüdən soruşacaqlar: – Sən kimsən ki, hamımızdan gözəlsən? Mən Ali-Muhəmmədin vilayət və sevgisiyəm, deyə o cavab verəcək”.[1]

Bir şəxs İmam Sadiqdən (ə) əmin-aman yer haqqında soruşduqda İmam (ə) buyurdu: “Hər kəs Kəbə evin ziyarət etsə və bilsə ki, bu evin ziyarətini Allah əmr etmişdir, eləcə də, Əhli-beyti (ə) lazımınca tanısa, dünya və axirətdə amanda olacaq”.[2]

İbn Abbas Peyğəmbərdən (s) rəvayət edir ki, Həzrət (s) buyurdu: “Allah-Təalanın vəhy mələyi Cəbrail (ə) şad halda mənim yanıma gəldi. Ona dedim: “Dostum, sən ki, belə xoşhalsan, onda de, görüm, qardaşım və əmim oğlu Əli ibn Əbu Talibin (ə) Allah-Təala yanında məqamı necədir?”

Cəbrayıl (ə) dedi: “Səni yaradan və peyğəmbər seçən Allaha and olsun. Elə indi sənə Əli (ə) haqqında müjdə vermək üçün Allah dərgahından enmişəm. Ya Muhəmməd!

[1]“Biharul-Ənvar”. cild 6. səh. 234
[2] “Üsuli-Kafi”. cild 4. səh. 540

Əliyyül-Əla Allah, sizin ikinizə də salam göndərir və buyurur ki, "Muhəmməd Mənim rəhmət peyğəmbərimdir. Əli də Mənim hüccətimi bərpa edəndir. Əlini (ə) sevən kəsə mən əzab verməzəm, hərçənd Mənə itaətsizlik etsə belə. Əlini (ə) özünə düşmən bilən kəsə rəhm etmərəm, hərçənd Mənə itaət etsə də."

Sonra Həzrət Peyğəmbər (s) sözünə davam etdi: "Qiyamət günü Mən "Rizvan" kürsülərinin birisində, Qüds minbərlərindən birinin üstündə oturacağam. Bu vaxt Cəbrayıl yetmiş tikə parçadan ibarət və hər tikəsi günəş və aydan böyük olan həmd bayrağı ilə Mənim yanıma gələcək. Mən o həmd bayrağını Cəbrayıldan alıb Əli ibn Əbu Talibə (ə) verəcəm. Bu vaxt Ömər narahat olub ərz etdi: "Ey Allahın Rəsulu! Dediyiniz o yetmiş tikədən ibarət və hər tikəsi günəşdən və aydan böyük olan bayrağı Əli necə götürə biləcək?" Peyğəmbər (s) buyurdu: "Qiyamət günü Allah-Təala Əliyə (ə) Cəbrayılın qüvvəsi qədər qüvvə, Adəmin (ə) nuru kimi nur, Rizvanın helmi qədər helm, Yusifin (ə) gözəlliyi qədər gözəllik, Davudun (ə) səsi kimi bir səs əta edəcəkdir. Əgər Allah-Təalanın təqdiri ilə Davud (ə) cənnətdə Həzrət Əlinin (ə) sözünü bəyan edən natiq kimi təyin olunmasaydı, Allah-Təala Davudun (ə) səsi mislində bir səsi Əliyə (ə) bəxş edərdi. Həqiqətən, Əli (ə) iki çayın – Səlsəbil və Zəncəbil çaylarının suyundan ən birinci içən şəxsdir. Həqiqətən, Əli (ə) və onun tərəfdarları Qiyamətdə hamının qibtə etdiyi bir məqamda olacaqlar".[1]

**ربنا امنا بما أنزلت واتبعنا الرّسول فاكتبنا مع الشاهدين.**

[1] "Biharul-Ənvar". cild 8. fəsil 18. səh. 3

"Pərvərdigara! Biz Sənin, Əli (ə) barədə nazil etdiyinə (vilayətə) iman gətirdik."

Əhli-beyt aşiqi, Azərbaycan klassik ədəbiyyatının görkəmli simalarından olan S.Ə.Şirvani də bu ayədə işlənən "kəlimatin" sözündən məqsədin Əhli-beytin (ə) adlarının olmasını qeyd edir.

*Pənc-tənlər adını zikr et ki, Seyyid bilmişəm,*
*Adəmə təlimi-əsmadan bu mənadır qərəz.*

Və yaxud:

*Piri – meyxanə Əlidir, odur ənvari – cəli,*
*Aşinanı tanı, seyr eyləmə biganə üçün.*

***

*Bar-ilahi, Behəqqi-Ali-Əba*
*Əfv qıl cürmümü, bağışla xəta.*
*Sənə bir əbdi-rusiyahəm mən,*
*Bəndeyi-asitani-şahəm mən.*
*Şahım ol Murtəzadı, nuri-cəli,*
*Heydəri-şirdil, Əliyyu vəli*
*Bar-ilahi, behəqqi-Ali-Bətul,*
*Tövbəvü üzrümü sən eylə qəbul.*

*(S.Ə.Şirvani)*

Axund Hacı Soltan da "Əlidir" rədifli qəzəlində Adəmin (ə) tövbəsinin Həzrət Əliyə (ə) xatir qəbul olunduğunu qeyd edir:

*Bildinmi, necə əfv elədi Adəmi Xaliq ?*
*Bu məğfirətin rəhməti-ğüfranı Əlidir [11, s.114–117].*

**3) Həzrəti-Əlinin (ə) peyğəmbərlərə rəhbərlik etməsi:**

Allah-təala peyğəmbərləri, heç şübhə yox ki, insanları haq yola də'vət etmək üçün yaratmışdır. Təkcə bizim Peyğəmbərimizi (s) nəinki insanlara, hətta, varlığın özünə belə düz yolu göstərmək üçün peyğəmbər yaratmışdı. Buna baxmayaraq ki, Məhəmməd (s) sonuncu peyğəmbərdir, amma, hələ varlıq aləmi xəlq olunmamışdan o peyğəmbər idi.

*Ey vücudun əsəri, xilqəti-əşya səbəbi,*
*Nəbi ol vəqt ki, bife'l gərəkməzdi nəbi.*

*(Ey vücudun əsəri hər varlığın yaranmasına səbəb olan. Sən həqiqətən, peyğəmbər lazım olmayan vaxtda da peyğəmbər idin).*

**Qeyd:** Bu qəzəl yaranmışların ən şərafətlisi, insanlıq aləmində ən yüksək mövqe sahibi olan Məhəmməd peyğəmbərin (s) haqqında yazılmış nətdir.

M.Füzuli də deyir ki, ya Məhəmməd (s) sənin varlığının əsəri, bütün varlıqların yaranmasına səbəb oldu. Sən, peyğəmbər lazım olmayan vaxtdan elə peyğəmbərsən.

İslamın böyük alimlərindən biri ayətullah Mər'əşi Nəcəfi özünün “Ehqaqül-həq” adlı əsərində Peyğəmbərin (s) dilindən belə bir hədis nəql etmişdir: “Adəm peyğəmbər cənnət bağını (burada yer cənnəti nəzərdə tutulur) seyr edərkəndüşünür ki, görəsən ALLAH bu əzəməti mənim xatirimə görəmi xəlq etmişdir? O anda hatifdən qulağına bir səs gəlir ki: – “Ya Adəm! Başını qaldırıb səmaya bax”. Adəm (ə) diqqət edəndə səmada beş nəfərin şəklini görür.

Adəm (ə) bunların kim olduğu ilə maraqlananda hatifdən gələn səs deyir: – “Bunlar “pənctəni-ali-əba”dır”, o nurani sima gələcəkdə sənin sülbündən dünyaya gələcək sonuncu Peyğəmbər Məhəmməddir (s). Allah bütün məxluqatı, həmçinin də səni bu şəxsin xatirinə yaratmışdır”

Seyyid Əzim Şirvani “aşına eylərəm nəzər, fikri hilalə düşmüşəm” mətləli qəzəlin axırıncı beytində bu mətləbə işarə edir:

*Mülki-cəhanda Seyyida, xatəmi-aşiqan mənəm,*
*Nöqteyi-əvvələm, vəli, növbədə dalə düşmüşəm*
*[12, s.419–420].*

***

*Kövsəri-cənnət onun hökmündədir, ol vəch ilə*
*Cümlə nəslundən həmin Adəm ona mehman olur.*

*(Cənnətdəki Kövsər hovuzu Həzrəti-Əlinin (ə) ixtiyarında olduğundan Adəm peyğəmbər (ə) bütün nəsli ilə birlikdə ona qonaq olacaqdır).*

“Həzrəti-Adəm (ə) kainatda yaradılan ilk insandır. İlk başlanğıcda Allahdan başqa heç bir varlıq yox idi. İndi müşahidə etdiyimiz aləmlərin heç biri də yox idi. Yalnız Allah-təala var idi”.

Yaradan Özünün tanınmasını və Özünə ibadət edilməsini iradə etdi.

Odur ki, O, kainatı, yeri, göyləri və bunların içərisindəki bütün varlıqları yoxdan yaratdı.

Həzrəti-Adəmi (ə) də torpaqdan xəlq etdi. O, Adəmə ruh verdi. Yer üzündə yaşayacaq, həyat sürəcək bütün bəşə-

riyyətin ilk atası kimi Həzrəti-Adəmi(ə) ata-anasız, heç bir bənzəri olmadan və maddəyə ehtiyac duymadan oz qüdrəti ilə yaratdı.

Sonra Allah Həzrəti-Adəmə (ə) peyğəmbərlik verdi. Beləliklə, Həzrəti-Adəm (ə) Yer üzündə yaradılan ilk insan və ilk peyğəmbər, həmçinin insanlığın əcdadı olma şərəfinə qovuşdu.

Ulu Yaradan Adəmlə (ə) zövcəsi Həvvanı cənnətdə yerləşdirdi və onlara orada yeyib-içmələrini, gəzib dolaşaraq gözəl bir ömür sürmələrini tapşırdı. Bununla belə, O, bu cütlüyə tək bir şeyi qadağan buyurdu: “Bu ağacın meyvələrinə toxunmayın!”.

Ancaq, şeytan onları aldadaraq qadağan olunmuş bu ağacın meyvəsindən yeməyə sövq etdi.

Bunun nəticəsində onlar cənnətdən çıxarılaraq Yer üzünə göndərildi. Həzrəti-Adəm (ə) Hindistan tərəflərdə Sərəndib adasına, Həzrəti-Həvva (ə) isə Məkkə tərəflərdə indiki Ciddə şəhərinə enmişdi.

Onlar səhvlərini başa düşüb tövbə etdilər. Allah da onların tövbələrini qəbul buyurdu.

Həzrəti-Adəmə (ə) 1000 illik bi ömür sürmüşdür. O, Məkkədə olan Əbu-Qubeys dağında dəfh olunmuşdur. Ondan bir il sonra vəfat edən Həvvanın da elə orada dəfn edildiyi rəvayət olunur [37, s.130–131].

Həzrəti-Əlinin(ə) peyğəmbərlərlə müqayisəsinin əsasında dayanan islami müddəalardan biri, bəlkə də birincisi, imamətin risalət və nübuvvətinin qanunauyğun davamı olmasıdır.

“...Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi (Məkkənin fəthi) islamın mövqeyinin möhkəmlənməsi, cahiliyyət dövrünün bir sıra zərərli adətlərinin

aradan qaldırılması və i.a.) tamamladım və sizin üçün din olaraq İclamı bəyənib seçdim...” (“Maidə”, 3) ayəsinin Qədir-Xum (Həzrəti-Məhəmmədin (ə) Həzrəti-Əlini (ə) ilk imam olaraq, əzəli-əbədi tövhid məfkurəsini bilavasitə Həzrəti-Peyğəmbərdən (s) təhvil almış, Həzrəti-Adəmdən (ə) başlanan etiqad, ibadət və əxlaq zəncirinin imamət mərhələsinin ilk halqası olmuşdur [9, s.297–298].

*Nuh onun sənduqinə gəştitək aparmış pənah*
*Ehtiyat eylər ki, nagəh bir dəxi tufan olur!*

*(Qəfildən bir daha tufan qopacağından ehtiyat edən Nuh (ə) peyğəmbər bir vaxtlar gəmiyə sığındığı kimi, indi də Həzrəti-Əlinin (ə) sandığına (məzarına) sığınmışdır).*

Həzrəti-İdrisdən (ə) sonra sürətlə artan insanlar vaxt ötdükcə haqq yoldan azmışdılar. Bütlərə ibadət etməyə başlamışdılar.

Allah yollarını azmaqda olan bu insanlara Həzrəti-Nuhu (ə) peyğəmbər olaraq göndərdi. O, usanmadan yoldan çıxmış qövmünə illərcə öyüd-nəsihət verirdi.

O, “Ey mənim qövmüm, Allaha ibadət edi, Ondan başqa məbud yoxdur” – deyərək öyüd-nəsihətini davam etdirirdi.

Ancaq qövmü Nuh peyğəmbəri eşitmədi, əksinə, ona işgəncə verməyə başladı.

O, Allaha yalvardı. Duası qəbul olundu. Göylərdən sel kimi yağış yağdı. Yerdən də sel-su qaynayan qazan kimi fışqırdı. Yer kürəsi bir an içində böyük bir dənizə çevrildi. Bu, “Nuh tufanı”nın başlanması demək idi. Tufan altı aya yaxın çəkdi.

Həzrəti-Nuh (ə) Allahın əmri ilə bir gəmi düzəltdi. Həzrəti-Nuhun gəmiyə mindirdiyi 80-ə yaxın mömindən və heyvanlardan başqa yer üzündə heç bir canlı qalmamışdı, hamısı suda boğulub məhv olmuşdu.

Allahın buyurduğu öz yerini aldı. bütün kafirlər məhv olub getdi. Məhv olanlar arasında Həzrəti-Nuhun (ə) iman gətirməyən bir oğlu da var idi.

Tufandan sonra sular çəkildi. Həzrəti-Nuhun (ə) gəmisi Cudi dağının üzərində dayandı. Yenidən insanlar Həzrəti-Nuhun (ə) nəsli vasitəsilə artıb çoxaldı. Buna görə də ona ikinci Adəm deyilir. Onun min ilədək ömür sürdüyü rəvayət olunur" [37, s.133–134].

*Gərçi İsmailə qurban göydən enmiş qədr üçün,*
*Həqq bilir qədr üçün ismail ona qurban olur [24].*
*(Məhəmməd Füzuli)*

*(Qədr-qiyməti bilinsin deyə, göydən Həzrəti-İsmail(ə) üçün qurbanlıq heyvan gəlməsinə baxmayaraq, Allah bilir ki, öz qədir-qiymətini artırmaqdan ötrü Həzrəti-İsmailin(ə) özü Həzrəti-Əliyə (ə) qurban olmağa hazırdır).*

"Həzrəti-İsmail (ə) Həzrəti İbrahim (ə) peyğəmbərin böyük oğludur. Anası hacər xanımdır. O, Məkkədə böyüyüb boya-başa çatmışdır".

Həzrəti-İsmail (ə) Yəmən qəbilələrinə ə "Əməliqə" deyilən qədim bir xalqa peyğəmbər göndərilmişdir". O, atası İbrahim (ə) peyğəmbərin şəriətinə istinad etmişdir.

İsmail (ə) peyğəmbər atasından qırx il sonra yüz otuz yeddi yaşında vəfat etmişdir və anası Hacər xanımın "Hicr"dəki qəbri yanında dəfn olunduğu rəvayət edilir.

O, uşaq olarkən atası Həzrəti-İbrahimin (ə) gördüyü bir rəhmani yuxu nəticəsində qurban kəsilmək istənilmiş, ancaq onun yerinə Tanrı qatından bir qoç göndərilmişdir.

Quranda İsmail (ə) peyğəmbər barəsində 15-dək ayə var. Peyğəmbərimiz Həzrəti-Muhəmməd (s) bu böyük Allah elçisinin nəslindəndir" [37, s.138–139].

*Möcizi bir gülşəni-pakizədir kim istəsə,*
*Əndəlib ol gülşənə Davudi-xoşəlhan olur.*

*(Həzrəti-Əlinin (ə) möcüzəsi (möcüzəli ömür yolu) bir pak, saf çəmənlikdir. Belə ki, əgər o, arzulayarsa, xoş səsli Davud (ə) peyğəmbərin özü həmin çəmənliyin bülbülü olmaqla fəxr edər).*

Həzrəti-Davud (ə) Yaqub peyğəmbərin nəslindəndir. Həzrəti-İsmail (ə) peyğəmbərin vəfatından sonra Allah-təala tərəfindən Həzrəti-Davuda peyğəmbərlik verildi. Ona 4 böyük kitabdan biri olan Zəbur nazil olmuşdur.

Həzrəti-Davud (ə) "Əmaliqə" adlanan qövmün hökmdarı Calutu təkbətək vuruşda öldürmüş, öz hökmdarı Talutun qızını almağa layiq görülmüş və qaynatasının yerinə hökmdarlıq etmə haqqını qazanmışdır. Beləliklə o, həm peyğəmbər, həm də hökmdar olmuşdur. O, gözəl davudi səsi ilə Zəburu oxuyar, ətrafdakılar da Allaha dərin məhəbbət hissi ilə dinləyərmişlər.

O, dəmirdən zireh düzəldər, dəmir əlində muma dönərdi. Bu peyğəmbər çörəyini öz əlinin zəhməti ilə qazanmışdır. Odur ki, o, heç vaxt beytülmaldan pul almazdı.

Həzrəti-Davud (ə) qırx il hökmdarlıq etdi, yetmiş yaşında vəfat etdi. Bu peyğəmbər barəsində 14 ayə nazil olmuşdur” [37, s.148–149].

*Hər kim ixlas ilə xaki-mərqədindən zərreyi*
*Alsa, onunla təbabət eyləsə, Loğman olur.*

*(Kim Həzrəti-Əlinin (ə) məzarının torpağından bir zərrə götürüb onun vasitəsi ilə müalicə etsə, (tibb sahəsində) Loğman qədər ad çıxarar).*

Beytdə qəsidənin öncəki bölümündə geniş mənalandırılan “İmam Əli (ə) təsiri” anlayışı bu dəfə öyülənin milyonlarca möminin sidqini bağladığı pak məzarı üzərində bədii qavrayışa görə təqdim olunur. Şair bəzilərinin iddia etdiyi kimi, qəbir ziyarəti məsələsində qətiyyən birtərəfli mövqe tutmur, qəbirləri ziyarət etməyin əslində bu dünya ilə axirət arasında möhkəm ruhi-mənəvi rabitə yaradacağına inanır. Bu zaman Füzuli, heç şübhəsiz, bütün varlığı ilə qail olduğu Müqəddəs kitabına güvənir: “Ey iman gətirənlər! Allahın qəzəbinə düçar olmuş bir qövmlə dostluq etməyin. Kafirlər qəbiristan əhlindən (ölülərin qiyamət günü diriləcəyindən) ümidlərini üzdükləri kimi, onlar da axirətdən (axirətdə Allahın mərhəmətindən) ümidlərini üzmüşlər!” (“Mumtəhinə”, 13)

*Ol şahənşah kim əgər bir murə qılsa iltifat,*
*Mur hökm eylər Süleyman üstünə, sultan olur! [24].*
*(Məhəmməd Füzuli)*

*(Həzrət-Əli (ə) adicə bir gücsüz qarışqaya belə mərhəmət gözü ilə nəzər salsa, qarışqa dünyanın ən böyük cahangirlərindən olan Süleyman (ə) peyğəmbər üzərində belə, bir hökmdara çevrilər).*

Beytdə hakimiyyət bildirən sözlərin çoxluğu (şahənşah, hökm, sultan) göz önündə tutulduqda öyülənin "hökmdarlar hökmdarı" adlandırılması, qətiyyən bəsit mübaliğə cəhdi sayıla bilməz. Çünki, burada adi hakimiyyətdən söhbət getmir. Fauna aləmində aralarında xüsusi tabeçilik münasibəti olan qarışqaların həyatının həyat həqiqəti olaraq motivləşdirilməsi bu mübaliğəyə dərin bir estetik qayə aşılayır.

Beytin fikri axarını müəyyənləşdirməkdən ötrü üç cəhət aydınlaşdırılmalıdır: 1) Məmduhun "iltifat qılması"; 2) "Qarışqa-Süleyman əhvalatı"; 3) "Əksliklərin ilahi qüdrət və hikmətin əlaməti olaraq vəhdəti və mübarizəsi".

Həzrəti-Əlinin (ə) "iltifat qılması" dedikdə şair onun bilavasitə Allahdan, dolayısı ilə Rəsulullahdan (s) qaynaqlanan övliyalıq müstəsnalığını, bu müstəsnalığın tərkib hissələrindən biri olan əlahiddə lütfkar baxışını və mərhəmət nəzərini nəzərdə tutur. Əlbəttə, burada əski əsatiri inamların zaman-zaman islami örtüyə bürünməsinin, islamın qayğısına sığınmasınn, ayrı-ayrı məzhəb və təriqətlərdə bu və ya başqa ölçüdə cilvələnməsinin də əlamətləri var. Lakin, unutmaq olmaz ki, şiəlikdə bu qətiyyən əsatir məzmunu daşımayıb, formalaşıb bərqərar olmuş birmənalı bir inamın bariz təzahürüdür. Odur ki, burada heç bir batil cizgi axtarmaq lazım deyil.

Anlayışın tanrıdan qaynaqlanması öqülənin "vəliyullah"lıq səciyyəsi ilə bağlıdır. "Vəliyullah"lıq səciyyəsini şərtləndirən başlıca amil isə Allahla dostluq etmə, xüsusi

ilahi mərhəmətə layiq görülmə kimi dini müstəsnaliqlara söykənir.

Bu anlayışlar Qurani-Kərimdə geniş yer tutmaqda, ən müxtəlif məqamlarda işlənməkdədir; məs: "Şübhəsiz ki, insanların İbrahimə ən yaxın olanı onun ardınca gedənlər, bu Peyğəmbər (Məhəmməd) və ona iman gətirənlərdir. Allah möminlərin dostudur!" ("Ali-İmran", 68), "Bilin ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər. O kəslər ki, iman gətirmiş və pis əməllərdən çəkinmişlər. Onlara dünyada da, axirətdə də müjdə vardır. Allahın sözləri (verdiyi vədlər) heç vaxt dəyişməz. Bu, ən böyük qurtuluşdur (uğurdur)!" ("Yunus", 62–64), (Ya Peyğəmbər!) De ki: "Ey yəhudilər! Əgər bütün insanlardan fərqli olaraq, özünüzün Allahın dostları olduğunuzu iddia edirsinizsə, (və bu iddianızda) doğrusunuzsa, onda (Allahdan) ölüm diləyin! (çünki Allah dərgahındakı nemətlər, əbədi həyat övliyalara ancaq öləndən sonra qismət olar)" (Cümə 6) .

"Əli (ə) lütfü" anlayışının Həzrəti-Məhəmmədlə (ə) bağlılığı isə sonuncu peyğəmbərlə ilk imam arasındakı üzvi vəhdətdən irəli gəlir. Bu vəhdətin özülündə "Allah peyğəmbərlərin hər birini ayrı bir ağacdan, mənimlə Əlini isə vahid bir ağacdan yaratdı", "Əli məndəndir, mən də Əlidənəm", "Mənim adımdan məndən və Əlidən başqa heç kəs danışa bilməz" – kimi mötəbər hədislər durur [9, s.274].

Aşıq divaninin üçüncü bəndində qəhrəmanını mifik əsatiri keyfiyyətlərlə bir qədər əlçatmaz, ünyetməz edir:

*Bu dünyaya gəlməmişdən,*
*Ağ devin bəndini çatan;*
*Qərran kimi şir donunda*
*Merac yolunda yatan;*

*Qeyrət ilə qul adına*
*Özün Bərbərdə satan;*
*Şəninizə nə deyilsə,*
*Yoxdu böhtan, ya Əli! [3, s.147].*

Bəndin ilk misrasının ("Bu dünyaya gəlməmişdən Ağ Divin bəndin çatan") şərhi ilə bağlı məşhur bir rəvayətə işarə olunur: Deyilənlərə görə, qədim dövrlərdə div adlanan və insan əti ilə qidalanan vəhşi heyvanlar olmuşdur. İnsanlar bu bəlanı dəf etmək üçün gecə-gündüz Allah-təalaya dua edirlər. Nəql edirlər ki, bir kənd camaatı yenə divin əlindən fəryad etdikləri zaman yaxınlaşmaqda olan gözəl üzlü bir gənci görüb ona öz dərdlərini danşırlar: "Ey cavan, o qarşıda gördüyün dağda bir ağ div yaşayır və hər gün bu kənddən bir nəfəri aparıb yeyir. Bu gün də çəməndə gül-çiçək toplayan gənc qızı aparıb". Cavan bildirir ki, naümid olmayın, mən gedib qızı divdən alıb gətirərərəm, divi də zindana salaram. Cavan divin gözünə və qulağına zərbə endirdi. Divin həm qulağı kar oldu, həm də gözü kor oldu. Fürsəti əldən verməyən cavan xurma lifəsiylə onun iki barmağını çatıb bağladı və qızı azad etdi. Div yalvarıb soruşdu ki, nə vaxt əl-qolumu açacaqsan? Cavan dedi ki, üç yüz ildən sonra Həzrəti-Məhəmmədin (s) zamanında. Üç yüz il keçdi. Div hey vurnuxurdu ki, bu məqamı əldən verməsin. Div artıq Məhəmməd Əmin kimi məşhur olan peyğəmbərimizi tapıb yalvarır ki, əl-qolunu açsın. Həzrəti-Peyğəmbər (s) onun barmaqlarını xurma lifəsindən azad edib, o cavanın kimliyini xəbər aldı. Div dedi ki, o cavan özü də buraya gələcək. Bu zaman xəbər yayılır ki, Fatimə Binti Əsəd adlı bir xanım Kəbədə qəribə əlamətləri olan bir uşaq dünyaya gətirib. Görür ki, xanım üç yüz il bundan əvvəl

tutub yemək istədiyi həmin gənc qızdır və əlindəki uşaq həmin cavandır. Bu rəvayəti nəzmə çəkməklə Aşıq Ələsgər İmam Əlinin (ə) igidlik, xeyirxahlıq, uzaqgörənlik, vəfadarlıq kimi müsbət insani sifətlərini tərənnüm etməyə çalışmışdır. Aşığın öz yaradıcılığında və el sənətkarlarımızın əsərlərində də bu dini rəvayələrin təsvir və tərənnümünə rast gəlirik:

*Sən ki, vurdun Zülfüqarı, bəhr içində böldü çəng,*
*Əxbərannan Xavərəndə doqquz ildə oldu cəng;*
*Divə etdin bir işarə, nəhsi oldu bəndi-təng;*
*Fəth qıldın səlasəli, sailə oldun dirəng;*
*Bəxş elədin həm qatarı, keçdin Qənbərdən, Ağa!*
*[3, s.120].*
*(Novrəs İman)*

***

*...Neçə min il doğulmazdan irəli,*
*Ağ divin bəndini çatdığın deyim [15, s.36].*
*(Göyçəli Aşıq Nəcəf)*

***

*İfritin bəndini açdın üç yüz ildən sonra sən,*
*Dəşti-Ərjəndə keçən Kərrar sənsən, ya Əli [32, s.252].*
*(Ş.İ.Xətai)*

***

*Xurma lifəsiynən barmağın çatan,*
*Ağ divi zindana salan, ya Əli! [6, s.142].*
*(Aşıq Ələsgər)*

***

*Zülfüqar da daşdan çıxıb gəldi Şahi-Mərdana,*
*Dinsizləri dinə gətdi, baş əydirdi Qurana.*
*Ağ divin bəndini çatdı, illəri verdi sana,*
*Tifil vaxtı azam etdi, o getdi hər yana, gəl [30, s.184].*
*(Qəmgin Fəzi)*

Bəndin "Gərran kimi şir donunda merac yolunda yatan" misrası daha dərin mənalı mətləblərdən xəbər verir. Novrəs bu misrasında bu misrasında Merac əhvalatı ilə bağlı dini rəvayətlərdəki bir məqama istinad edir. Rəvayətdə deyilir ki, Rəsulullah (s) Allahın əmri ilə Məkkədən Qüdsə gəlir və oradan "Büraq" adlı bir məxluqla Meraca qalxır ("Büraq" haqqında Qurani-Kərimdə müfəssəl olaraq heç bir məlumat yoxdur, yalnız onun adı çəkilir. Şəriət təfsirlərində isə "Büraq" başı adam, bədəni ata bənzər bir heyvan olaraq göstərilir). Əziz peyğəmbərimiz Məhəmməd əl-Mustafa (s) Meraca gedərkən yatıb yolu kəsmiş bir aslanla rastlaşdı. O an "əmim oğlu Əli (ə) indi burada olsaydı, bunun öhdəsindən gələrdi" – deyə düşündü. Bu vaxt səs eşitdi: "Üzüyünü aslana ver". Peyğəmbər (s) üzüyünü çıxardı və aslanın ixtiyarına verdi və aslan sakitləşdi. Rəvayətin sonunda aydın olur ki, Peyğəmbər (s) Meracdan qayıdarkən Qumbədil-Xəzrada (Yaşıl Gümbəz) Qırxlar Məclisinə varid olur və həmin üzüyü Həzrəti-Əlinin (ə) barmağında görür və Həzrəti-Əlinin (ə) hansı yüksək məqamda olduğunu məclis əhlinə çatdırır. Bu rəvayətlə bağlı bədii parçalara həm Dədə Ələsgərin, həm də başqa şairlərimizin yaradıcılığında da rast gəlirik:

*Can fəda qıldım yolunda, Ya Əmir əl möminan!*
*Tutdun Rəsulun irahın, Xatəmin aldın nişan.*
*Yunisə munis olub, Nuha oldun gəştiban;*
*Xızrla irfana girdin, Sirrini etdin nihan;*
*Nuri-pakın zülmətin Götürdün yerdən, Ağa! [6, s.190].*
*(Aşıq Ələsgər)*

***

*Qırxlar cəminə vardı əzizi Peyğəmbər,*
*Gördü vurulub qırxına da bir neştər.*
*Pişvaza çıxan cümlə məlaik hazır,*
*Naz ilə gəlir şahım Əliylə Qənbər! [33, s.30].*
*(Fəxrəddin Salim)*

***

*Mustafa gördü səni, aslan sifətli bir mələk,*
*Sahibi-Merac, həm taci-livasan, ya Əli [32, s.251].*
*(Ş.İ.Xətai)*

Peyğəmbər (s) Sidrətül-Müntəhaya çatdı. Dost dosta qovuşdu. Doxsan min kəlam deyildi, otuz mini şəriət, otuz mini təriqət, otuz mini isə həqiqət haqqında.

*Çıxdı meraca Muhəmməd, qıldı doğsan min kəlam,*
*Sirri-Həqq, həm məhrəmi-əsrar sənsən, ya Əli.*
*Bu Xətai xəstənin, sənsən muradı, məqsədi,*
*Xanda baxsam görünən didar sənsən, ya Əli*
*[32, s.252].*

Haqq aşiqi Dirili Qurbani bu deyilənləri aləmi-röyada görmüş və bir ustadnaməsində təsdiq etmişdir:

*Oyanıb qəflətdən, açdım gözümü,*
*Ərənlər payinə sürtdüm üzümü,*
*Dindirdilər, haqq söylədim sözümü,*
*Doxsan min kəlməyə bəyan dedilər [14, s.70].*
*(Qurbani)*

Bəndin son ("Qeyrət ilə qul adına özün Bərbərdə satan, Şəninizə nə deyilsə, yoxdu böhtan, ya Əli!") misralarında məmduhun daha bir epiteti poetik qavrayışa təqdim olunur. Bu, Şahi-Qəşəmşəm ifadəsində əksini tapmışdır. Bu ifadənin anlamı təxmini şəkildə olsa da aşağıdakı rəvayətdən anlaşıla bilər:

"Qəşəmşəm" dastanı yaxud Bərbər əhlinin İslamı qəbul etməsi rəvayətində görürük ki, Peyğəmbərin (s) zamanında Mədinə şəhərində çox yoxsul birisi məscidə daxil olub Həzrəti-Məhəmmədlə (s), Həzrəti-Əlinin (ə) qarşısında dayanır. Həmin sail deyir ki, Ya Peyğəmbər (s) mənim ailəm böyük, borcum isə çoxdur, Sizin köməyinizə ehtiyacım var. Peyğəmbər (s) iki dəfə məscid əhlinə müraciət edir ki, bu sailə kömək etmək lazımdır. Heç kəsdən səs çıxmır, hamı başını aşağı salıb sükut edir. Çünki, bu yoxsulun borcu həqiqətən çox böyük idi.

Həzrəti-Əli (ə) deyir: "Mən bu yoxsula bir şərtlə kömək edərəm, gərək mən nə deyirəm onu etsin. Sonra da yoxsulu götürüb həyətə çıxır, ona əmr edir ki, gözünü yumsun. Borclu gözlərini yumur. Gözünü açanda görür ki, bura bir ayrı dünyadı. Tanımadığı bir vilayətdə bir dərənin kənarındadır. Dərə su ilə doludur, suyun üzü də köpük bağlayıb.

Həzrəti-Əli (ə) yoxsula bir ülgüc verib deyir ki, başımı təmiz qırx, adımı da Qəşəmşəm çağır və bu vilayətin bazarında əntiq mallar satılan yerdə məni sat. Aldığın pul ilə get, borclarını ödə”.

Yoxsul heyrətə gəlir, onun dediyinə cürət etmir, bilirdi ki, Əli (ə) Peyğəmbərin (s) əzizidir. Digər tərəfdən də qorxur, söz verib ki, hər nə desə edəcək. Əlinin (ə) başını qırxıb Qəşəmşəm adı ilə satışa çıxarır. Yolda Əli (ə) ona tapşırır ki, tez satılsın deyə hamıya de ki, bu elə mahir bir quldur ki, ən çarəsiz müşkülləri həll edə bilir, özü ağırlığında qızıla satıram…

Bu iddianı eşidənlər təəccüblənirlər. Xəbər sürətlə gedib vilayətin şahının qulağına çatır. Şah tələb edir ki, hər ikisini saraya gətirsinlər. Qula baxıb şah sailə deyir ki, üç şərtlə bu qulamı alıram. Şərtlərimi yerinə yetirsə işim yoxdur, yox, bacarmasa, həm sənin, həm qulamın boynu vurulacaq.

Bunu eşidən sail əsməyə başladı, dili tutuldu. Qəşəmşəm irəli keçib buyurdu ki, şərtləri de. Şahi-Bərbər dedi: birinci şərtim budur ki, dərya kənarındakı bəndi bağlayasan, ikinci əjdahanı öldürəsən, üçüncü Əlini (ə) öldürüb başını, ya da qolubağlı özünü mənə gətirəsən.

Şahi-Qəşəmşəm bu üç şərti qəbul elədi. Şahi-Bərbər Qəşəmşəmin ağırlığında qızıl verdi. Qəşəmşəm onları alıb hamısını sailə verdi. Bildirdi ki, bu gün bu üç şərt yerinə yetiriləcək. Şah qəhqəhə ilə güldü, dedi ki, belə bir iş mümkün deyil. Amma, sonra Şahi-Bərbər Qəşəmşəmin ciddiyyəti və təmkinindən çəkindi.

Həmin vilayətin yaxınlığında bir cəngəllik var idi. O cəngəlliyin içi vəhşi heyvanlarla dolu idi. Bu səbəbdən heç kim o meşəyə tərəf getmirdi. Şah vəziri çağırıb dedi ki,

Qəşəmşəmi göndər ora odun gətirsin. Bunu bir yoxlayaq. Vəzir Qəşəmşəmə deyir:

– Oduna ehtiyacımız var. Get, o meşədən odun gətir.

Qəşəmşəm balta götürüb meşəyə getdi. Meşənin heyvanları onu görüb cəm oldular və ehtiramla baş əydilər. Qəşəmşəm onların köməyi ilə odun yığdı və odunu fillərə yüklədi. Böyük bir şirə minib ilanı əlində qamçı edən Qəşəmşəm yol aldı şəhərə tərəf.

Şəhər əhli bunu görüb şaha xəbərə qaçdılar. Dedilər ki, bəs bütün meşənin heyvanatı bura gəlir. Şah vəzirdən xəbər aldı: – Bu nə işdi?

Vəzir deyir ki, yəqin Qəşəmşəmin işidir.

Şah deyir ki, qaç ona de ki, oduna ehtiyacımız yoxdu, qaytar qoy yerinə.

Vəzir Şahi-Qəşəmşəmin yanına gedib şahın əmrini ona çatdırır. Qəşəmşəm heyvanlara göstəriş verir ki, gətirdikləri odunla bərabər meşəyə qayıtsınlar. Heyvanlar Şahi-Qəşəmşəmin əmrilə meşəyə qayıdırlar.

Hər şeyi yerinə qoyandan sonra Qəşəmşəm şahın hüzuruna gəlir. Şah özü bacarıqlı döyüşçü idi. Lakin, Qəşəmşəmin zəhmindən vahiməyə düşür. O özü bu üç işin öhdəsindən gələ bilməmişdi.

Şah heç bir qüvvə ilə bu günə qədər dəryanın bəndini bağlaya bilməmişdi. Nə qədər çalışırdı yenə bir yerdən sel gəlib şəhəri dağıdırdı. Bundan şəhər əhli də, şah da cana gəlmişdi. Elə bir gün olmurdu ki, bu sel şəhərə ziyan vurmasın və əhali şaha şikayət etməsin. Şah dərəni Qəşəmşəmə göstərib dedi ki, buna bir əncam çəkə bilərsən?

Qəşəmşəm baxıb əhaliyə deyir ki, siz gedin evə, bunu mən həll edərəm. İnsanlar mat qalır, deyirlər ki, biz min-

lərlə insan ona əlac edə bilməmişik, sən təkcə nə edə bilərsən?

Sonra əhali həm yorulduğundan, həm də Qəşəmşəmin əmri ilə oradan dağılıb evlərinə gedilər. Qəşəmşəm bir nərə ilə Zülfüqarı çəkib yaxınlıqdakı dağın başına endirdi. Dağ ikiyə bölünüb, bir hissəsi dərənin ağzını bağladı, digər hissəsi dəryaya düşdü. Qəşəmşəm barmaqlarının işarəsi ilə o bənddən beş axar açdı. Həmin sular ətrafdakı dəyirmanlara yönəldi. Qalan suyu isə əhalinin istifadəsinə buraxdı. Orada elə bir sədd yarandı ki, ona baxanda insan Allahın əzəmətinə heyrət edir. Bu günə qədər də bu sədd beləcə dəryanı ram edən bir vəziyyətdədir.

Bunu bilən şəhər əhli şad oldu, şah ona "əhsən" dedi və ikinci şərtə-əjdahanı məhv etmək şərtinə əməl etməyi əmr etdi.

Bu əjdaha şəhəri zaman-zaman viran edirdi. İstədiyi canlını yeyir, ağzından od püskürüb şəhəri oda qalayırdı. Qəşəmşəm "baş üstə" deyib işə başladı. Onun bura gəlməsindən dörd məqsədi var idi. Dəryanı ram etmək, əjdahanın zülmündən əhalini azad etmək, yoxsula kömək etmək və oranın əhalisini müsəlman etmək.

Dərya ram ediləndə əjdaha səsə ayılıb Qəşəmşəmə tərəf gəldi. Hələ də yarısı qarın içində olan əjdaha Qəşəmşəmin zəhmindən vahiməyə düşsə də çarəsiz ona hücum etdi. Qəşəmşəm Zülfüqara əmr etdi. Zülfüqarı zərblə əjdahanın başına elə vurdu ki, onu ikiyə böldü. Əjdahanın qarnından balası düşdü və o da anasının qalıqları ilə birlikdə yerə dəyib daşa döndü.

Qəşəmşəm əjdahanı öldürəndən sonra hələ üst-başı toz içində ikən şah ondan üçüncü şərtə əməl etməyi tələb etdi. Həzrəti-Əlinin (ə) ya başını, ya qolubağlı özünü gətirmə-

lisən. Qəşəmşəm əmr edir ki, çoxlu zəncir və rismanlar çağırın, Həzrəti-Əlini (ə) qolubağlı xidmətinə gətirim.

Əmrini yerinə yetirdilər. Qəşəmşəm dedi: "Həzrəti-Əli mən özüməm". Bu sözü eşidib şah qəhqəhə ilə güldü. Dedi: "Səni göydə axtarırdım, yerdə əlimə düşmüsən". Şah əmr etdi Həzrəti-Əlinin (ə) qollarını və ayaqlarını zəncirlə möhkəm bağladılar. Həzrəti (ə) tərpənməz bir hala saldılar.

Şah çox xoşbəxt bir halda dedi ki, ey Əli, səni o dəryadan da, o əjdahadan da təhlükəli bilmişəm. Bamiyanın Allahı mənə kömək oldu ki, səni öz ayağınla mənim ayağıma gətirdi. Sən bizə çox kömək etmisən. Odur ki, sənə seçim haqqı verirəm, nə cür ölmək istəyirsən, səni o cür öldürüm. Savaş meydanında rastıma çıxsaydın bunu edə bilməyəcəkdim. De görüm, başını vursunlar, yoxsa dağdan atsınlar…

Həzrəti-Əli (ə) buyurdu: "Mən sənə iki yol təklif edirəm: Sən seç, ya başını Zülfüqarla vurum, ya da islamı qəbul et".

Şah bu təklifi eşidib qıp-qırmızı oldu. Cəlladı çağırıb qışqırdı: "Sən mənim hüzurumda mənə şərt kəsirsən?".

– Cəllad, başını vur peyğəmbərin hüzuruna göndər, bədənini dəryaya at, balıqlar yesin.

Həzrəti-Əli (ə) bir təkanla zəncirləri parça-parça edib yerə tökdü. Şahi-Bərbərin kəmərindən yapışıb əmr elədi: "Seçimini et!" Şah dedi: "Müsəlman olmuram". Həzrəti-Əli (ə) onu elə vurdu ki, göyün yeddinci qatına qalxdı. Orada mələklərin səsini eşidib vahiməyə düşdü. Dedi: "Bir dil nədi, min dilim olsa hamısı ilə "La ilahə illəllah, Muhəmmədun Rəsulullah, Əmirəlmöminin Əliyyən vəliyulluh" – deyərəm. Şahi Qəşəmşəm – yəni Həzrəti-Əli (ə) onu yed-

dinci qatdan endirib yerə qoydu. Şah da, Bamiyan əhli də islamı qəbul edib müsəlman oldular [13, s.238–242].

Biz bu motivlərlə aşıq ədəbiyyatının görkəmli nümayəndələrindən olan Göyçəli Aşıq Nəcəf Xəlil oğlunun və əslən Borçalı mahalından olan Aşıq Xındı Məmməd yaradıcılıqlarında da rastlaşırıq:

*İbrahim Xəlili saxladı narda,*
*Yunisi mahidə İsanı darda.*
*Kafərlər içində şəhri-Bərbərdə,*
*Özün qul adına satdığın deyim.*

*Dərs aldı Cəbrail, yanmadı pəri,*
*Günü günortadan qaytardı geri.*
*Neçə min il doğulmazdan irəli,*
*Ağ divin bəndini çatdığın deyim [15, s.37].*

***

*Qaldırıb Xeybəri yerindən atan,*
*Tifilkən Ağ Divin bəndini çatan,*
*Özünü qul deyib Bərbərdə satan,*
*Sən Əliyi-Murtəzanı neylədin? [21, s.30].*

Divaninin dördüncü bəndində aşıq qəhrəmanı daha çox tarixi planda vəsf edir: Belə ki, dastanlarımızda da geniş yer tutan Həzrəti-Əlinin (ə) darda qalanların dadına yetişməsi, Peyğəmbərin (s) gətirdiyi nəzəri müddəaları canıqanı bahasına var gücü ilə həyata keçirməsi, İbrahim peyğəmbəri oddan xilas etməsi və onun yandırılmaq üçün atıldığı tonqalı gözəl bir çəmənliyə çevirməsi bu sıradandır.

*Nə ki, darda qalan olsa,*
*Səndən gözləyər nicat.*
*Məhəmmədin dinin açan,*
*Sərvəri cəm kainat,*
*Xəlilullah od içində*
*Səndən istədi imdad;*
*Möcüzəndən ataş oldu,*
*Şux gülüstan, ya Əli! [3, s.147].*

Bu bilgilərin bəzi islami əsaslarına nəzər salaq: Belə ki, qədim və zəngin aşıq ədəbiyyatının mistika ilə bağlılığı danılmazdır. Bilavasitə Azərbaycanla bağlı aşıqların – Dirili Aşıq Qurbaninin, Aşıq Abbas Tufarqanlının, Xəstə Qasım Tikmədaşlının bizə gəlib çatmış irsi bu bağlılığın möhkəm olduğundan soraq verir: "Qurbani dastanı"nda qəhrəman mənəvi-ruhi qəflətdə və cismani-fiziki əzab içərisinədir. O, "eşq yuxusu"na gedir və yuxusuna ərənlər gəlir və ona abikövsər içirib qəflətdən oyadıb həqiqəti anladırlar. Qəhrəmana buta verən, onun qəlbini eşq, həqiqət və mərifət nuru ilə işıqlandıran bu "ərən" isə "damade Əhmədi-Mürsəl", yəni peyğəmbərin kürəkənidir" [34, s.209; 35, s.375]. Müəllifin məqalədə vermədiyi aşağıdakı Qurbani bəndləri də coşqun bir bulaq kimi bunu göstərir:

*Oturmuşdum Təktüklünün başında,*
*Ocaq qırağında, pirin tuşunda.*
*Mənə badə verdilər Səfər ayının beşində,*
*Aldım nuş eylədim, dedim "bəli"di.*

*Şair idim, şairliyimi bilmirdim,*
*Ağlayırdım, göz yaşımı silmirdim.*

*İndiyədək ustadımı bilmirdim,*
*İndi bildim Şahi-Mərdan Əlidi [14, s.146].*

***

*Mənə buta verib Həzrəti-Əli,*
*Nə buyurubsa da demişəm, – "bəli".*
*Qurbaninin fkri-zikri, xəyali.*
*Axırı mətləbim Pəri xandadır.*[1]

***

*Yatmışdım üstümə gəldi ərənlər,*
*Səfil, nə yatmısan, oyan, dedilər.*
*Oyandım, qəflətdən açdım gözümü,*
*Al, abi-kövsərdən iç, qan dedilər.*

*Oyandım qəflətdən açdım gözümü,*
*Ərənlər payinə sürtdüm üzümü.*
*Dindirdilər, haqq söylədim sözümü,*
*Doxsan min kəlməmə bəyan dedilər.*

*Qurbani, batıbsan qəm dəryasına,*
*Ovçunun məskəni dağ arasına.*
*Bir seygəl versənə könül pasına,*
*Aşiqi məşuqa qurban dedilər [14, s.237].*

"Abbas və Gülgəz" dastanında dara düşən qəhrəmanın dadına Həzrəti-Əli(ə) yetişir. Belə ki, "Abbas və Gülgəz"də Əli (ə) bir kult olmaqla yanaşı, bütün dastan boyu lazımı məqamlarda qaibanə şəkildə iştirak edən hami-obrazdır.

[1] Gəncədən toplanmış variant

Süjetin bütün dinamikası və hadisələrin gedişi onun yardımı ilə mümkün olur. Başqa sözlə, süjetin düyün nöqtəsindən finalına qədər bütöv sistemində Əli (ə) ruhani epik surət kimi aparıcı mövqeyə malikdir. Budur, dastanın qəhrəmanı Abbas bağda yatır və yuxuda Mövlası ona eşq butası verir. Abbas ayılarkən Mövlasının kim olduğunu və onun verdiyi sevgi butasını poetik vəcdlə bəyan edir [34, s.264].

Sonra Abbas iki dəfə quyuya salınır. Birinci dəfə Becan onu su, ikinci dəfə isə Şah Abbas onu zəhər quyusuna saldırır.

Hər iki dəfə Həzrəti-Əli (ə) "eşq badəsi" içirdiyi qəhrəmanın imdadına yetişir və onu dardan qurtarır. Özü isə qaibanə şəkildə yox olur: Birinci dəfə:

*İstərəm Şiri-Xudanı,*
*Ağamı, Şahi-Mərdanı,*
*Mən Abbası-binəvanı*
*Ağlar qoyan hara getdi?*

– deyə "ağası"nın arxasınca, onu görməyin sevinc qayğısı ilə ağlayan qəhrəman ikinci dəfə quyuya düşərkən eyni iztirabla:

*"Sən yet dada, ay ağa, haray!"*

– nidası ilə onu haraya çağırır [34, s.146].

Beləliklə, qəhrəmana buta-eşq işığı verən Həzrəti-Əli (ə) ona vüsal və xoşbəxtliyə qovuşma məqamına qədər yardımçı olur. Əsində həm də səadət ətaedicisi kimi diqqəti cəlb edir.

*Könlüm istər o Allahı,*
*Dilim Mövla deyə-deyə.*
*İkinci də surullahı,*
*Dilim Mövla deyə-deyə.*

*Zülfüqarı çaldı daşa,*
*Bir cüt ulaq çıxdı qoşa.*
*Əjdahanı başdan-başa,*
*Böldü Mövla deyə-deyə.*

*Dinlə Abbasın səsini,*
*Tökər könüllər pasını.*
*O Xeybərin qalasını*
*Aldı Mövla deyə-deyə.*

"Xəstə Qasım" dastanında daha maraqlı və cazibədar bir seçim – situasiyanın şahidi oluruq. Adi bir çoban olan, sayılıb seçilməyən Xəstə Qasım qoyun otararkən qəbristanlıqda yatır. Yuxuda ona alimlik istedadı və şairlik təbi verilir. Alimlər, qazilər, ruhanilər qarşısında elm və sənət imtahanı verən və bu imtahandan qalib çıxan müctəhid (dastanda müşseyid yazılıb) məclisə layiq ən gözəl söz söyləməyi xahiş edir. Məclisə və insanlığa layiq ən gözəl söz nə ola bilər? Xəstə Qasımın nəzərincə, Həzrəti-Əlinin (ə) şəninə söylənmiş vəsfdən gözəl söz yoxdur. Ona görə də o, öz poetik inamını belə ifadə edir:

*Ərşi-zəmin, lövhi-qələm yox ikən,*
*Varlığa hamıdan tez gələn Əli.*
*Ustadlar ustası özün olubsan,*
*Cəbrail məqamın düz bilən Əli.*

*Sənin hörmətinə quruldu varlıq,*
*Həyatın Zəmzəmi, o suyi-dirlik,*
*Səndə nəqş olundu elm və birlik,*
*Cəmi dillər ilə söz bilən Əli.*

*Xəstə Qasım zərbi-danəndən Əli,*
*Aləmi-zərridə demişəm "bəli",*
*Bir ismin Əlidi, bir ismin Vəli,*
*Cəmi pünhan dərdi tez bilən Əli" [34, s.376].*

Göründüyü kimi aşıq yaradıcılğıında Həzrəti-Əli (ə) ilə bağlı əsərlərin mühüm bir qismini lirik növünü müxtəlif aşıq şeiri janrlarında yazılmış bədii nümunələr təşkil edir.

Mistik meyillər Aşıq Ələsgər irsindən də yan keçməmişdir: "Aşıq Ələsgərə haqq tərəfindən vergi bəxş edildiyinə dair bir çox aşıqlar, o cümlədən də onun şəyirdləri əfsanəvi bir rəvayət söyləyirlər. Rəvayətdə deyildiyinə görə, Ələsgər bir gün dərin yuxuya getmiş, yuxuda Həzrət-Əli (ə) ona bələdçilik edərək o dünyanı gəzdirmiş, cənnətin gözəlliklərin göstərmiş, cənnət bağından aşığa bir alma vermiş və hər zaman ona dayaq duracağını bildirmişdir. Ələsgər oyanandan sonra yuxuda gördüklərini ətrafına toplaşan adamlara "Qabaqda" rədifli qoşması ilə söyləmişdir. Şeir bütünlüklə cənnət həyatının təsviri üzərində qurulmuşdur:

*Şəhrin şöləsindən buldum bələdi,*
*Xoş gəldi xoşuma halı qabaqda.*
*Pir mana göstərdi şah məqamını,*
*Gördüm cəmdi çox cəlalı qabaqda.*

*Neçə taxt qurulub nuri-münəvvər;*
*Neçəsi zəbərcəd, neçəsi gövhər.*
*Sağda, solda səf-səf yerir mələklər,*
*"Yahu-yahu" deyir qulu qabaqda.*

*"Ya hu!" – deyib, bir-birinə uydular,*
*"Ya mən hu!" – deyəndə təam qoydular.*
*Cümlə məxluq yemədilər, doydular,*
*Qaldı məcməyilər dolu qabaqda.*

*Neçə sirri gördüm, sirr qaldım aşkar;*
*Səxavət əhlini yandırmadı nar,*
*Salavatnan işlər hər dükan-bazar,*
*Zay oldu dünyanın malı qabaqda.*

*Dünyada əl çəkmə sövmü salatdan,*
*Təmiz ver, qalmasın xümsü zəkatdan.*
*Ələsgər, xof etmə puli-Siratdan,*
*İrəhbərdi cənab Əli qabaqda [6, s.101].*

Aşıq Ələsgər haqqında danışılan bu rəvayətdə bəlkə bir həqiqət də var. Ondan əvvəl yaşamış Qurbani, Abbas Tufarqanlı və bir çox başqaları barədə də belə rəvayətlər söylənməkdədir. Belə söyləmələr onların adı ilə bağlı yaranan dastanların əsasını təşkil edir.

Bunların da əksəriyyətinə yuxuda fitri istedad verilir. Qurbani yer şumlamağa getdiyi bir gün zağada yatmış, atası onu yuxulu vəziyyətdə evə gətirmiş, üç gündən sonra ayılanda ağasının ona badə verdiyini söyləmişdir.

Bağda yuxuya gedən Abbas oyananda təbrizli Batman Qılınc Məmmədxanın bacısı Pəri xanımın ona buta verildiyini və ağasının əlindən badə içdiyini bildirmişdir. Xalq dastanlarında belə misallar çoxdur.

Aşıq Ələsgərdən yaşca kiçik olan Çıldırlı Aşıq Şenlik (1850–1913) haqqında da belə bir əfsanəvi rəvayət mövcuddur. Hasan adlı 14 yaşlı bu oğlan ördək ovunda olarkən yuxulayaraq bir başqa aləmə düşmüş, ağası ona badə içirmiş, ayılanda "Şenlik" təxəllüsü ilə şeirlər söyləməyə başlamışdır... [36, s.33–35; 13, s.255–260].

Aşıq Ələsgərin qardaşı oğlu olan Novrəs İman da daim öz dadına müşkülləri həll edən Həzrəti-Əlidən (ə) imdad diləyir:

*Saxla Əli deyənləri,*
*Ahu-zardan, ya Əli!*
*Çıxart qəmli könülləri,*
*İntizardan, ya Əli!*
*Kim ki, sənə şəkk eylədi,*
*Özü düşdü azara;*
*Kim sənə pənah gətirdi,*
*Çıxdı dardan, ya Əli!*

*Tək getdin zülmət içinə,*
*Cinnlər davasına,*
*Bir dəfəlik zərbə vurdun,*
*Xeybərin qalasına.*
*Yığdılar dünya yükünü*
*Qarının torbasına;*
*Qaldırdın "əhsən" dedilər*
*Hər bir yerdən, ya Əli!*

*Özün saxla pənahında,*
*Dolandır bizləri sən.*
*Yer üzündə müsəmanın*
*Ən şirin sözləri sən.*
*Yazıq bu Novrəs İmanın,*
*Dilinin əzbəri sən.*
*Darda qalıb yetmiş dada,*
*Şahi-Mərdan, ya Əli! [3, s.145–146].*

Yaxud din tarixində “Leylətül-məbid” adlanan və “Bəqərə” surəsinin 207-ci ayəsində: “İnsanlarin eləsi də vardır ki, Allahın razılığını qazanmaq yolunda (Allah rizası üçün) öz canını fəda edər. Allah öz bəndələrinə qarşı çox mehribandır” (“Bəqərə”, 207) – işarə edildiyi kimi Peyğəmbər (s) hicrət edərkən Həzrəti-Əli (ə) onun yerində yatmış və ya şiəlikdə Həzrəti-Əlinin (ə) İbrahimi (ə) oddan xilas etməsi və onun yandırılmaq üçün atıldığı tonqalı gözəl bir çəmənliyə çevirməsi təsəvvürləri yayılmışdır.

“Bəqərə” surəsinin 207-ci ayəsinin Əli (ə) haqqında olması şübhəsizdir. Belə ki, Müsəlmanların Məkkədən Mədinəyə yavaş-yavaş hicrət etdiyi zaman yeni mərkəzə sahib olacaq müsəlmanların qüdrət tapacağından qorxan müşriklər Allahın Rəsuluna (s) qarşı sui-qəsd planı hazırlayır. Qərara gəlirlər ki, gecə vaxtı Həzrət Peyğəmbər (s) yuxuda olarkən hücum çəkib onu qətlə yetirsinlər. Bu zaman vəhy mələyi nazil olub müşriklərin bu qərarını Peyğəmbərə (s) xəbər verir və bildirir ki, o, Məkkəni tərk edib Mədinəyə getməlidir. Bu həssas məqamda Peyğəmbərin (s) Məkkədən təhlükəsiz çıxması üçün “iz itirmək” taktikasından istifadə edilməli idi. Allahın Rəsulu (s) Məkkəni tərk etdiyi

gecə fədakar və şücaətli bir şəxs onun yatağında yatmalı idi. Həmin şəxs isə Əli ibn Əbu Talib (ə) oldu. Allah Bəqərə surəsinin 207-ci ayəsində Həzrət Əlinin (ə) bu fədakarlığını "canını Allah yolunda fəda edən" ifadəsi ilə vəsf edir. Amma bu ayəni tam anlamaq üçün özündən öncə olan son üç ayəyə müraciət etmək lazımdır. Həmin üç ayədə Allah ilahi düşməni bu şəkildə xarakterizə edir: İnsanlardan bəzisi adamı valeh edəcək tərzdə danışır, öz hədəfinə yetişmək üçün Allahı şahid gətirir. Belə ki, öz məqsədinə çatmaq üçün Yaradanı körpü qərar verir. Yəni müqəddəs bildiklərinlə səni aldatmağa çalışır və dəyər bildiklərin vasitəsilə dəyərlərlə mübarizə aparır. Allahı şahid gətirib tövhidlə vuruşur. Çox mərhəmətli danışır, eyni zamanda çox qəddar düşməndir. Amma elə ki, qüdrət sahibi oldu şəxsiyyətləri, nəsilləri və ilahi dəyərləri məhv edər. Ayədə maraqlı məqam Allah sözü gedən düşmənin fəaliyytindən danışarkən "sə'ə" (سعى) felindən və "yucibukə qovluhu" (يُعْجِبُكَ قَوْلُهُ) ibarəsindən istifadə edir. Bu da onun çox hiyləgər, iradəli, gecə-gündüz ilahi və insani dəyərləri aradan aparmağa zərrə qədər süstlük etməyən bir şəxs olmasından xəbər verir. Bura qədər ayə insanı sanki məyus edir, ümidsizləşidirir. Amma Allah qəfil mövzunu dəyişir və "Mənim öz canından keçəcək qədər fədakar, cənnət sevgisi və cəhənnəm xofu üçün deyil, sırf Allah rizayəti üçün yaşayan bəndələrim də var" söyləyir. Bu cür şəxsiyyətlərin öndə gedəni və bariz nümunəsi Əlidir (ə). Ayədə sanki, Allah demək istəyir ki, bu növ xətərli batilə yalnız belə bir haqq qalib gələ bilər. Öz kefində yaşayan, yalnız özünü düşünən "haqq" isə bu cür düşmənin qarşısında aciz olar. Bəli, Quran məntiqinə görə Allah rizayəti üçün yaşamaq insana fədakarlıq ruhiyyəsi aşılayır və fədakarlıq belə bir

insanı fərdilikdən çıxarıb məktəbə çevirir. Quranda iki növ ayə var. Bir ayədə Allah mömin bir insanı ağaca bənzədir. ...كَشَجَرَةٍ طَيِّبَةٍ... (İbrahim surəsi, 24). Ağac oksigeni, kölgəsi, və meyvəsi ilə fayda verir, amma Allah digər ayədə bəzi insanları bağa bənzədir. ...كَمَثَلِ جَنَّةٍ بِرَبْوَةٍ... (Bəqərə surəsi, 266). Bağla ağacın fərqi var. Ağac fayda verir, bağ isə fayda verən ağaclar yetişdirir. Yolun əvvəlində ağac misalında ola bilərik, amma sonrakı mərhələ üçün bizdən tələb olunan bağ misalında olmaqdır. Hünər də elə budur. Bu dünyanı tərk et, məktəbin qiyamətə qədər yaşasın. Ağac misalında deyil, bağ misalında ol. Fərd deyil, məktəb ol. Həzrət Əli (ə) məhz bu şəxslərdəndir. Bu məktəbin məzunları isə həqiqi intizar əhlidir və məhz bu məktəbin nümayəndələri İmam Zamanın (ə.f) zühurunu gerçəkləşdirəcək insanlardır.

Ayənin sonunda Allah buyurur ki, (وَاللَّهُ رَءُوفٌ بِالْعِبَادِ) Mən rauf Allaham. Buna sübut, Mən sizə Əli (ə) kimi şəxsiyyətlər göndərmişəm.

Bilmək lazımdır ki, yer üzərində Allahın razılığı üçün yaşayan və fədakar insanlar Allahın ülfət və mehribanlığının ən bariz nümunəsidir (Hacı Ramil Bədəlovun “Fərd və məktəb” məqaləsindən).

***

Novrəs İman divanini məmduhunun kəramətlərini ümumiləşdirməklə bitirir: Odur ki, dördüncü və beşinci bəndlərdəki möcüzə sözünü mütləq kəramət kimi başa düşməliyik. Çünki, möcüzəni yalnız peyğəmbərlər göstərə bilər. İmam və övliyalardan görünən bu səpgili dini təzahürlər isə dini-islami terminologiyada kəramət kateqoriyasına aiddir:

*Ol Xudadan nüsrət oldu,*
*Sən yeridin göylərə;*
*Möcüzatın bəyan oldu,*
*Yetişdi Peyğəmbərə,*
*Novrəs İman dərdi dildə,*
*Yazar vəsfin dəftərə;*
*Zəlil qoyma məhşər günü,*
*Çoxdu üsyan, ya Əli! [3, s.147].*

Bəndin ilk iki misrasında Həzrəti-Əlinin (ə) də Allahın izni ilə göylərə çıxdığı bəlli bir dini-islami dəlil kimi önə çəkilir və o, merac baxımından az qala peyğəmbərlə bir tutulur ki, bu da Novrəs İmanın öyülənə öz sonsuz sevgi və sayğısını önə çəkərək tərənnüm etmək istəyindən doğmuşdur.

Bənddə diqqəti çəkən başlıca cəhət isə aşığın meracın timsalında imamı peyğəmbərlə bir tutmasıdır. Bu isə onun məmduha bəslədiyi sayqı və sevginin tükənməzliyini göstərir. Bunun islami özülü isə Həzrəti-Məhəmmədin (s) dilindən söylənilən “Allah peyğəmbərlərin hər birini ayrı bir ağacdan, mənimlə Əlini isə vahid bir ağacdan yaratdı”, “Əli məndəndir, mən də Əlidənəm”, “Mənim adımdan məndən və Əlidən başqa heç kəs danışa bilməz” – şəklindəki mötəbər hədislər durur [9, s.274].

Bəndin son iki misrasında isə aşıq Həzrəti-Əlinin (ə) şəninə nət yazmasını özü üçün ən şərəfli peşə sayır. “Dərdi-dil” (ürək dərdi), “yazmaq”, “dəftər” motivləri inkarolunmaz surətdə bunu sübuta yetirir. Eləcə də aşıq divaninin sonunda çox doğru olaraq öz günahkarlığını – “suçlu”luğunu

önə çəkir. Tanrı qatına, üzü qara bəndə kimi Allah hüzuruna getmək istəmədiyindən məmduhunun şəfaət səlahiyyətinə də güvəndiyini ərklə bildirməkdən çəkinmir. Axı şiə şəriətində peyğəmbərlərlə yanaşı imamların da şəfaət səlahiyyətinə malik olduğuna inanılır.

Bu deyilənlərdə də bircə divaninin belə Novrəs İmanın sonsuz Həzrəti-Əli (ə) sayğısı və sevgisi ilə alışıb yandığını, Əhli-beyt (ə) məhəbbətinin onun bütün varlığını çulğaladığını və bunun aşığın dünyagörüşünün özəyini təşkil etdiyini, beləliklə də bütün bu motivlərin bu nakam el şairinin yaradıcılığında geniş yer tutduğunu əyani şəkildə nümayiş etdirir.

**Ədəbiyyat:**


1. Qurani-Kərim. (Ərəb dilindən tərcümə edənlər: Z.M.Bünyadov, V.N.Məmmədəliyev). Bakı, 2005
2. Ayətullah-üzma Nasir Məkarim Şirazi. “Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı”. (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, “Nurlar”, 2017
3. Novrəs İman. “Seçilmiş əsərləri”. (toplayıb tərtib edəni: İslam Ələsgər). Bakı, “Səda”, 2004
4. “Nəhcül-Bəlağə” (toplayanı: Seyyid Rəzi; tərcümə və şərh, 2 cilddə). Bakı, 2017
5. Xəstə Qasım. Bakı, “Folklor İnstitutu”, 2010
6. Aşıq Ələsgər. Əsərləri, dastan-rəvayətlər, xatirələr. Bakı, “Şərq-Qərb”, 1999
7. Aşıq Ələsgər. “Gözüm bir alagöz xanıma düşdü”. Bakı, “Yazıçı”, 1993
8. Məhəmməd Füzuli. “Seçilmiş əsərləri”. Bakı, “Yazıçı”, 1984

9. Vərağa Almasov. "Həzrəti-Əli (ə) aşiqi Füzuli". Bakı, "Çaşıoğlu", 2010
10. Axund Hacı Soltan Hüseynqulu oğlu. "Gizli xəzinələrdən incilər". Bakı, "Tural-Ə" NPM, 2002
11. Hacı Həsən Hüseynov. "Həzrət Əli (ə) müxtəlif baxışlarda". Bakı, "Nərgiz", 2011
12. Hacı Ələmdar Mahir. "Füzuli qəzəllərinin şərhi". 3 cilddə. I cild, Bakı, "Elm və təhsil", 2012
13. Hacı Həsən Hüseyni. "Əhli-beyt (ə) aşiqi Dədə Ələsgər". Bakı, "İmza", 2022
14. Qurbani. Bakı, "Bakı Universiteti", 1990
15. Göyçəli Aşıq Nəcəf. (toplayıb tərtib edəni: İslam Ələsgər). Bakı, "Səda", 2000
16. Aşıq Talıb. "Könlüm Vətən arzular". Bakı, "Elm və təhsil", 2013
17. Araz Yaquboğlu. "Daşkənd aşıqları və şairləri". Bakı, "Nurlan", 2008
18. Şah İsmayıl Xətai. "Keçmə namərd körpüsündən". Bakı, "Yazıçı", 1988
19. S.Ə.Şirvani. "Seçilmiş əsərləri". 3 cilddə, I cild. Bakı, 1966
20. Aşıq Alı. "Nə qaldı". (toplayanı və tərtib edəni: İlham Qəhrəman). Bakı, "Qanun", 2020
21. Aşıq Xındı Məmməd. "Meydanda mərdi-mərdana". Bakı, "Borçalı", 2001
22. Nəbi Borçalı. "Sığındım Mövlaya". Bakı, "Çıraq", 2013
23. Nəsimi. "Seçilmiş əsərləri". Bakı, "Azərnəşr", 1973
24. Məhəmməd Füzuli. "Seçilmiş əsərləri". Bakı, 1999
25. Axund Hacı Soltan Hüseynqulu oğlu. "Həzrəti-Əli (ə) və dünya ədəbiyyatı". Bakı, "Tural-Ə" NPM, 2001
26. Seyid Əbülqasim Nəbati. "Əsərləri". Bakı, "Yazıçı", 1985
27. Miskin Abdal. Bakı, "Səda", 2001
28. Abbas Tufarqanlı. "72 şeir". (tərtib edəni: Araz Dadaşzadə). Bakı, "Gənclik", 1973

29. Aşıq Musa. "Əsərləri". (tərtib edəni: İslam Ələsgər). Bakı, "Elm və təhsil", 2013
30. Tərlan Göyçəli. "Göyçə aşıq məktəbi". Bakı, "Göytürk", 1998
31. Aşıq Şəmşir. "Öyüdlər". Bakı, "Ozan", 1996
32. Şah İsmail Səfəvi (Xətai) külliyyatı. Qəzəllər, qəsidələr, nəsihətnamə, dəhnamə, qoşmalar. (Tərtibatçısı: Mirzə Rəsul İsmailzadə). Bakı, Əlhuda, 2004
33. Fəxrəddin Salim. "Rübai divanı". Bakı, 2013
34. "Azərbaycan məhəbbət dastanları". Bakı, "Elm", 1979
35. Yaqub Babayev. "Azərbaycan aşıq yaradıcılığında Həzrəti-Əli (ə) obrazı". Bakı, 2001
36. İslam Ələsgər. "Haqq aşığı Ələsgər" (monoqrafiya). Bakı, "Maarif", 1999
37. Yusif Tavaslı. "Dualı namaz hocası". İstanbul, 1993
38. Həsən Xəyallı. "Axtar məni". Bakı, "Nurlan", 2006

*Bar ilahi min bir adın eşqinə,*
*Bu əziz axşama bağışla məni!*
*Dəşti-Kərbəlanın nahaq qanına,*
*Seyyid ələnama bağışla məni!*

*O şəxsə bağışla adı Hüseyndi,*
*Həbibin olmağı bərhəqq, yəqindi.*
*Əfv qıl Rəsula, sahibi-dindi,*
*On iki imama bağışla məni!*

*O yerdə qurulan qərib əsasa,*
*Zeynəbü Gülsüm qara libasa.*
*Ələmdari-Hüseyn, Rəşid Abbasa,*
*O qolsuz ağama bağışla məni!*

*Bağışla növcavan Əkbər yasına,*
*O tifl-südəmər Əsğər yaşına.*
*Şahzadə Qasımın sərvər yasına,*
*Verilən nizama bağışla məni!*

*...Biçarə İmanam, çoxdu üsyanım,*
*Qalmışam müşküldə əriyib canım.*
*Tövbə, bəd əməldən, qadir Sübhanım,*
*Gələcək cəzama bağışla məni!*

## NOVRƏS İMANIN "BAĞIŞLA MƏNİ" RƏDİFLİ TİLAVƏTİNDƏ KƏRBƏLA VAQİƏSİ

*Bismillahir-Rəhmanir-Rəhim!*
*Ya Allah ya Rəsul ya Əli səndən mədəd!*

Aşıq Ələsgər ocağının istedadlı nümayəndələrindən biri olan Novrəs İman da öz yaradıcılığında Kərbəla müsibətinə geniş yer ayırmışdır. Onun "Bağışla məni" rədifli tilavəti bunun ən bariz nümunəsidir. Belə ki, tilavətdə şair Əhli-beytdən (ə) olan bir çox şəxsiyyətlərin adını çəkərək onları tərənnüm edir:

*Bar ilahi min bir adın eşqinə,*
*Bu əziz axşama bağışla məni!*
*Dəşti-Kərbəlanın nahaq qanına,*
*Seyyid ələnama bağışla məni! [3, s.26].*

Çox güman şair axşam dedikdə "Şami-qəribani" nəzərdə tutur. "Qəriblərin axşamı" demək olan bu ifadə ilə Novrəs İman əslində xeymələrin talanması, yandırılması, Əhli-beyt (ə) uşaqlarının çarəsiz qalaraq çöllərə dağılması kimi son dərəcə böyük faciələrə işarə etmişdir.

Öz diyarlarından qərib düşmüşlərin gecəsi adlanan "Şami-qəriban" şəhid olmuş insanları sağ qalan yaxınları tərəfindən ahu-zar və nalə ilə yad olunmalarına deyilir. Həmin gecə Kərbəla əsirləri yandırılmış xeymələrdə şam yandırmışlar.

Şam yandırmağın bir neçə mənası ola bilər:

1) Xanım Zeynəbin (s.ə) gecə qaranlığında Peyğəmbərin (s) nəvələrini şam ilə axtarması;

2) Dərd və qəm əlaməti;
3) Sanki düşmənə bizi öldürə bilərsiniz, amma, Allahın nurunu səndürə bilməzsiz əmrini verməsi;
4) Təskinlik tapmaq əlaməti.

"Şami-qəriban" motivinə digər sənətkarlarımızın yaradıcılığında da rast gəlirik:

*Çəkildi Şamə qətari-Zeynəb,*
*Əsasi işrət olub mürəttəb.*
*Bu növ verdi Yezid fərman,*
*Geysin təmamən libasi-əlvan.*

*Şəmatət üçün o qövmü-əbtər,*
*Həna yaxıblar, ediblər zivər.*

*Çəkildi Şamə qətari-Zeynəb,*
*Əsasi işrət olub mürəttəb.*
*İmami-əsrin qolunda zəncir,*
*Misali-bərdə, zəlili dəstgir.*
*Özü əsirü cihazi-üryan,*
*Davasi nalə, rizası əfğan.*

*Çəkildi Şamə qətari-Zeynəb,*
*Əsasi işrət olub mürəttəb.*
*Deyərdi hər dəm o Şahi-ali,*
*Bizik Rəsuli-məcid əyali,*
*Vəli o qövmi-zəif millət,*
*Edib ədavət, qılıb şəmatət [22, s.388–390].*
*(M.İ.Asi. "Üsəra növhəsi")*

***

*Göz yaşımız qandı bu gün, ya Əli,*
*Şami-qəribandı bu gün, ya Əli!*

*Zülm ilə bağlandı Fərat yolları,*
*Soldurdu gülşəndə susuz gülləri*
*Oğlun Əbülfəzlin uzun qolları,*
*Fidayi-Qurandı bu gün, ya Əli!*

*Oğlun Hüseyn zülm ilə tarac olub,*
*Qızları bir məlhaca möhtac olub.*
*Hüzürlü baş nizədə merac olub,*
*Peykəri-üryandı bu gün, ya Əli!*

*Yoxdu ba şəmin cahanda bənzəri,*
*Qul veriməz məhdi-mələk mənzəri.*
*Xatiri-peyğəmbər öpər xəncəri,*
*Qan ilə əlvandı bu gün, ya Əli!*

*(La Ədri)*

Bənddə toxunulan ikinci əhəmiyyətli cəhət mənfur Yezid qoşununun Kərbəlada Əhli-beytin (ə) qanını nahaq yerə axıtmasıdır. Məlum məkana "Dəşti-Kərbəla" (Kərbəla çölü) deməsi Novrəs İmanın zəngin mərsiyə ədəbiyyatımıza dərindən bələd olduğunu sübuta yetirir. Ötəri deyildir ki, bu iki misra M.Füzulinin

*"Tökmək övladi-rəsulun qanini asan deyil,*
*Ol səbəbdən kim, bu qan hər qanə bənzər qan deyil"*

– beytini xatırladır.

İmam Hüseynlə (ə) bağlı "Sarəllah" (Allah qanı) şəklindəki şiəlik dəyərləndirməsi də bənddə öz əksini tapıb. Bənddə toxunulan üçüncü cəhət Əhli-beyt (ə) anlayışının seyyidlik tərəfidir.

Tarix boyu müsəlmanların seyyidlərə münasibəti yüksək olub. Bu hörmət seyyidlərin islam Peyğəmbəri (s) və imamların (ə) nəslindən olduqlarına inamla bağlıdır. Seyyidlərə həm fərdi, həm ictimai, həm də dövlət səviyyəsində müəyyən imtiyazlar verilmişdir. Ancaq onlara bu şəkidə hörmət göstərilməsi bəziləri tərəfindən etirazla qarşılanır. Həmin etirazların kökündə dayanan əsas məntiq budur ki, Allah qatında üstünlük yalnız təqva və yaxşı əməllərlə ölçülür: "Allah yanında ən hörmətliniz ən təqvalı olanınızdır" ("Hucarat", 13).

Bir insanın hansısa nəsildən olması nəyə görə onun üçün imtiyaz hesab olunmalıdır? Peyğəmbər (s) nəslindən olmayan bir adam seyyiddən daha üstün, imanlı, əxlaqlı, əməli saleh olarsa, şübhəsiz ki, Allah dərgahında məhz, o, daha hörmətli olur. Elə isə peyğəmbər (s) nəslindən olan birini həmin təqvalı və mömin insandan nəyə görə üstün hesab etməliyik? Bu imtiyaz Quran və ağıl məntiqinə uyğundurmu?

İzahlı lüğətlərdə "seyyid" sözünün "bəy", "nüfuzlu şəxs", "başçı", "malik" və s. bu kimi mənaları qeyd olunur. Bunlar "seyyid" sözünün kökünün mənasından qaynaqlanan törəmə mənalardır. Ərəb dilində "seyyid" sözünün kökü "sudud" – mənası isə şərəf və şərəfli olmaqdır. Sonralar bu söz "rəbb", "malik", "fəzilətli və həlim şəxs", "həyat yoldaşı", "tayfa başçısı", "mənsub olduğu xalqın əzab-əziyyətinə dözən", "öndər" və s. mənalarda işlənmişdir. Bu mə-

naların hamısı sözün kökünə aid olan "şərəf" mənasından qaynaqlanır. Bəzi hədislərdə islam peyğəmbərinin (s) özü haqqında danışarkən "seyyid" sözündən istifadə etdiyini görürük. Məsələn, hədislərdən birində İslam peyğəmbərinin (s) belə buyurduğu nəql olunur: "Mən insanların seyyidiyəm".[1]

Başqa bir hədisdə isə belə deyilir: "Mən qiyamət günü insanların seyyidi olacağam"[2] [12, s.193].

Peyğəmbərin (s) özünü seyyid kimi tanıtdırması yuxarıda qeyd etdiyimiz leksik mənaya əsaslanır. Şübhəsiz ki, islam peyğəmbərinin (s) Allah dərgahında ən üstün və fəzilətli şəxs olması onun ən şərəfli bəndə olduğunu göstərir. Allah dərgahında şərəf yalnız təqva ilə ölçüldüyü üçün bu təqdimat tam yerinə düşür. Çünki, Allah dərgahında peyğəmbər (s) qədər təqvalı olan ikinci bir şəxs yoxdur. Lakin, təəccüblü haldır ki, bəziləri bu məzmunu ifadə edən hədislərin doğru ola biləcəyini inkar edirlər. Ona görə bu cür sözlərdən istifadə etmək Quran məntiqinə və peyğəmbərin (s) təvazökarlığına ziddir.

Əgər peyğəmbərlər arasında fəzilət fərqi varsa, deməli, onlardan ən fəzilətli olanı Allah yanında ən üstün və şərəfli olanıdır. Bu da digərləri ilə müqayisədə həmin şəxsin seyyid, yəni ən şərəfli və fəzilətli olduğunu deməyə əsas verir. Quranın qeyd olunan ayəsinin bizə verdiyi mesaj məhz, budur. Deməli, insanların ən üstünü və şərəflisi olduğunu ifadə etmək üçün peyğəmbərin (s) özünü "seyyid" kimi təq-

---

[1] "Lisanül ərəb". c. 3. səh. 228

[2] Buxari, Ənbiya, 3; Müslüm, İman, səh. 367-369

dim etməsi Quranla nəinki ziddiyyət təşkil etmir, üstəlik, Quranın öz məntiqinə əsaslanır.

Həsən və Hüseynin (ə.m) Cənnət cavanlarının seyyidləri olacağını ifadə edən hədislərin mətni belədir: "Həsən və Hüseyn (ə.m) Cənnət cavanlarının seyyidləridir". Bu hədisin yer aldığı kitablar aşağıdakılardır.[1]

Mötəbər hesab edilən bir çox hədis kitablarında islam peyğəmbərinin (s) öz nəvəsi Həzrəti-Həsənin (ə) gələcəkdə başına gələcək bəzi hadisələrdən xəbər verdiyini ifadə edən hədislər yer almışdır. Həzrəti-Peyğəmbər (s) öz hədislərində, habelə, nəvələri Həsən və Hüseynin Cənnət cavanlarının seyyidləri olacağını da buyurmuşdur. Birinci mövzuya aid olan hədislərin birində belə deyilir: "Əbu Bəkr belə deyir: "Peyğəmbəri minbərdə gördüm, yanında Həsən də vardı. Peyğəmbər (s) Həsənə işarə edərək: "Bu oğlum seyyiddir, Allah onun vasitəsilə iki böyük dəstənin arasını düzəldəcək" – deyə buyurdu". Buxari bu hədisi dörd fərqli bölümdə qeyd etmişdir.[2] [12].

Səhihi Buxariyə şərh yazmış Bədruddin Əyni bu hədisi şərh edərkən yazır: "Bu öncədən xəbərvermə peyğəmbərin böyük möcüzələrindəndir. O, bu barədə öncədən xəbər vermiş və bu hadisə də onun xəbər verdiyi kimi olmuşdur".[3]

Şiə fiqhində seyyidlik heç də təkcə İmam Hüseynin (ə) nəslindən gələnlərə aid edilmir. Ümumiyyətlə, "seyyid" an-

---

[1] Əhməd ibn Hənbəl. "Müsnəd". cild 3. səh. 3, 62, 64, 72; cild 5. səh. 391, 392; "Sünəni ibn Macə". cild 1. səh. 44

[2] "Sülh" babı. cild III. səh. 170; "İslamda peyğəmbərliyin əlamətləri" babı. cild IV. səh. 184; "Mühacirlərin fəzilətləri" babı. cild IV. səh. 216; "Fitnələr" babı. cild VIII. səh. 99

[3] "Umdətul-Qari". cild XIII. səh. 282

layışı sonrakı dövrlərdə ortaya çıxmış terminlərdəndir. Şiə fiqhində bu terminin əvəzinə daha çox "Haşimilər" termindən istifadə olunur. "Haşimilər" termini peyğəmbərin (s) ulu babası Haşim ibn Əbdi-Mənafın adı ilə bağlıdır. Qureyş qəbiləsinin, habelə, Məkkə şəhərinin nüfuzlu şəxslərindən olan Haşim ibn Əbdi-Mənafın əsl adı Əmrdir. Məkkədə qıtlıq və aclıq zamanı camaata doğramac payladığı üçün "Haşim" ləqəbi almışdır. (Haşim "həşəmə" feilindən düzəlib mənası "bir şeyi kəsmək", "doğramaq", "parça-parça etmək"dir. Haşim qıtlıq vaxtı süd və ayrana çörək doğrayıb camaata payladığına görə bu ləqəbi almışdır). İlk dəfə Məkkədən yay və qış aylarında Yəmən və Suriyaya ticarət səfərləri təşkil etmiş şəxsdir. Şiə fiqhində "seyyid" deyildikdə Haşimin nəslinə mənsub olan insanlar nəzərdə tutulur. Şiə məzhəbinin təqlid mərcələri əməli risalələrində xümsün aid edildiyi şəxslərə və yerləri qeyd edərkən "seyyid" sözü əvəzinə "Haşim övladları" ifadəsindən istifadə edirlər. Məsələn, tanınmış təqlid mərcəyi Ayətullah Seyyid Xoyi "Minhac əl Salehin" adlı əsərində belə yazır: "Hazırkı zamanda – imamın qeybdə olduğu dövrdə xüms iki hissəyə bölünür: Bir hissəsi İmam Zamanın (ə.f) payıdır, digər hissəsi isə Haşim övladlarının".[1]

Ayətullah Seyyid Xoyi eyni kitabda 1261-ci məsələdə Bəni-Haşimin kimlər olduğunu belə izah edir: "Bəni-Haşim" deyildikdə ata tərəfdən Haşimə çatan şəxslər nəzərdə tutulur. Ana tərəfdən çatanlara isə xüms halal deyildir. Onlara zəkat halaldır. "Haşimi" – deyildikdə Əli, Əql və Abbasın nəsli arasında heç bir fərq yoxdur. Gördüyünüz

[1] A.S.Xoyi. "Minhac əl Salehin", "Xüms" bölümü, 1259-cu məsələ.

kimi şiə fiqhində "seyyid" deyildikdə təkcə İmam Hüseynin (ə) nəslindən olanlar nəzərdə tutulmur. Ola bilsin ki, bu iradı bildirən şəxs seyyidlik mövzusu ilə bağlı məlumatlarını "Google" axtarış portalından əldə edib. Çünki, "Google" portalının təqdim etdiyi bəzi türkdilli saytlarda da eyni səhvə yol verildiyini görürük.

İmam Hüseynin (ə) nəslindən olanlara "seyyid", İmam Həsənin (ə) nəslindən olanlara "şərif" deyilməsi sonrakı dövrlərdə meydana gəlmiş və heç bir dini əsası olmayan adlandırmadan başqa bir şey deyildir. Bəzən peyğəmbər (s) nəslindən olan şəxslərə "seyyidi-şərif" də deyilmişdir. İmam Həsənin nəslindən olanlara "şərif" deyilməsinin seyyidliyin İmam Hüseynin nəslindən olanlara aid edilməsi ilə heç bir əlaqəsi yoxdur. Bir qədər əvvəl də qeyd etdiyimiz kimi seyyidlik Haşim övladlarının hamısına aiddir. Təbii ki, bunların arasında İmam Həsən (ə) də yer alır. Şiə aləminin tanınmış təqlid mərcələrindən olan Həkim ailəsi, Brucerdi ailəsi, Sədr ailəsi, Təbatəbai ailəsi və s. bu kimi ailələr İmam Həsənin (ə) nəslindən olan tanınmış seyyid ailələrindəndir [12, s.19, 199, 206–208].

İslam dininin banisi Pəsuli-Əkrəm Həzrəti-Məhəmməd (Allahın salamı olsun Ona və pak Əhli-beytinə) seyyidlərə hörmət barədə belə buyurur: "Mənim nəslimdən olan yaxşı insanları Allaha xatir, pis insanları isə mənə xatir sevin. Hər kim mənim övladlarımı görərsə və onlara ehtiram əlaməti olaraq ayağa qalxmazsa, mənə zülm etmişdir. Hər kim mənim övladlarımı gördükdə mənə salavat göndərərsə Allah-təala onun görmə və eşitmə qüvvəsini artırar".

Peyğəmbərimizin (s) bu mübarək hədisini, seyidlərə olan dərin ehtiram və məhəbbətini Azərbaycanın dahi şairi,

qəbri müqəddəs Kərbəla torpağında, sevgisi qəlblərimizdə daim yaşayan, "Leyli-Məcnun" əsəri ilə bütün dünyada məşhur olan Məhəmməd Füzuli belə nəzmə çəkmişdir:

*Seyyidi-Əbtəhiyü Məkkiyü ümmiyyü zəki,*
*Haşimiyyü mədəniyyü qüreşiyyü ərəbi [13, s.420].*
*(M.Füzuli)*

Beyt bütövlükdə ərəb dilindədir. Azərbaycan dilində mənası belədir:

*(Həzrəti-Məhəmməd (s), ağadır, məkkəlidir, savadsızdır (yəni heç bir müəllimdən dərs almayıb), zirəkdir; Haşimilərdəndir, Qureyş qəbiləsindəndir, mədinəlidir və ərəbdir).*

***

*Seyidlər göz nuru taci-sərdirlər,*
*Ədəbdə onlara yoxdu bərabər.*
*Gərək düz yolundan çıxmasınlar heç,*
*Çünki, ümmətinə rahibərdilər.*

*Seyyid olmalıdır hər işdə yüksək,*
*Surətdə, sirətdə böyük cəddi tək.*
*Əməli pis olan hər nakəs adam,*
*Məhəmməd ümməti olmasın gərək [19, s.442].*
*(M.Füzuli)*

Tilavətin növbəti bəndində ustad aşıq yazır:

*O şəxsə bağışla adı Hüseyndi,*
*Həbibin olmağı bərhəqq, yəqindi,*
*Əfv qıl Rəsula, sahibi-dindi,*
*On iki imama bağışla məni! [3, s.26].*

Bəndin ilk beyti bütünlüklə İmam Hüseynə (ə) həsr edilib. Novrəs İmana ağasının elə əziz adı da bəsdir. Bunu onun İmam Hüseyni (ə) Allahın dostu adlandırmasından da görmək olar. Çünki, klassik ədəbiyyatda Peyğəmbərə (s) "Həbibullah" deyirlər. M.Füzuli və S.Əzim kimi məşhur şairlərin lirikasında belə nümunələr çoxdur. M.Füzuli "Hədiqətüs-sühəda"da "Qıl" rədifli rübaisində "Ovsafi həbibində dilim guya qıl" misrasında isə çox güman ki, peyğəmbərdən (s) daha çox İmam Hüseyni (ə) nəzərdə tutmuşdur. Bəndin üçüncü və dördüncü misralarında İmamətin Nübuvvətin davamı olması məsələsinə toxunulur.

Umumiyyətlə, peyğəmbərlərin (ə) gəlişindəki məqsəd, yaxud vücudunun zərurəti haqda deyilənlər Imamlara da aiddir.

Xacə Nəsirəddin Tusi "Təcridu-l-etiqad" kitabının "Nübuvvət" fəslində peyğəmbərlərin besətinin səbəbini açıqlayarkən 9 səbəb qeyd etmişdir. Biz burada onları qısaca nəzərdən keçirəcəyik ki, onların çoxu məsum imamlara da şamildir.

1. Əqli mərifətin nəqli yolla qüvvətləndirilməsi. Belə ki, insan əql qüvvəsilə bir çox nəzəri və əməli həqiqətləri dərk etsə də bəzən qəlbində şübhələr baş qadırır. Bu isə bir şeyə inam və imanın qarşısını alır. Amma, əqlin hökmləri ilahi və məsum rəhbərlərin bəyanı ilə təsdiq edildikdə bü-

tün maneələr aradan qalxır, insan qəbən rahatlıq tapır və hər hansı işə meyli artır.

2. Bəzən insan bir sıra işlərdən çəkinir və qorxur ki, onun əməli Allahın istəyinə əks olsun. İlahi rəhbərlərin icazəsi ilə bu qorxu aradan qalxır.

3. İnsanın bütün əməl və rəftarı "əql yaxşı-pisi dərk edir" ölçüsünə yerləşmir. Çox olar ki, əql bir işin yaxşı, yaxud pis olduğunu dərk etməsin. Yaxşını pisdən ayırd etmək üçün ilahi rəhbərlərə ehtiyac duyulur.

4. İnsan ilahi rəhbərlər olmadan yalnız öz düşüncəsi ilə xeyir-ziyanını dərk etməyə qabil deyildir.

5. İnsan ictimai bir varlıq olduğundan fərdlər bir-biri ilə həmkarlıq və bir-birinə kömək etmədən həyatın problemlərini həll etməyə qadir deyillər. Şübhəsiz, bütün əqdlərin hüquqlarını qoruyan, onları düzgün istiqamətləndirən qanunlar olmadan ictimai ədalət bərpa olunmayacaq, istənilən nəticə əldə edilməyəcək. Bu qanunları tam mənada düzgün ayırd və icra edə bilən kəs yalnız agah, pak, məsum ilahi rəhbərlər ola bilər.

6. İnsanlar kamilliyi dərk etmək, elm və maarifə yiyələnib fəzilətlər qazanmaq baxımından bir-birindən fərqlənirlər; bəziləri buna tam qadir, bəziləri isə acizdirlər. İlahi rəhbərlər birinci qrupa təkan verir, ikinci qrupa kömək edirlər ki, hər ikisi mümkün kamala çatsın.

7. Ümumiyyətlə, insan həyatı elm, sənət və digər sahələrlə sıx əlaqədardır. İlahi rəhbərlər isə onların inkişafında çox güclü mühərrikdirlər.

8. İnsanlar öz əxlaqi səciyyələri ilə bir-birindən fərqlənirlər. Onların düzgün təlim-tərbiyəsində pak və məsum kəslərə ehtiyac vardır.

9. İlahi rəhbərlər itaətlə bağlı savab və mükafat, günahla bağlı cəza və əzabdan tam agahdırlar. Onların əməllərin aqibəti ilə bağlı xəbərdarlıqları hər hansı vəzifənin düzgün yerinə yetirilməsində güclü amil sayılır.

İmamət məqamı nübuvvətin davamı olduğu üçün qeyd edilən səbəblərin çoxu məsumlara aiddir.

Qurani-Kərimdə bütün bunlar, hətta, onların ən üstün üç qismi ixtisarla verilmişdir: “təlim”, “tərbiyə” və “ədalətin icrası” [4, s.22–23].

Tilavətin sonrakı bəndində deyilir:

*O yerdə qurulan qərib əsasa,*
*Zeynəbü Gülsüm qara libasa,*
*Ələmdari-Hüseyn, Rəşid Abbasa,*
*O qolsuz ağama bağışla məni! [3, s.26].*

Üçüncü bəndin birinci misrası tam anlaşılmasa da bunun İmam Hüseyn (ə) dəstəsinin Kərbəlada xeymələr qurmasına işarə olduğunu düşünmək olar. Çünki, Aşuraya qədər Kərbəlada qurulan xeymələrdə həyat qaynamışdır. Xanım Zeynəb (s.ə), Xanım Ümmü Gülsüm (s.ə), Həzrəti-Abbasın (ə) adlarının çəkilməsi bunun sübutudur. Xanım Zeynəb (s.ə) və Xanım Ümmü Gülsüm (s.ə) Həzrəti-Əlinin (ə) Kərbəlada olan qız övladlarıdır. Onların, ələlxüsus da Xanım-Zeynəbin (s.ə) İmam Hüseyn (ə) qiyamının ictimaiyyətə çatdırılmasında çox böyük mövqeyi vardır. Ötəri deyildir ki, Xanım Zeynəbə (s.ə) Kərbəla qəhrəmanı deyirlər.

Bəşəriyyət insanlara mənəvi dəyərlər bəxş edən bir sülaləyə həmişə borcludur. Bu pak və nöqsansız Əhli-beyt

(ə) ailəsidir. O ailə ki, bütün kainat onların qarşısında baş əyib təzim edir, mələklər onlara səcdə etməkdən çəkinmir və vəhy mələyi Cəbrail (ə) Həzrəti-Əlinin (ə) məclislərinə girmək üçün izn istəyir. Bu, o ailədir ki, İlahi nemətlər təcəssümü, Allahın cəlal və cəmal sifətlərinin aynasıdır.

Onlar Peyğəmbər (s) və onun pak Əhli-beytidir (ə) ki, Allah-təala məxluqatın yaranma səbəbini onların varlığı ilə izah edib, buyurur: "Əzəmətli səma və geniş yerləri, işıqlı günəş, ay və ulduzları, axar dəniz və dəryaları siz Əhli-beyt (ə) üçün və sizin məktəbinizdən ötrü yaratmışdır".

Əhli-beyt (ə) hər cür eyb və nöqsandan uzaq olan beş müqəddəs nur, vəhy xanədanı və vilayət ailəsidir.

Allah-təala ***"Əhzab"*** surəsinin 33-cü ayəsində Əhli-beytin (ə) hər növ çirkinlikdən uzaq olduğunu bəyan edərək buyurur: "Allah siz Əhli-beytdən (Peyğəmbərin (s) ailəsindən) pisliyi uzaqlaşdırmaq və sizi pak-pakizə etmək istəyir".

Bəli, Yer üzündə bənzəri olmayan Əhli-beyt (ə) ailəsi. Belə bir ailədə bir qız uşağı dünyaya göz açır. Əzəmətli vilayət bağçasına mənsub olan bu çiçək, sonralar özünün Allah yolunda sədaqət və vəfası, şücaət və fədakarlığı, iman və təqvası, iffət və səbri, dözüm və mübarizəsi ilə bütün Allah yolçuları (və xüsusilə, özünü Əhli-beyt (ə) davamçısı hesab edən qadınlar) üçün ülgü və nümunə olacaqdı.

Bu xanədanın üçüncü övladı Həzrəti-Zeynəb (s.ə.) hicrətin 6-cı ilində Cəmadiyyul-əvvəl ayının 5-də Mədinə şəhərində anadan olmuşdur. Atası möminlərin əmiri Həzrəti-Əli (ə), anası dünya xanımlarının rəhbəri, Allahın sevimlisi Həzrəti-Fatimeyi-Zəhra (s.ə.), babası Peyğəmbərlərin əşrəflisi, Xətmi-Peyğəmbər Həzrəti-Muhəmməd (s),

qardaşları behişt gənclərinin ağaları sayılan İmam Həsən (ə), İmam Hüseyn (ə) və bacısı Kərbəla faciəsində onunla çiyin-çiyinə məşəqqətlər çəkən əsirlər karvanının ikinci qəhrəmanı Ümmü Gülsümdür (s.ə).

***“Zeynəb”*** – “atanın zinəti” deməkdir. Allah tərəfindən belə adlanan bu qız, öz vəzifəsini yerinə yetirməklə tarixin zinəti və ailəsinin fəxri oldu. Odur ki, Zeynəb (s.ə) adı məhz onun fədakarlığı hesabına həmişə gözəl, müqəddəs və əbədidir.

Həzrəti-Zeynəbin (s.ə) həyatının ən mühüm və əzəmətli dövrü qardaşı İmam Hüseynin (ə) dövrünə, eşq və şəhadət karvanı ilə yoldaşlıq etdiyi zamana təsadüf edir. İmam Hüseyn (ə) qiyamını Xanım Zeynəbsiz (s.ə) təsəvvür etmək mümkün deyil. Çünki, İmam Hüseynin (ə) qiyamının hərtərəfli təhlili üçün Zeynəbin (s.ə.) həyatını öyrənmək lazımdır. Əgər belə demək mümkünsə, Zeynəb (s.ə) Kərbəla hadisələrində Seyyidüş-şühəda (ə) hərəkatının canlı tarixi, ölməz natiqidir. Şair demiş:

*Kərbəla, ey qiblagahi eşqi canan Kərbəla!*
*Kərbəla, səndə yatan canana qurban Kərbəla!*

Həzrəti-Zeynəb (s.ə) İmam Hüseyn (ə) hərəkatının bütün səhnələrində nəzərə çarpır. Buna görə də, demək olar ki, Kərbəla hadisəsi İmam Hüseyn (ə) həyatının böyük bir hissəsini təşkil etdiyi kimi, Həzrəti-Zeynəb (s.ə.) həyatının da izzət və əzəmətli dövrünə təsadüf edir.

Həzrəti-Zeynəb (s.ə.) İmamət məqamını tanıdığından yaxşı bilirdi ki, İmam Hüseyn (ə) öz şəxsi iradə və istəyinə uyğun deyil, İlahi vəzifəsinə əsasən ***“əmr-beməruf və***

***nəhyəz-munkər”*** edibdir. Buna görə də tarixdə onun haqqında İmam Hüseyni (ə) ilahi işindən saxlamaq üçün heç bir təklif görünmür. O, bu işdə öz İmamına (ə) müti və təsəllidir.

Həzrəti-Zeynəb (s.ə.) və Ümmü Gülsüm (s.ə) Mədinədən Kərbəlaya qədər İmam Hüseynin (ə) yanında olmuşlar. Xanım Zeynəb bu səfəri ailə qurmazdan əvvəl duymuş və öz nigahında mehriyyə haqqı olaraq qardaşı İmam Hüseynlə (ə) birgə olmağı şərt etmişdi. İndi isə bu şərtdən istifadə etməyin vaxtı gəlib çatmışdı.

Yaşı əllini ötmüş, oğul-uşaq, ailə sahibi olmuş bir qadın üçün qəm karvanını müşayiət etmək, ruhi və cismi çətinliklər, ağır təhlükələrlə rastlaşmaq nə qədər çətin olsa da, zamanın İmamına və Hüseyn (ə) kimi əziz qardaşına olan sonsuz eşq və dərin məhəbbət bütün bunları Həzrəti-Zeynəbə (ə) olduqca asan etmişdi. O bilirdi ki, İmam Hüseyn (ə) Allahın höccəti, Peyğəmbərin (s) canişini, onun və zamanın bütün insanlarının İmamıdır (ə).

İmam Hüseynlə (ə) yoldaşlıq etmək həqiqətdə insani fəzilətlə yoldaşlıq etmək, əbədi səadətə çatmaq deməkdir. Həzrəti-Zeynəb (s.ə.) elə bunun üçün də özünü hər növ müsibətə hazır edib, müqəddəs məqsəd üçün ev, ailə və ümumiyyətlə həyatdan imtina etməyə hazırlaşıb. Allah eşqi ilə güclü bir qəlb və polad iradə ilə insaniyyətin əzəmətini özü ilə aparan bir yola qədəm qoyur.

Həzrəti-Zeynəb (s.ə.) karvan böyüklərindəndir və onun idarə olunmasında mühüm məsuliyyət daşıyır. O, bütün hərəkət və qəmli səhnələrdə özünəməxsus vüqar və əzəməti ilə iştirak edirdi.

O, Həzrəti-Zəhra (s.ə) yadigarıdır və elə bil anasının əvəzinə Hüseyn (ə) və övladlarına analıq qayğısı göstərir. Bu səbəbdən də Həzrəti-Zeynəbi (s.ə.) ***"Seyyidüş-şühəda"*** hərəkatının ən böyük himayəçisi hesab etmək olar. O, bu işi İmamla (ə) birgə, çiyin-çiyinə başlayıb, iradə və təmkinlə yerinə yetirirdi. Həzrəti-Zeynəb (s.ə.) Əhli-beytin (ə) və Əhli-beyt (ə) dostlarının, qadın və uşaqların böyüyü idi.

***"Tasua"*** günü və ondan qabaqkı günlər baş verən hadisələr, İmam Hüseynin (ə) Həzrəti-Zeynəblə (s.ə.) söhbəti, bacısına, Əhli-beytin (ə) himayəsi barəsində olan tövsiyələri açıq-aşkar onun karvanda olan məsuliyyətini göstərir. Həzrəti-Zeynəb (s.ə.) İmam Hüseynin (ə) sirlərinin məhrəmi və əmanətdarı idi, gərək qardaşının onun boynuna qoyduğu yükü məqsədə çatdıraydı.

Həzrəti-Zeynəbin (s.ə.) Kərbəlaya daxil olması ilə onun həyat tarixi də əbədiyyətə qovuşdu. Harda Hüseyn (ə) var, Kərbəla var, orda Xanım Zeynəb də (ə.s) var. Kərbəla tarixi həm də Zeynəbin (s.ə.) Kərbəladakı və Aşuradan sonrakı həyat tarixinin onun həyatının başqa dövrlərindən daha aydın yazılmasına səbəbdir. Həzrəti-Zeynəb (s.ə.) Kərbəlaya daxil olur. O, bilir ki, bura onun qardaşı ilə olacağı son mənzildir. Elə o səbəbdən də İmamın (ə) şəhadətinə qədər ondan bir an da ayrılmır. Həzrəti-Zeynəb (s.ə.) Kərbəlada Yezidə qarşı öz nifrətini bildirərək, buyurdu: "Ey Yezid, mən bu dünyanın çətinliklərinə dözə-dözə rahatlığa yaxınlaşıram, sən isə rahatlıq çəkə-çəkə əbədi əzaba tərəf gedirsən".

Allah eşqi və Əhli-beyt (ə) vilayəti ilə gələnlər axıra qədər qaldılar ki, özlərinin ən yaxşı nemətlərini əbədi və gözəl məqsədə qurban edib, adlarını tarixin qızıl hərflərlə

qeyd etdiyi Hüseyn (ə) və Kərbəla adları ilə yanaşı yazsınlar. Özünü qardaşına və onun yoluna qurban demiş Xanım Zeynəbin (s.ə.) çiynində bu vəzifədən ağır bir yük vardır, o da gələcəkdə Kərbəlada baş verən hadisələri tarixin səhifələrinə olduğu kimi yazdırmaq və həqiqəti bəşər dünyasına çatdırmaq idi. İmam Hüseynin (ə) insanların boynunda nə qədər haqqı var idisə, onun ürəyi dağlı bacısı Həzrəti-Zeynəbin (s.ə.) də bir o qədər haqqı vardır. Çünki İmam Hüseynin (ə) şəhadətinin əzəmətini bacısı Həzrəti-Zeynəb (ə) öz əsirliyi ilə təkmilləşdirdi. Əgər Həzrəti-Zeynəb (s.ə.) orada olmasaydı, İmam Hüseyn (ə) şəhid olandan sonra onun haqqını camaata çatdıracaq bir kəs olmaz və O Həzrətin (ə) şəhadəti nəticəsiz qalardı. Doğrudan da, əgər Həzrəti-Zeynəb (s.ə) İmam Hüseynə (ə) kömək edib Kərbəladan Kufə və Şam şəhərinə əsir aparılmasaydı və oradan Mədinəyə qayıtmasaydı, Yezid və onun əlaltıları Kərbəla faciəsini kiçik və əhəmiyyətsiz bir hadisə kimi qələmə verəcəkdi. Çünki Yezid öz hiyləgər siyasətini axıra qədər icra etmək istəyirdi. Yezid Kərbəla qiyamının mahiyyətini tam əksinə təbliğ etmək, İmam Hüseynin (ə) səltənət fikrində olub, İslam ölkələrində fitnə yaratmaq istədiyini təlqin etməyə çalışırdı.

Lakin Həzrəti-Zeynəb (s.ə.) Yezid kimi Allah düşməninin qarşısında İmam Hüseynin (ə) hədəfini bütün aləmlərə çatdırdı. Yezidin Şam şəhərində təşkil etdiyi şadlıq məclisində müxtəlif İslam ölkələrindən gələcək nümayəndələr iştirak edirdi. Həzrəti-Zeynəb (s.ə.) həmin məclisdə öz tarixi xütbəsini söyləyib, Bəni-Üməyyənin qəsbkar hakimiyyətini ifşa edərək, İmam Hüseynin (ə) izzətini, şərəfini, yüksək məqamını sübuta yetirdi.

Həzrəti-Zeynəb (s.ə.) öz əsirliyi müddətində İmam Hüseynin (ə) ali hədəfini xalqa çatdıraraq, onlara həqiqəti başa saldı və Yezidin Kərbəla hadisəsini camaatın zehnindən silib yaddan çıxartmasına mane oldu. Bu səbəbdən də Həzrəti-Zeynəbin (s.ə.) bizim boynumuzda böyük haqqı var. Gərək bütün möminlər Həzrəti-Zeynəbi (s.ə) yada salıb onun İslam və müsəlmanlara etdiyi böyük xidməti insanlara təqdim etsinlər. Qoy bütün müsəlmanlar Həzrəti-Zeynəbin (s.ə.) ilahi ruhiyyəsindən və Allahın ona verdiyi vilayət məqamından bəhrələnsinlər.

Həzrəti-Zeynəb (ə) 56 il ömür sürmüşdür. Məşhur rəvayətə əsasən, onun ömrünün axır vaxtlarında Mədinədə qıtlıq olmuşdu. Həzrəti-Zeynəbin (s.ə.) həyat yoldaşı Əbdüllah İbn Cəfərin Şamda bir tarlası vardı. Çarəsiz qalıb oraya gedirlər. Orada Həzrəti-Zeynəbin (s.ə.) vəziyyəti ağırlaşır və dünyadan köçür. Onu Əbdüllah İbn Cəfərin torpaq sahəsində dəfn edirlər. Hal-hazırda o xanımın məqbərəsi Suriyanın paytaxtı Dəməşq şəhərində böyük ziyarətgah və diləklər qapısıdır.

Bəndin son iki misrasında şair

*“Ələmdarü Hüseyn rəşid Abbasa,*
*O qolsuz ağama bağışla məni”*

– deyərkən İmam Hüseynin (ə) bayraqdarı olan Həzrəti-Abbası (ə) vəsf edərək bildirir ki, “Həzrəti-Abbas (ə) İmam Hüseyn (ə) ağanın özü qədər möhtərəm Kərbəla qəhrəmanıdır.

Allah-təala Ümmul-Bənidən Həzrəti-Əliyə (ə) 4 oğul qismət edir: Abbas, Adullah, Cəfər, Osman.

Həzrəti-Abbas (ə) Hicrətin 26-cı ilində doğulmuşdur. Hər il Məhərrəm ayının əvvəlindən Səfər ayının sonunadək Həzrəti-Abbasın (ə) adına məscidlərdə, ziyarətgahlarda, evlərdə mərasimlər keçirilir, ehsanlar verilir, Əhli-beyt (ə.m) məddahları İmam Hüseynin (ə) və Əbülfəzl Abbasın (ə), həmçinin digər Kərbəla şəhidlərinin igidliklərindən söz açır, onların şəninə yazılmış qəsidə, sinəzən və mərsiyələr oxuyurlar.

Həzrəti-Abbas (ə) doğulandan misilsiz zahiri gözəlliyə malik idi. Onun uşaqların ən gözəli olması dillərə düşmüşdü. Buna görə də ona "Qəməri-Bəni-Haşimin" (Haşim oğulları qəbiləsinin Ayı) ləqəbi verildi. Ümumiyyətlə ərəblər qədd-qamətli, təmiz əxlaqlı kişiyə "Qəmər" adı verərdilər. Məsələn, Haşimin atası Əbdü-l-Manafa "Vadilər qəməri", Həzrəti-Məhəmmədin (s) atası Abdullaha "Hərəmin qəməri" demişlər ("Hərəm" – "müqəddəs torpaq" deməkdir. Kərbəla torpağı da bu qəbildəndir).

12 imam cərgəsinə yer almamasına baxmayaraq Həzrəti-Abbas (ə) o taylı-bu taylı Azərbaycanın hər yerində "babə-l-həvaic" (ehtiyaclar qapısı) kimi dinimizin ən müqəddəs şəxsiyyətlərindən sayılır, "adına qurban Əbəl-fəzl! deyilərək adına, qələm olan qollarına and içilir, "Əlinin qəzəb oğlu" tək azğın və zalımlara qarşı sarsılmaz güvənc və söykək yeri olaraq anılır, xatırlanır.

Belə bir lətifə danışırlar: Bir gün bir Ərdəbillidən 12 imamın adlarını sadalamasını istəyirlər. O, sadalayır. Ancaq imamların sayı 13 olur. Ondan bunu bir daha etməsini istədikdə rəqəm dəyişmir. Axırda çarəsiz qalıb ona bunun səbəbini bildirirlər. O isə belə deyir: "Sizi Allaha and veri-

rəm, oradan kimi çıxarırsızsa çıxarın, ancaq, bircə Həzrəti-Abbasa dəyməyin!”.

Bu lətifə əslində islami dəyərlərimizə söykənən folklor vahidi kimi xalqımızın bu ulu din böyüyü ilə bağlı köklü və dərin sayğı və sevgisi üzərində yoğurulduğundan bütün cəhətlərdən özünü doğrultmaqda, milli-mənəvi çəki baxımından dolğun, keçərli bir qaynaq olaraq boy göstərməkdədir. Yeri gəlmişkən deyək ki, folklor qurumlarının sayının artmasına baxmayaraq xalqımızın belə parlaq şifahi sərvəti hələ də diqqətdən kənarda qalır, lazımınca toplanıb öyrənilmir. Halbuki, həmin qurumların başlıca işi bu cür yaşarı və canlı örnəkləri toplayıb öyrənmək, millətin əzəli-ədəbi sərvətinə çevirməkdir.

Həzrəti-Abbas Kərbəla vaqeəsindən əvvəl də igid kimi ad çıxarmışdı. Əl-Xarəzmin bildirdiyinə görə o, Siffeyndə atası Həzrəti-Əli (ə) ilə çiyin-çiyinə Müaviyə ibn Əbu Süfyana qarşı döyüşmüş, düşmənə böyük itki vermişdir. Aşuradan öncə baş vermiş silahlı toqquşmalar da məhz, onun adı ilə bağlıdır. Belə ki, Məhərrəm ayının 7-də axşama doğru İmam Hüseynin (ə) düşərgəsində su qurtarır. Peyğəmbər (s) xanədanının qız-gəlini susuzluqdan əziyyət çəkməyə başlayır. Həzrəti-Abbas İmam Hüseyndən (ə) izn alıb 30 atlı ilə əli tuluqlu 20 piyada götürür və Fərat çayına tərəf yollanır. Fəratın yolunu isə Əmr ibn Həccac əz-Zibeydi kəsmişdi. Onun başçılığında piyadalardan başqa 500 atlı da toplanmışdı.

İbn Həccac at ayaqlarının tappıltısını eşitdikdə irəli gəlib ucadan soruşur:

– Burada kim var?

Həzrəti-Abbasın (ə) yoldaşlarından Mafi Hilal əl-Cəməli deyir:

– Gəlmişik yolunu kəsdiyiniz sudan içək!

İbn Həccac ondan soruşur:

– Sən kimsən ki?!

O, cavab verir ki, mən Mafi Hilal əl-Cəməliyəm.

– Siz Hüseyn ibn Əbu Turabın adamlarındansınız?

– Bəli.

– İç bu sudan, nuş olsun! Ancaq bir şərtim var: bir damla su belə Hüseynə və Abbasa çatmamalıdır!

– Hüseynin qardaşı Abbas da bizimlədir.

– Bizi bura ona görə qoyublar ki, sizi suya yaxın buraxmayaq. Əgər yaxınlaşmağa cəhd etsəniz, vuracağıq!

Bu zaman Həzrəti-Abbas (ə) qılıncını sıyırır və bir neçə döyüşçüyə tuluqlarını doldurmağı tapşırır. Döyüşçüər 20 tuluğu dolduraraq bircə yara da almadan sağ-salamat düşərgəyə qayıdırlar.

Bu şəxsiyyətin mənəvi-əxlaqi yetkinliyi ilə bağlı aydın anlayış əldə etməkdən ötrü “tasua”da baş vermiş bir əhvalat da olduqca maraq doğurur. Deyilənə görə, Şimr bir qaya üzərinə çıxıb ucadan səslənir ki, bacımız Ümmü-l-Bəninin oğlanları hanı? (Tarixi qaynaqlara görə Şimr də Ümmü-l-Bəninin qəbiləsindən – Kilabdan idi. O zamanın adətlərinə görə, Ümmü-l-Bənin qəbilə üzvlərinin bacısı sayılırdı).

Bunu eşidən Abbas, Cəfər və Osman irəli çıxır, Həzrəti-Abbas qəzəblə soruşur:

– Sənə nə olub, nə istəyirsən?

Şimr deyir:

– Bacımız oğlanları, sizə aman verilir.

Həzrəti-Abbasın cavabı tarixi bir cavabdır: “Allah sənə və sənin “amannamə”nə lənət eləsin. Dediyin kimi həqiqətən bizim dayımızsansa, Rəsulullahın (s) övladına aman verilmədiyi halda sən bizə necə aman verirsən? ”.

Bu əhvalat bir daha danılmaz biçimdə sübuta yetirir ki, Həzrəti-Abbasın (ə) Kərbəla düzündəki igidliyinin əsasında özünün ali soyundan gələn və İmam Hüseynə (ə) sonsuz sayğı və sevgi üzərində qurulan yüksək mənəvi-əxlaqi məziyyətləri durur. Bu məziyyətlər onun diri, canlı, yaşarı və ölməz portret cizgilərini şərtləndirmiş, onu milyonların güvənc yerinə çevirmişdir. Həzrəti-Abbasın igidlik zirvəsini isə Aşura döyüşləri təşkil edir. Belə ki, şəhidlərin çoxaldığını gördükdə o, qardaşlarına belə tapşırır: “Gedin, sizi Allaha və Onun peyğəmbərinə həvalə edirəm”. Onlar – Adullah, Osman və Cəfər var qüvvələri ilə vuruşub, bir-bir şəhidlik zirvəsinə ucalırlar.

“Düşərgədə susuzluq yenidən şiddətlənir. Südəmər körpələrin, uşaqların, qadınların bənizləri saralır, gizli hıçqırtıları ürək dağlayır. İslamiyyətin və Əhli-beytin (ə) qeyrət rəmzi olan Həzrəti-Abbasın (ə) qəlbi buna tab gətirmir. Odur ki, atına minib, qılıncını çıxarır, Belinə tuluq keçirib Fərat çayına tərəf yollanır. Bu zaman bəzi düşmən atlıları ona mane olmağa çalışır. O, qılıncını siyirərək bir şir kimi nərə çəkir və onların üstünə şığıyır. Onu tanıyırlar. Çünki, gücünü görmüşdülər. Odur ki, yolundan çəkilirlər, Fərata gedib tuluğunu doldurmağa imkan verirlər. Həzrət (ə) yenidən atının belinə qalxır və Əhli-beytin (ə.m) düşərgəsinə doğru hərəkət edir. Bu zaman qarşısını çoxsaylı düşmən atlıları kəsir. O, qılıncı ilə onların çoxunu həlak edə bilir. Onlar qaçmağa üz qoyurlar. Çünki, onunla üzbəsurət vuruş-

mağın qeyri-mümkün olduğunu bilirlər. Beləcə, düşmənin yalnız bir çıxış yolu qalırdı – qorxaqların tutduğu hiyləgərlik, arxadan zərbə vurmaq yolu.

Zeyn ibn Rəqqab Cehni ilə Hükm ibn Tufeyl Səyumi hərəsi bir xurma ağacının arxasında gizlənərək o igidlik timsalına pusqu qururlar. Zeyd arxadan zərbə endirərək Həzrəti-Abbasın sağ qolunu kəsir. Kəskin ağrıya baxmayaraq Həzrət (ə) bayrağın sapını kəsilmiş əlindən sol əlinə ötürür və onu yuxarı qaldıraraq var gücü ilə nərə çəkir: "Allaha and olsun, sağ tərəfimi büsbütün doğrasanız da mən daim öz imanımı saf, etibarlı Peyğəmbərin (s) övladı olan İmamımı bütün varlığımla qoruyacağam".

Həzrəti-Abbas (ə) bu sözləri deyib, atını İmam Hüseynin (ə) çadırına doğru çapmağa başlayır. Bu zaman Hükm o biri xurma ağacının arxasından çıxıb Kərbəla igidinin sol qolunu da vurur. Abbas qollarının salamat qalan hissəsi ilə bayrağı sinəsinə sıxır ki, onu qadırılmış vəziyyətdə saxlaya bilsin.

Qəhrəmanın qollarının kəsildiyini görən qorxaqlar ürəklənir və onun üzərinə ox yağdırırlar. Həzrətin (ə) atına da çox ox dəyir. Odur ki, at çox davam gətirə bilməyib Həzrəti-Abbasla (ə) birlikdə yerə yıxılır. Bu zaman tuluğa da ox dəyir və suyu yerə axır.

Çoxlu qan itirdiyindən həzrətin qüvvəsi anbaan tükənir. Odur ki, son gücünü toplayaraq, "Məndən sənə salam olsun, ey Əba Əbdillah!" – deyə ucadan səslənir.

Düşmən qoşunundan bir nəfər yaxınlaşaraq, əmudla Həzrətin (ə) başına zərbə endirir və onun başını bədənindən ayırır. Həzrəti-Abbas şəhid olur. Bunu yəqin edən Həzrəti Hüseyn (ə) deyir: "İndi belim sındı, gücüm tükəndi".

Səkinə atasına yaxınlaşıb əmisini ondan soruşur, Abbasın (ə) şəhadətə yetdiyini bildikdə özünü qışqırıb ağlamaqdan saxlaya bilmir.

Qardaşının ölüm xəbərini eşidər-eşitməz Xanım Zeynəbin (s.ə) şivən səsi yeri-göyü titrədir: "Vay qardaş! Vay Abbas! özündən sonra bizi kimə tapşırıb getdin?!" [9, s.377–381].

Göründüyü kimi Novrəs İman Həzrəti-Abbası (ə) İmam Hüseynin (ə) bayraqdarı və igid adlandırır. Bu, aşığın Əlinin (ə) qəzəb oğlunu çox sevdiyini göstərir. Digər tərəfdən "Bağışla məni" xitabı Həzrəti-Abbasın "Babul–həvaic" (hacətlər qapısı) adlandırılmasına da işarə sayıla bilər.

Biz bu motivlə həm aşığın öz yaradıcılığında, həm də digər sənətkarların əsərlərində tez-tez rastlaşırıq:

*Gahi xəstəhalam, gahi pərişan,*
*Gahi şad oluram, gah vaxtı giryan.*
*Hərdən darıxanda Novrəstə İman,*
*Dönüb, birdə Ələmdarı çağırram [3, s.31].*
*(Novrəs İman)*

***

*Qorxma, köməkdardı Ələmdar Abbas,*
*Fəryada yetməyə onda var əsas.*
*Qurtarsın bəladan, eyləsin xilas,*
*Əsrin Qaib olan imamı, qardaş [3, s.72].*
*(Novrəs İman)*

***

*Təriq əl-vəfanı rumiən qiyas,*
*Özün buyurubsan "ayeyi-vənnas".*
*Müşkül müntəzirə guş versin Abbas,*
*Paylayan saqiyə bizi yetirsin [3, s.100].*

*(Novrəs İman)*

***

*Su gətirən dəmdə kəsildi yolu,*
*Qələm oldu bədəndən bir cüt qolu.*
*Zəvvar olaq Əlinin qəzəb oğlu,*
*Məşq ələmpərvəri yektayə biz.*

*Haqq yolunda Hüseyn kimi dünyada,*
*Yoxdu əhli-əyalın bverən ada,*
*Şahhi-şühədanı salanda yada,*
*Lənət deyək Şimri bihəyaya biz [17].*

*(Aşıq Əhməd Rüstəmov)*

***

*Nəhri-Fərat üstə açıb imdi də ələm,*
*Abbasi-namidari-ələmdari-Kərbəla [7, s.22].*

*(Qumri Dərbəndi)*

***

*Dərvişəm kəşkülüm var,*
*Hər bağda beş gülüm var.*
*Çağırram, ya Əbəlfəzl,*
*Sən açan müşkülüm var.*

*(Bayatı)*

Tilavətin növbəti bəndində şair Kərbəla şəhidlərindən Əli Əkbərin, Əli Əsgərin və şahzadə Qasimin şəhadətinə işarə edir:

*Bağışla növcavan Əkbər yasına,*
*O tifl-südəmər Əsğər yaşına,*
*Şahzadə Qasımın sərvər yasına,*
*Verilən nizama bağışla məni! [3, s.26].*

Bu bənddə üç Kərbəla şəxsiyyəti tərənnüm olunur.

İmam Hüseynin (ə) oğul dağı şahzadə Əli Əkbərin (ə) müsibəti barədə f.ü.f.d. Vərağa Almaslının "İmam Hüseyn aşiqi Füzuli" adlı monoqrafiyasında geniş və əhatəli məlumat verilir. Müəllif yazır: "Peyğəmbərlik və imamlıq ocağında aldığı nurani tərbiyə Əli Əkbərin (ə) qeyrət dənizini dalğalandırır və o, İmam Hüseyndən döyüş izni istəyir". Əli Əkbərin (ə) ən səciyyəvi keyfiyyəti bütün göstəricilər üzrə Həzrəti-Məhəmmədi (s) xatırlatmasıdır. Məqtəllərin çoxunda bu keyfiyyət belə verilir: "Ravi nəql edir ki, Əli Əkbər (ə) meydana gedəndə İmam Hüseyn (ə) onun barmağından yapışdı və əlini yuxarı qaldıraraq buyurdu: "Allahım, sən şahid ol. Mən bunların cənginə elə bir cavanı göndərirəm ki, insanlar içərisində zahirinə, batininə və nitqinə görə Sənin Peyğəmbərinə (s) ən çox bənzəyənidir. Biz Sənin Peyğəmbərinin (s) camalına müştaq olduqda həmişə onun üzünə baxmışıq".

İmam (ə) Əli Əkbəri (ə) meydana göndərəndə nifrin də etdi: "Ya Rəbb, onları torpağın bərəkətindən məhrum et, aralarına ayrılıq sal, onları dağıdaraq pərən-pərən sal, dincliklərini əllərindən al, heç vaxt başçılarını onlardan razı etmə! Çünki, onlar özləri bizi köməyə çağırdılar. Ancaq elə

özləri də bizə əzab-əziyyət verib, bizi qətlə yetirdilər” [9, s.423].

Əli Əkbər motivinə həm aşığın öz yaradıcılığında, həm də digər sənətkarlarımızın əsərlərində tez-tez rast gəlirik. Məsələn,

*Mənim irəhbərim, Əli Əkbərim,*
*Bu müşkül dərdimə çarə yetir sən,*
*Qəlbimdə sərvərim, dildə əzbərim,*
*Qurtar məni, ya da dara yetir, sən [3, s.99].*

***

*Dilim yaralıdı, istər Abbası,*
*Başıma vurubdu Əkbər havası.*
*Uçdu can cəsəddən, yoxdu binası,*
*İstər mənzil üçün haralar məni? [3, s.77].*

***

*Məlul könlüm düşüb qəm dəryasına,*
*Əridir cismimi nar havasına.*
*Gərəkdir, əyləşim Əkbər yasına,*
*Ağlamasam Ələmdara, çətindi [3, s.33].*

***

*Naz ilə qətlgahdə yatıb Əkbri-cavan,*
*Cismində zəxmi-xəncəri-xunxari – Kərbəla [7, s.22].*
*(Qumri Dərbəndi)*

***

*Qumlar üstündə gərək qalsın Əliyyi-Əkbərim,*
*Can qucağında gərək versin, Əliyyi-Əsğərim,*

*Ərməğan olsun gərək ənguşt, həm ənguştərim,*
*Bihəyalıq eyləyib kəssin o xəncər başımı [21].*
*(Əyyub Baki)*

***

*Rəhm etmədi, heç, bir sənə bu qövmü-sitəmgər,*
*Bu halə salıblar səni, ey şibhi -Peyəmbər,*
*Cismin yaralı, isti qum üstə təni -bisər,*
*Qurbanı kəsərlər məgər ətşan Əli-Əkbər?*

*Saqib, elə nalə, yetib həngameyi-matəm,*
*Tut Əkbər əzasın üzə tök əşki dəmadəm,*
*Vur başuva, qan ağla bu matəmdə çü Zəm-zəm,*
*Verdi başını ümmətə qurban Əli-Əkbər [18, s.311].*
*(Haşım bəy Saqib)*

***

*Hər kim istər ki, havadar ona Peyğəmbər ola,*
*Gərək aləmdə əzadari – Əli Əkbər ola.*

***

*Get, Əli-Əkbər, oğul Allaha tapşırdım səni,*
*Şibhi-peyəmbər oğul, Allaha tapşırdım səni.*

***

*Çək qılınc Heydər kimi, bir həmlə et bu ləşkərə,*
*Vur bu düşmən səflərin muri-mələx tək bir-birə.*
*Mümkün olsa bir içim su al Əliyyi – Əsğərə,*
*Təşnədir Əsğər oğul, Allaha tapşırdım səni.*
*(H.Ə.Raci) [14, s.163].*

***

*Aləm niyə bəs olmadı viran, Əli-Əkbər?*
*Ol gün ki, səni saldılar atdan, Əli-Əkbər?*

***

*Kərbəla vaqiəsin bircə təfəkkür eləyün,*
*Dəmbədəm cari yüzə əşki təhəyyür eləyün,*
*Əkbərün halini siz bircə təsəvvür eləyün,*
*Bir Əli Əkbər ola, yüz minətən ləşkər ola*
*(H.Ə.Raci) [14, s.140–141].*

***

*Baxdı çün Əkbərinin nizədə Leyla üzünə,*
*Gördü zülfü tökülüb çün şəbi-yelda üzünə.*

*Gəldi şurə, dedi: Ey şəmü şəbüstanım oğul!*
*Yetmədim kami-muradə, məhi-tabanım oğul!*
*Həşrədək dildə qalıb, çıxmadı bu canım, oğul,*
*Gəlməyəydi anan ey kaş, bu dünya üzünə!*

*Dedilər kimdi bu övrət bizi nalan eləyən,*
*Bəlkə Leyladı bu Məcnun kimi əfğan eləyən,*
*Səni ey tazə cavan, qanına qəltan eləyən,*
*Necə məşhərdə baxar Həzrəti-Zəhra üzünə?!*

*Sabira, hər il əza saxla Əli Əkbərə sən,*
*Kərbəlada gedib ağla o şəhi davərə sən,*
*Gəl Qiyamətdə bu cəm ilə səfi məhşərə sən,*
*Qalma həsrət iki dünyada o Mövla üzünə.*
*(M.Ə.Sabir)*

Şair ikinci misrada "O tifl-südəmər Əsğər yasına" – deyərkən Kərbəlanın ən kiçik şəhidi, altı aylıq südəmər körpə Əli Əsgərdən söhbət açır. Südəmər körpə olan Əli Əsğərin aclıq və susuzluqdan çətinlik çəkdiyini görən xanımlar onun bu vəziyyətini imam həzrətlərinə bildirdilər. İmam (ə) mübarək körpəni əlləri üstünə götürüb düşmən qoşununun qarşısına gələrək buyurdu: "Ey zülmkarlar, tutaq ki, mən günahkaram, bəs bu məsum körpəyə niyə bir damla su vermirsiniz?".

O daş parçasına çevrilmişlərdən axar su gözləmək imkan xaricində olduğu üçün onlar belə cavab verdilər: "Ey Hüseyn, Übeydullah Ziyadın su qadağasına dair hökmü möhkəmdir, əsla dəyişməz və beyət gətirməyənədək sənə və övladlarına su içmək qismət olmaz!".

İmam həzrətləri ümidsiz olub qayıtmaq istəyərkən Hüzeymə Kahili (Hərmələ) bir iti oxu yaya qoyub atdı və ox o günahsız körpənin mübarək boğazına dəyərək dəlib keçməklə imam həzrətlərinin mübarək qoluna sancıldı. İmam həzrətləri o oxu çəkib çıxartdıqda həmin körpənin boğazından qan bulaq kimi axmağa başladı. Sonra İmam Hüseyn (ə) Əli Əsgərin boğazından axan qanı səmaya atdı.

Biz bu motivlə digər sənətkarlarımızın əsərlərində də rastlaşırıq:

*Üfüqdə qanlı şəfəq cilvəgahi Əsğərdi,*
*Qiyamət olsa da zahir, səmadan ayrılmaz.*

*(Heyran xanım)*

***

*Hülqündən Əsğərün genə qani kəsilməyib,*
*Çıxmış səmayə ahi-şərərbari – Kərbəla [7, s.22].*
*(Qumri Dərbəndi)*

Rəvayətə görə, Əli Əsğərlə 72 nəfər tamam oldu və o gün müvəqqəti olaraq xəstələnmiş İmam Zeynalabidindən başqa, varlıq aləmində Həzrəti-Hüseynə bir yar-yoldaş qalmadı. Şahzadə özünü tək-tənha gördükdə ciyər odlayan bir ah çəkib bu məzmunlu bir rəcəz oxumağa başladı:

*Dərda ki, dari-dəhrdə bir yar qalmadı,*
*Bir yari-qəmküsarü vəfadar qalmadı.*
*Dami-bəladan əhli-vəfa buldular nəcat,*
*Bir bəndən özgə zarü giriftar qalmadı [20, s.324].*
*(M.Füzuli)*

*(Dərd budur ki, dünya evində bir yarı-yoldaş qalmadı, qəmə, kədərə ortaq ola biləcək vəfalı bir şəxs gözə dəymir, Bütün vəfalı dostlar bəla tələsindən qurtuldular, bir məndən özgə ağlar və tələyə düşmüş kimsə yoxdur).*

***

Tarixçilər Həzrəti-Qasim ibn Həsənin (ə) hicri 46-cı və ya 47-ci ildə, atasının şəhadətindən 3 il əvvəl dünyaya gəldiyini yazırlar. Beləliklə, Aşura günündə onun 13 və ya 14 yaşının olduğu təxmin edilir. İmam Həsənin (ə) ən kiçik oğlu olan Həzrəti-Qasimin anasının adı Rəmlə və ya Nüfeylədir. Bu qadın İmam Həsənin kənizlərindən idi. Ərəblər öz ağasına ərə gedib, ondan oğul dünyaya gətirən qadına

"ümmi-vələd" deyirlər. Rəmlə (Nüfeylə) də ümmi-vələd qəbilindən idi. Atası İmam Həsənin (ə) şəhadətindən sonra Qasimi əmisi İmam Hüseyn (ə) öz himayəsinə götürür. Əmirləri – İmam Hüseyn (ə) və Həzrəti-Əbəlfəzl Abbas (ə) Qasimi uşaqlıqdan tərbiyələndirərək yeniyetmə çağında artıq cəsarət və şücaətli döyüşçü kimi formalaşdırırlar. Həzrəti-Əbəlfəzl Abbas (ə) Qasimə qılınc oynatmaq üzrə xüsusi təlimlər keçmişdi.

Hicrətin 60-cı ilinin rəcəb ayında İmam Hüseyn (ə) Mədinəni tərk edərkən Qasimin anası Ümmi-Fərvə onu və oğlunu da özü ilə aparmasını İmamdan (ə) xahiş edir. İmam Hüseyn (ə) razılaşır. Möminlər əmirinin (ə) nəvəsi, İmam Həsən Müctəbanın 13 yaşlı oğlu Qasim olduqca rəşadətli, cəsur və xarici görkəmində çox yaraşıqlı idi.

Həzrəti-Qasim böyük şücaət sahibi idi. Aşuraya keçən gecə İmam Hüseyn (ə) öz tərəfdarlarını toplayıb, onlarla vidalaşdı, sabah özünün və Onunla birlikdə qalan şəxslərin şəhid olacağını bildirdi, hər kəsin düşərgəni tərk edib getməsinə icazə verdi. Bu zaman Qasim əmisindən soruşdu: *"Mən də öldürülənlərin arasında olacağammı?"* İmam Hüseyn (ə) Qasimin sualına sualla cavab verdi: **"Ölüm sənin üçün nə deməkdir?"** Qasim buyurdu: *"Baldan daha şirindir"*. Bu sual-cavab Qasimin Əhli-beyt (ə.m) xanədanına layiq bir övlad olduğunu bariz şəkildə göstərir. Qasimin öz əmisinə verdiyi sual qorxu üzündən deyildi; əgər belə olsaydı, ölümü baldan şirin qəbul etməzdi. O, narahat idi ki, şəhidlik səadəti yaşının azlığına görə ona şamil olmaz. Bu səadətdən mərum qalmadığını yəqinləşdirmək üçün İmama bu sualı vermişdi.

Mənbələrin yazdığına görə, İmam Həsən (ə) şəhadətə qovuşmazdan əvvəl bir məktub yazaraq xanımı Ümmi-Fərvəyə verir və nə vaxtsa Qasimin çətin vəziyyətdə olduğunu gördükdə ona verməyi tapşırır.

Nəhayət illər sonra Ümmi-Fərvə bu məktubu Kərbəlada Aşura günündə Qasimə verir. Belə ki, Qasim iki dəfə əmisi İmam Hüseynə (ə) yaxınlaşaraq döyüş üçün icazə istəyir. Lakin İmam Hüseyn (ə) yaşının azlığı və anasının tək övladı olmasını bildirərək ona döyüş icazəsi vermir. Bu zaman Qasimin çox kədərləndiyini görən Ümmi-Fərvə məktubu oğluna uzadır. Məktubda aşağıdakı sözlər yazılmışdı: "*Oğlum, Qasim! Bir gün gələcək qardaşım Hüseyn minlərlə düşmən ordusu ilə üzləşəcək. Bu elə bir gün olacaq ki, həmin gün İslamı fədakarlıq və qurban verməklə xilas etmək lazım gələcək. Sən həmin gün məni təmsil edəcəksən".*

Məktubu oxuyan Qasim gülümsəyir və İmam Hüseynə (ə) tərəf tələsərək məktubu ona verir. Məktubu görən İmam Hüseyn (ə) Qasimə döyüş icazəsi verir və belə buyurur: *"Qardaşımın balası, Qasim, atanın səndən etməyini istədiyi bir işə mane ola bilmərəm. Bismillah, get, Allah sənə yar olsun!"*

Şahzadə Qasim barədə Məhəmməd Füzulinin "Hədiqətüs-süheda" əsərində oxuyuruq:

"İmam Hüseyn cənab Qasimin şəhadətə meyli olduğunu görüb, əyninə kəfən geyindirib, belinə də öz qılıncını bağlayaraq onu döyüş meydanına göndərir. O, meydana girib, cövlan edir və belə bir rəcəz oxuyur:

*Mənəm geli-çəməni-sidq Qasim ibn-Həsən,*
*Ki, nəqdi-can qılıbam nəzri-xaki-payi-Hüseyn,*

*Müqimi-kuyi-vəfayam, müsafiri-rəhi-Həq,*
*Mütii-əmri-Həsən, talibi-rizayi-Hüseyn.*

*(Sədaqət çəməninin qızılgülü olan Həsən oğlu Qasim mənəm; mən elə bir cavanam ki, canımın nəqdini Hüseynin ayağı altındakı torpağa nəzir demişəm! Mən vəfa məhəlləsində şəstlə dayanmışam, yalnız və yalnız ilahi razılığı qazanmaq üçün haqq yolunda səfərə çıxan bir cəfakeşəm; Mən Həsənin göstərişlərinə boyun əymişəm və Hüseynin könlünü xoş etməkdən başqa özgə bir istəyim, diləyim yoxdur!).*

Qasim düşmən qoşununa həmlə edib ordunun ortasınadək irəliəyərək, Ömər bin Sədlə üz-üzə gəlir və uca səslə nərə çəkərək deyir ki, bu qədər mömini şəhid etdiniz, istiğfar edib, bağışlanma diləyib, bu əməldən peşman olmaq çağı çatmadımı?

Qoşun sel kimi Qasimin üstünə yeriyib, hər tərəfdən ox atıb, döyüşə başladı, halbuki, Qasim bu hiylədən xəbərsiz idi. Ancaq o, düşmənin çoxluğundan qorxmadan bir həmlə ilə qoşunu pərakəndə elədi. İşi belə görən ibn Səd Şam bölüyünün başçısı olan Əzrəq Şamiyə tənə vurub dedi: “Sən Yezidin xüsusi rəğbətini qazanmış bir pəhləvansan, bəs niyə irəli çıxıb bu döyüşçünün şərrini başımızdan uzaqlaşdırmırsan?”

Əzrəq Şami təkəbbürlə dedi: “Ey ibn Səd, məni Ərəb bin Mübarizə müqabil tuturlar, mənə yaraşmaz ki, bir uşağın cənginə gedib adımı bədnam edəm”.

İbn Səd dedi: “Ey nadan, bu cavan peyğəmbərin və Əlinin nəvəsidir, Həsənin oğludur, susuz olmasaydı, bu qədər qoşunla vuruşmağı özünə ar bilərdi”.

Əzrəq dedi: “Sən şişirdirsən, mənim dörd oğlum var, hərəsi də məşhur pəhləvandır, bu saat birinə deyərəm, onu tutub gətirər”.

O, böyük oğluna xeyir-dua verərək Qasimin döyüşünə yollayr. Qasim də öldürdükdən sonra onun kəkilindən yapışaraq bir az meydanı gəzdirir, sonra sür-sümüyünü, bədən üzvlərini sındırıb, yeni döyüşçü istəyir. Qasim bu münvalla Əzrəq Şaminin o biri oğlanlarını da bir-bir öldürür. İşi belə görən Əzrəq bərk hirslənərək qəzəbli halda meydana girir və Qasimə xoşagəlməz sözlər söyləyir. Qasim deyr: “Ey Əzrəq, bu iztirab oğlanlar fərağindən isə bu dərdin dərmanı əlimdədir”.

İmam Hüseyn (ə) Əzrəqi meydanda gördükdə narahat olur, ona görə ki, Əzrəq böyük pəhləvan idi, Qasim isə gənc, susuz, yorğun və nigaran idi. Odur ki, imam dərhal onun üçün dua etməyə başlayır.

Xülasə, Əzrəq dəfələrə hücuma keçir, ancaq Qasim onun hücumlarının hamısını dəf edir, aralarında ağır döyüşlər olur, ən nəhayət, Qasim fürsət taparaq Əzrəqə elə bir qılınc zərbəsi endirir ki, o, atdan yıxılır. Qasim dərhal düşmənin başını kəsib atını da yedəyə alaraq əmisinin hüzuruna gəlib deyir:

*Ey rikabi-rəxşi-iqbalın hilali-övci-din,*
*Nəqşi-nəli-mərkəbin mehrabi-əqbabi-yəqin.*
*İqtidayi-şərdir fərmanına olmaq müti,*
*Əsli imandır səni bilmək Əmirəl-möminin.*

*(Sən ey tale, bəxt atının üzəngisi din ucalığının təzə çıxmış ayı olan imamım əmi, mindiyin atın nallarının torpağa saldığı naxışlar yəqinliyə yetmiş kamil şəxsiyyətlər üçün mehrabdır! Sənin buyuruqların yerinə yetirmək sözün gerçək anlamında şəriət yolu ilə getməkdir, səni "Əmirəl-möminin" (Möminlərin əmiri-xəlifə, Rəsulullahın (s) vəsisi, vəlisi) bilmək imanın əslidir, əsasdır).*

İmam Hüseyn (ə) Qasimə şəhadət şərbətinin müjdəsi ilə təsəlli verib dedi: "Ey Qasim, bir dəxi dövləti-didar qənimətdir, hərəmsərayə varıb, Əhli-beyt ilə rəsmi-müvadəə tazə qıl" (Ey Qasim, bir daha görüş qisməti qənimətdir, odur ki, xeymələrə gedib Peyğəmbər xanədanının qız-gəlini ilə yenidən vidalaş).

Qasim Əhli-beytin (ə.m) yanına gedir, bu zaman ərus (təzəgəlin, həyat yoldaşı) otağından çıxır, Qasimin ayağından öpməklə şərafətə qovuşaraq növhələr oxuyur, Qasim də ona təsəlli verib, yenidən meydana qayıdır, ancaq ürəyinin dərinliyində məhəbbət alovu gurlaşdığından deyir:

*Nədir ey çərxi-zalim, yari-yarindən cüda qılmaq,*
*Murad əhlin əsiri-dami-bidadü bəla qılmaq?!*
*Çü lazımdır sənə qılmaq cüda hər yarı yarindən,*
*Çəkübzəhmət nə lazım bir-biriylə aşina qılmaq?!*

*(Ey zalım çərxi-fələk, sevgilini sevgilisindən ayrı salmağın hikməti nədir? İstəkliləri zülmə və bəla toruna salmaq səndə nə adətdir axı? Hər sevgilini sevgilisindən ayırmaq sənə gərəkdirsə, bəs onda niyə zəhmət çəkib onları bir-birinə sevdirdin?) [9, s.351–356].*

Yezid qoşununda olanlar rəvayət edirdilər ki, döyüş meydanına həddi-büluğa çatmamış, üzü bədrlənmiş Ay kimi yaraşıqlı olan bir yeniyetmə çıxdı. Bədəninin ölçüsünə uyğun gələn zireh olmadığı üçün, döyüşə adi libasda, zirehsiz çıxmışdı. Hətta ayaqqabısının bir tayının bağı qırılmışdı. Bu yeniyetmə İmam Həsənin (ə) yadigarı Qasim idi. Qasim döyüş meydanına düşməni lərzəyə salan rəcəzlə (döyüş şeri) girdi. Deyirlər ki, yaşının azlığına baxmayaraq, əsil igidlərə yaraşan şücaətlə vuruşmuş və xeyli adamı cəhənnəmə vasil etmişdi. Sonda arxadan vurulan bir xain zərbənin nəticəsində yerə yıxıldı. Onlardan biri xəncərini sıyırıb yaxına gəldi ki, Qasimin başını kəssin. Taqəti üzülmüş Qasim əmisini harayladı. İmam Hüseyn (ə) özünü meydana yetirəndə düşmən əsgərləri pərən-pərən oldular. Qasimin başını kəsmək istəyən cəllad İmamla (ə) savaşmağa cəhd göstərəndə, o həzrət bir zərbə ilə qolunu biləkdən üzdü. Həmin məlun öz tərəfdarlarının atlarının tapdağı altında qalıb cəhənnəmə vasil oldu.

İmam Hüseyn (ə) Qasimi bağrına basanda o, hələ sağ idi. Deyirlər ki, ağrının şiddətindən ayaqlarını yerə vururdu. Nəhayət, əmisinin qolları arasında ruhunu Allaha təslim etdi. İmam Hüseyn (ə) Qasimin cənazəsini çiyninə alıb xeymələrə sarı gətirdi, Əli Əkbərin nəşinin yanında yerə qoydu.

Belə bədii parçaların tərənnümü ilə digər sənətkarlarımızın yaradıcılığında da rastlaşırıq:

*Yezidi bihəyalar çəkdi cümlə ləşkəri,*
*Oxladılar təşnələr məşqi ələmpərvəri.*

*Öldürdülər Qasimimi, susuz Əli Əkbəri,*
*Anası Ümmi Leyla nalandı, ya Muhəmməd.*
*Gəl gör Kərbübəlada nə qandı, ya Muhəmməd,*
*Həyalı Zeynəb balan üryandı ya Muhəmməd [17].*
*(Aşıq Əhməd Rüstəmov)*

***

*Damad otaği hicreyi-əlvani-nov ərus,*
*Olmuş əcəb səfayi-çəmənzari-Kərbəla.*
*Həsrətdü imdi də baxırı toy otağinə,*
*Nakam ölən o Qasimi-sərdari-Kərbəla [7, s.22].*
*(Qumri Dərbəndi)*

***

*Söylə gətirmə Qasimi, qatili eyləyir şitab,*
*Toyda olur yəqin onun qanına əlləri xizab.*
*Görmə rəva ki, Şimri-dun, din evin eyləsin xarab,*
*Rəhm eləsin o Zeynəbi-bəxti-qarayə, gəlməsin.*

*Badi-xəzan əsər sənin qönçəsifət əyalına,*
*Rəhm elə, yavərim Hüseyn, Qasimi xoşməqalına,*
*Cami-təsəddüq eylədim, Əkbərimə, camalına,*
*Sağ ola ol İmam Hüseyn ğəm üsəraya gəlməsin.*

*Fətimənin kənizi, bu qissəni eylə kim tamam,*
*Bir-birə dəydi mərdü zən, şurə gəlübdü xasü am,*
*Növhə edər bu Natəvan, ruzi-şəb ağlayar tmüdam,*
*Tapmasa bir dəri-nicat, dar-bəqayə gəlməsin.*
*(X.B.Natəvan)*

“Verilən nizama bağışla məni”, sonuncu misra aşığın bü üç şəxsiyyəti ustalıqla eyni qayə ətrafında birləşdirməyi bacardığını göstərir.

Tilavətin beşinci bəndində ustad aşıq yazır:

*Sənin rəhmin çoxdu ey kani-kərəm,*
*Günahkar bəndənəm, mədəd istərəm.*
*Əta qılsan, bir zəlilə nökərəm,*
*Oxunan kəlama bağışla məni! [3, s.26].*

Zənnimizcə, şair “bir zəlil” dedikdə İmam Zeynalabidini (ə) nəzərdə tutmuşdur.

İmam-Zeynalabidin (ə) – hicrətin 38-ci ili Şəban ayının 5-i Mədinə şəhərində ***“Siffeyn”*** müharibəsi davam edən vaxt dünyaya gəlir, Müaviyyənin ağır cinayətlər törətdiyi vaxtda boya-başa çatır. Müaviyyənin Əlinin (ə) tərəfdarlarını öldürməsi, o Həzrətə (ə) nəlayiq sözlər deməsi, Kərbəla faciəsi və özünün əsir düşməsi və hər an ölümlə üzləşməsi kimi hadisələrlə qarşılaşır. İbni Ziyadın Yezidin məclislərində müsəlmanlara verilən əzab-əziyyətləri öz gözləri ilə görür.

İmamın (ə) bir sıra ləqəbləri olmuşdur ki, onlardan məşhurları bunlardır: Səccad, Zeynəlabidin, Seyyidüs-Sacidin, Zəki, Əmin və Züs-Səhənat.

Bu ləqəblərdən ən çox cəmiyyətdə ikisinə üstünlük verilir: Səccad (ə) və Zeynəlabidin (ə).

5-ci İmam Məhəmməd Baqirdən (ə) soruşdular ki: ***“Nə üçün İmama (ə) Səccad deyirlər?”***

İmam Məhəmməd Baqir (ə) belə cavab verdi: “Atam İmam Zeynəlabidin (ə) hər vaxt ilahi nemətlərdən hansı

birini yadına salırdısa, səcdə edirdi. Atam Qurani-Kərimin səcdəsi olan ayələrindən istər vacib olsun, istərsə də müstəhəb, hansını oxuyurdusa, səcdə edirdi. Həmçinin hər vaxt namaz qılıb qurtarırdısa, səcdə edirdi və hər vaxt iki nəfərin arasında sülh yaradırdısa, səcdə edirdi. Xülasə, çoxlu səcdə etdiyi üçün alnında səcdə yeri qalmışdı. Bu səbəbə görə o Həzrətə **"Səccad"**, yəni ***"çoxlu səcdə edən şəxs"*** deyirdilər".

Bəs nəyə görə Zeynəlabdin deyirdilər?

***"Zeynəlabidin"*** (ə) ləqəbinə gəldikdə isə bu sözün mənası "***İbadət edənlərin zinəti"*** deməkdir. Peyğəmbər (s) buyurub: "Qiyamət günü carçı nida çəkəcək ki, Zeynəlabidin hardadır? Mən elə bil, Əli İbn Hüseyni (Zeynəlabidini) cərgələrin arasında gəzən görürəm".

Kərbəla hadisəsi baş verən zaman İmam Zeynəlabidinin (ə) 23 yaşı var idi.

Təəssüflə qeyd etməliyik ki, bəzi mənbələrdə 4-cü İmam (ə) daim xəstə kimi yad edilir və bununla da camaatın fikrində o, çox zəif, əldən düşmüş, saralıb solmuş şəxs kimi canlanır. Halbuki, əslində belə deyil, çünki İmam (ə) ancaq Kərbalada, çox qısa müddətdə xəstə olmuşdur. Faciədən sonra sağalmış və təxminən 35 il digər İmamlar (ə) kimi sağlam bədənlə fəaliyyət göstərmişdir. Şübhəsiz ki, o Həzrətin (s) Kərbala hadisəsindəki müvəqqəti xəstəliyi Allahın bir məsləhəti idi. Belə ki, İmam (ə) bu vasitə ilə cihad vəzifəsindən azad olmuş və Yezidin muzdurlarının ölüm təhlükəsindən amanda qalaraq İmamət xəttini davam etdirmişdir. Əgər xəstələnməsəydi, gərək cihadda iştirak edəydi və bu təqdirdə də atasının digər oğul və dostları ki-

mi şəhid olar və beləliklə də, İmamət nuru birdəfəlik sönərdi.

İmam Səccad (ə) çətin və acınacaqlı əsirlik müddətində əsirlərin ümid və pənah yeri olmaqla yanaşı, həmçinin düşmənə qarşı şücaət və vüqarla hərəkət etmişdir. Eyni zamanda Kərbala şəhidlərini də o dəfn etmişdir.

İmamın (ə) həyatının parlaq cəhətlərindən biri də, acınacaqlı və zülmlə dolu mühitdəki ictimai xidmətləridir. Bu xidmətlər istər "Hirrə" faciəsi zamanı kimi Mədinənin böhranlı və qarışıq günlərində, istərsə də kimsəsiz və miskinlərin nəvazişə ehtiyaclı, onlara tərəf lütf, mərhəmət əli uzadılması intizarında olduqları sakit günlərdə, o Həzrətin (s) ömrünün sonunadək davam etmişdir. İmam Səccadın (ə) həyatında eyni zamanda qul azad etmək məsələsi o qədər genişdir ki, onu yalnız böyük hesablamalarla deyil, bu işdə ali məqsədlərin varlığı ilə izah etmək mümkündür. Bu sahəyə diqqət yetirilsə aydınlaşar ki, Həzrət (s) bu işə insani-tərbiyəvi məqsədlə yanaşmışdır. Yəni o, qulları alaraq onları bir müddət təlim-tərbiyə etdikdən sonra azad edirdi. Onlar isə öz növbəsində cəmiyyət arasında nümunə kimi mədəni və tərbiyəvi fəaliyyət göstərir və azad olduqdan sonra da, İmamla (ə) əlaqəni kəsmirdilər.

Bir nəfər İmam Saccada (ə) dedi: ***"Yəbnə Rəsuləllah (s) gecəni necə keçirdin?"***

O Həzrət (ə) cavabında buyurdu: "Gecəni bir halda keçirdim ki, məndən səkkiz şey tələb olunurdu: Allah məndən vacibatı, peyğəmbər (s) öz sünnəsini, əhli-əyalım məişətin təmin olunmasını, həvayi-nəfs şəhvəti (qane etməyi), şeytan günah iş görməyi, gözətçi mələklər (Rəqib və Ətid) düzgün əməli, Mələkul-movt (Əzrayıl) ruhumu, qəbr isə

cəsədimi tələb edirdi. Mən də bu işlərin arasında onlara tələbkar idim”.

İmam Səccad (ə) hicrətin 94–95-ci ili dövrünün xəlifəsi tərəfindən zəhərlənərək şəhadətə qovuşmuşdur, mübarək məzarı ***“Bəqi”*** qəbirstanlığındadır.

Bu motivlə biz digər sənətkarların əsərlərində də rastlaşırıq:

*Bar-ilahi köməkidir daim doğru abidin,*
*Gecə-gündüz fikri-zikri həqqi gəzər abidin.*
*Dördüncü imamımız da İmam Zeynəlabidin,*
*Beşincini mən söyləyim, çağıraq mərdanı biz [10, s.119].*
*(Xəstə Qasım)*

***

*Həsən əl-Müctəba aləmə rəhbər,*
*Hüseyni-şəhiddi şafeyi-məhşər,*
*İmam Zeynalabdin dilimdə əzbər,*
*Qoyma darda mən zəlili müztəri [6, s.46].*
*(Aşıq Ələsgər)*

***

*Bahar olcaq dağlar geyər abi din,*
*Din içində din bəsləmiş abidin.*
*Dördüncü imamımız Zeynalabdin,*
*Beşinci imamı xəbər al, deyim [11, s.50].*
*(Daşkəndli şair Məmmədhüseyn)*

Ustad aşıq tilavətin növbəti bəndində yazır:

*Özün yaradıbsan ya qadir Allah,*
*Əlacsız bəndənəm, çəkirəm mən ah,*
*Səndən qeyri kimə aparım pənah,*
*Bu gələn əyyama bağışla məni! [3, s.26].*

Bu bənddən bilinir ki, aşıq yavaş-yavaş tilavəti yekunlaşdırmaq istəyir. Ancaq Novrəs İman bunu da ustalıqla etmişdir. Belə ki, birinci və ikinci misralarda bəndə-Allah münasibətlərinin önə çəkilməsi bəndəçiliyin Kərbəla şəhidləri ilə qırılmaz bağlılıq təşkil etməsi fikrini doğurur. Aşığın özünü "bu gələn əyyama" bağışlatmaq istəməsi Məhərrəm ayının ilk on gününə işarədir.

Bu baxımdan M.Füzulinin:

*Mahi Məhərrəm oldu məsərrət haramdır,*
*Matəm bu ayda Şəriətə bir ehtiramdır*

– beyti ilə səsləşir,

Qurani-Kərimin "Fəcr" surəsində oxuyuruq: "Vəl-fəcr" – "And olsun dan yerinə"; "Vələyalin əşr" – "And olsun on gecəyə". Bu ayənin barəsində müxtəlif şərhlər verilib. Cabir ibn Abdullah Ənsari nəql edir ki, bu ayədə "On gecə" dedikdə Zilhiccə ayının birinci ongünlüyü nəzərdə tutulur. Çünki, həmin vaxt bütün dünya müsəlmanları bir yerə (Məkkədə – "Kəbə" Evinə) toplaşır və geniş bir siyasi birlik, həmrəylik nümayiş etdirirlər. Başqa təfsirçilərin fikrincə isə "on gecə" dedikdə mübarək Ramazan ayının axırıncı ongünlüyü nəzərdə tutulmuşdur ki, "Qədr" gecəsi də də onların sırasındadır. Başqa bir qrup təfsirçilər isə bu günlərin Məhərrəm ayının ilk ongünlüyü olduğunu iddia etmişlər. "On gün" anlayışını necə təfsir edirlərsə etsinlər,

həmin günlərin son dərəcə böyük əhəmiyyətə malik olduğunu göstərir. Çünki, həyatda hər adi şeyə and içmirlər, ən gərəkli müqəddəs şeylərə and içirlər. Demək, and içilən bu "On gün" çox mühüm bir mənaya malikdir. Quranın batini mənalarına işarə edən bəzi hədislərdə "Fəcr" – İmam Mehdi Sahib-əz-Zamana (əc.f) "on gecə" – ondan əvvəlki on imam, "Cüt-İmam Əli (ə) və Həzrəti-Zəhra (s.ə), tək-Peyğəmbər (s)" kimi yozulmuşdur [2, s.593].

Şair tilavətin qıfılbəndini bu misralarla tamamlayır:

*Biçarə İmanam, çoxdu üsyanım,*
*Qalmışam müşküldə əriyib canım.*
*Tövbə, bəd əməldən, qadir Sübhanım,*
*Gələcək cəzama bağışla məni! [3, s.100].*

Çox güman ki, aşıq bu bənddə Həzrəti-Məhəmmədin (s) "Kim Kərbəla şəhidlərinə ağlasa, yaxud ağlatsa onun üçün Cənnət vacibdir" hədisinə işarə etmişdir. Bu da Kərbəla vaqiəsinin Novrəs İmanın yaradıcılığında təsadüfi yer tutmadığını göstərir.

**Ədəbiyyat:**

1. Qurani-Kərim. (Ərəb dilindən tərcümə edənlər: Z.M.Bünyadov, V.N.Məmmədəliyev). Bakı, 2005
2. Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017
3. Novrəs İman. "Seçilmiş əsərləri". (toplayıb tərtib edəni: İslam Ələsgər). Bakı, "Səda", 2004

4. Ayətullah əl-üzma Nasir Məkarim Şirazi. "İmamət Haqqın dili ilə". (Tərcümə edən: Rza Şükürov). Bakı, 2010
5. "Nəhcül-Bəlağə" (toplayanı: Seyyid Rəzi; tərcümə və şərh, 2 cilddə). Bakı, 2017
6. Aşıq Ələsgər. Əsərləri, dastan-rəvayətlər, xatirələr. Bakı, "Şərq-Qərb", 1999
7. Qumri Dərbəndi. "Kənzül-məsaib". Bakı, "Boz Oğuz", 1999
8. "Ələsgər ocağı". Şeirlər. (toplayanı və tərtib edəni: İslam Ələsgər). Bakı, "Yazıçı", 1991
9. Vərağa Almasov. "İmam Hüseyn aşiqi Füzuli". Bakı, "Bestpack", 2016
10. Xəstə Qasım. Bakı, "Folklor İnstitutu", 2010
11. Şair Məmmədhüseyn. "Nur çeşməsi". Bakı, "Elm və təhsil", 2018
12. Famil Şirvanov, Təbriz Qasımov. "İslamda olanlar olduğu kimi". Bakı, "Zərdabi LTD", 2018
13. Hacı Ələmdar Mahir. "Füzuli qəzəllərinin şərhi". 3 cilddə. I cild, Bakı, "Elm və təhsil", 2012
14. Raci. "Seçilmiş əsərləri". Bakı, "Sabah", 1992
15. Hacı Həsən Hüseyni. "Əhli-beyt (ə) aşiqi Dədə Ələsgər". Bakı, "İmza", 2022
16. Hacı Həsən Hüseynov. "Sığın Haqq dərgahına", (məqalələr toplusu-I). Bakı, "Nərgiz", 2013
17. Aşıq Əhməd Rüstəmov. "İtən sazım". Bakı, 1997
18. Haşım bəy Saqib. "Divan". Bakı, "Nurlar", 2009
19. Məhəmməd Füzuli. "Seçilmiş əsərləri". I cild.
20. Məhəmməd Füzuli. "Seçilmiş əsərləri". VI cild.
21. Axund Hacı Soltan Hüseynqulu oğlu. "Gizli xəzinələrdən incilər". Bakı, "Tural-Ə" NPM, 2002
22. Axund Hacı Soltan Hüseynqulu oğlu. "Yaşamaq, yaşatmaq, yaratmaq". Bakı, "Ozan", 1998

***Mərdlərin mərdisən vəliyyi-xuda,***
***Ərənlər sərvəri, şiri-sücayət.***
***Rəhmani rəhimsən, Cabbari Cəlil,***
***Dilimdə şəninə çoxdur hekayət.***

***Ləngəri cahansan, ərşin mayağı,***
***Ərzimn məhvərisən, meracın tağı,***
***Ruzi qiyamətdə məhşər otağı,***
***İftida verənsən dosta şəfahət.***

***Nuri münəvvərdi hüsnü-hilalın,***
***Kərəmdə nadirsən yoxdur misalın.***
***Ölüm qabağında, alım vüsalın,***
***Mədəni səxavət, kani-kəramət.***

***Ələmlə dağıtdın bürcü Xeybəri,***
***"Ya mənhu" deyəndə böldün Əntəri.***
***İşarət eylədin, gün döndü geri,***
***Əlrəhman eylədi sənə ziyarət.***

***Layiqi cəzayam, cümleyi-cahan,***
***İndi əməlimdən olmuşam peşman.***
***Düşmüşəm qürbətə ya qədri sübhan,***
***Rəhm qıl Məzahirə, göstər inayət.***

# BORSUNLU MƏZAHİR DAŞQIN: MƏRDLƏRİN KÖMƏYİ ƏLİDİR!

*Bismillahir-Rəhmanir-Rəhim!*
*Ya Allah ya Rəsul ya Əli səndən mədəd!*

Özlüyündə çox yaxşı haldır ki, aşıq-ozan sənəti XX əsrdə də özünün möhkəm ənənlərini davam etdirmişdir. Məzahir Daşqının Novrəs İmana həsr etdiyi "Ustadıma" rədifli qoşması buna parlaq misaldır.

Məzahir Daşqın 1909-cu ilin payızında Tərtər rayonunun İncə Borsunlu kəndində anadan olmuşdur. Kiçik yaşlarından aşıq yaradıcılığına güclü meyl göstərir. İbtidai məktəbi kənddə bitirdikdən sonra Bakıda fəhlə-gənclər məktəbində təhsilini davam etdirir. Son kursda ikən atası həbs olunduğuna görə məktəbdən çıxarılır (1925). Taleyini Gəncə ilə bağlayır, "Qızıl Gəncə" jurnalında şeirlərini çap etdirir.

Gənc Məzahir bir müddət Qasım İsmayılovda (indiki Goranboy) yaşamış (iyirminci illərin sonu), burada Novrəs İmanla görüşmüşdür. Yığıncaqda Məzahirin oxuduğu şeirlər Novrəs İmanın xoşuna gəlir. Elə buradaca el sənətkarı Məzahirə deyir:

– Məzahir, sənin gözəl təbin var, şeirlərin təravətlidir, sinədən gəlir. Səndən gələcəkdə gözəl şair gözlənilir. Elmin də xoşuma gəldi. Görünür şəriət bilikləri ilə də aşinasan.

Bu söhbətdən sonra Məzahir həmin şeiri söyləyir.

Novrəs İman Məzahirin dərin biliyini tərifləyir, onun sənətinə yüksək qiymət verir.

Novrəs İman gümanında yanılmamışdı. Şeirin misralarındakı baş hərfləri alt-alta düzəndə aşağıdakı cümlə alınır:

– Mərdlərin köməyi Əlidir.

Şair Səməd Vurğunla şəxsi tanışlıqdan sonra təhsilini davam etdirməyə imkan tapır.

İkinci Dünya müharibəsi başlayanda ordu sıralarında könüllü xidmət edir (1941). Sovet qoşunları tərkibində İranda olarkən Aşıq Hüseyn Cavanla tanış olur, şair aşıq Səyyahla deyişir, Gülgəzin məclislərində iştirak edir. Onun "İran səfəri" şeirlər silsiləsi bu zaman yaranır.

Məzahir Daşqın 1942-ci ildə Krım cəbhəsində ağır döyüşlərdə əsir alınır, ölüm düşərgələrində işgəncələrə məruz qalır. Şimali Afrikada və İtaliyada olur.

1945-cı ildə vətənə qayıtmaq imkanı tapsa da, onu doğma Vətənə buraxmayıb həbs edir, Sibirə sürgünə göndərirlər. 24 mart 1956-cı il tarixli fərmana əsasən ona bəraət verilir. M.Daşqının azad olunmasında Səməd Vurğunun xeyirxah rolu olmuşdur. Böyük şair M.Daşqına "Aşıq qardaşıma" adlı şeir də həsr etmişdir.

Azərbaycan SSR xalq yaradıcılığı evində ştatdankənar metodist (1956–1960), sonra ömrünün axırınadək Gəncə rayonlararası xalq yaradıcılığı evində folklor şöbəsinin müdiri vəzifələrində çalışmışdır.

1946-cı ildən sonra təqiblərə məruz qaldığından öz şeirlərini "Daşqın" təxəllüsü ilə çap etdirmişdir.

1979-cu il oktyabrın 31-də vəfat etmiş, Borsunlu kəndində dəfn olunmuşdur.

***

Sözügüdən şeir Həzrəti-Əlinin (ə) vəsfindədir:

*Mərdlərin mərdisən vəliyyi-xuda,*
*Ərənlər sərvəri, şiri-sücayət.*

*Rəhmani rəhimsən, Cabbari Cəlil,*
*Dilimdə şəninə çoxdur hekayət [4, s.97].*
*(Borsunlu Məzahir Daşqın)*

Bəllididr ki, istər klassik kitab, istərsə də folklor danışıq üslublu poeziyada Həzrəti-Əli (ə) mərd kişilərin şahı kimi dönə-dönə tərənnüm olunmuşdur:

*Şah Xətai, özün qırma,*
*Gerçəklər könlünü qırma.*
*Hər adama sirrin vermə,*
*Əliyə Səlman olasan [7, s.51].*
*(Ş.İ.Xətai)*

***

*Yari-Səlmanü xaceyi-Qənbər,*
*Valiyi-rövzə, saqiyi-kövsər![18, s.238].*
*(M.Füzuli)*

*(Həzrəti-Əli (ə) Səlmanın dostu, Qənbərin isə ağasıdır (bunlar onun dünya dostlarıdır). Ancaq onun daha böyük nemətləri axirətdə cənnət və cənnətdəki Kövsər bulağıdır. Belə ki, bu cənnətin idarəedicisi, Kövsər bulağının isə suyunu paylayandır) [17, s.324].*

*Dəşti-Ərjəndə çü etdi şir Səlmanı əsir,*
*Acizü biçarə qaldı tapmadı bir dəstgir.*
*Üz tutub dərgahi-həqqə ağladı ol mərdi-pir,*
*Zahir oldu onda birdən şahsüvari-şirgir:*
*Şahi- Mərdan, şiri-Yəzdan, Heydəri Düldülsəvar,*
*La fəta illa Əli, la seyfə illa Zülfüqar [19, s.123].*
*(S.Ə.Nəbati)*

***

*Sənsən intizarda qoyan İmanı,*
*Sirri-xab içində, ya Kərəm kanı.*
*Musa səndən aldı elmi-Xudanı,*
*Ondan sonra getdi Turi-Sinaya [3, s.86].*
*(Novrəs İman)*

***

*Gəlməmiş dünya üzünə, Salmanı aldın şirdən,*
*Tifl ikən mərcə girdin, pünhan oldun Xızırdan.*
*Gəzəndə çeşmə başında, sən zahir oldun birdən,*
*Xəbər aldı İlyas səndən, gəldin hardan, Ya Əli?*
*[20, s.75].*
*(Bəhmən Göyçəli)*

Göründüyü kimi Məzahir Daşqın da öz qoşmasına bu möhkəm ənənə ilə başlayır. Belə ki, el şairi ağasının bu keyfiyyətini hərtərəfli şəkildə qələmə alır. "Mərdlərin mərdi", "ərənlərin sərvəri", "şiri-şücaət" bunun bariz təzahürüdür.

İlk iki misrada əksini tapan cəhətlərdən biri də "vəliyyi-Xuda" deyimində verilən Həzrəti-Əlinin (ə) övliyalıq kəramətinin tərənnümüdür. Bu keyfiyyətlər də ədəbiyyatımızda öz layiqli yerini almışdır.

*Dar günümdə yetiş dada, Ya Şahı-Mərdan ağa!*
*Nitq ver, meydan içində, Qoyma sərgərdan, ağa!*
*Həm Əlisən, həm Vəlisən, Həm səxisən, həm səxa,*
*Həmi dildə zikrim sənsən, Həmi əzbərdən, ağa*
*[8, s.190].*
*(Aşıq Ələsgər)*

***

*Sən Ağ Divin bəndin çatdın, onu saldın zindana,*
*Məhd içində şimşək çaxdı, Əjdər boyandı qana.*
*Musaya kəlmə öyrətdin getdi Turi-Sinaya,*
*Cəbrailə ustad oldun yanan nardan, ya Əli!*

*[20, s.75].*
*(Bəhmən Göyçəli)*

***

*Əs-səlam, ey Şahi-Mərdan əs-səlam,*
*Əs-səlam, ey Şiri-Yəzdan əs-səlam [21, s.44].*
*(S.İ.Nəsimi)*

*(Ey mərd kişilərin hökmdarı olan Həzrəti-Əli (ə), sənə salam olsun, Sənə salam olsun, ey Allahın Şiri!).*

***

*"Şahi-Mərdan"ın, Əlinin aliyəm, övladiyəm,*
*Zülfüqarü tacü Düldül, uş bu nişan məndədir*
*(Ş.İ.Xətai) [22, s.52].*

***

*Bu Xətainin günahın sən götürmə üzünə,*
*Şahi-Mərdan, Şiri-Yəzdan, sirri-sübhanım mədəd.*
*(Ş.İ.Xətai) [22, s.44].*

***

*Mən əzəldən nuri-paki Mustafanı sevmişəm,*
*Şahi-Mərdan, Şiri-Yəzdan Mürtəzanı sevmişəm.*
*(M.Füzuli) [23, s.306].*

***

*Yüz məşəqqət çəksə kami-dil tapar əncami-kar,*
*Hər kimin aləmdə mövlası Şəhi-Mərdan olur.*
*(M.Füzuli)*

***

*Seyyida, sən eylə daim Şahi-Mərdan vəsfini,*
*Şahi-Mərdan çeşmüvi məşhərdə giryan istəməz*
*(S.Ə.Şirvani) [10, s.260].*

***

"Şiri-davər, ismi-Heydər, Şahi-Mərdan, ya Əli!"; "Yazıq bu Novrəs İmanın dilinin əzbərisən, darda qalıb yetiş dada Şahi-Mərdan, ya Əli!" [3, s.146]; "Damandayam, dada yetiş, Şahi-Mərdan, ya Əli!" [20, s.74]; "Dar günümdə dadıma yet, ya Şahi-Mərdan, mənim!" [24, s.85]; "Qolu bağlı bir nökərsən Şahi-Mərdan Əliyə" [25, s.158].

Bu keyfiyyətlərin ədəbiyyatımızda geniş yer tutması ötəri hal deyildir. Çünki, bu keyfiyyət Qurani-Kərimdə də mövcuddur:

"İnnəmə vəliyukumullahu və Rəsuluhu vəlləzinə əmənu əlləzinə yuqimunəs-səlatə və yutunəz-zəkatə vəhum rakiun" – "Sizin rəhbəriniz yalnız Allah, onun Rəsulu və iman gətirib namaz qılaraq rüku halında zəkat verən şəxslərdir" ("Maidə", 55).

Ayənin şəni-nüzulu belədir:

İmam Əbu-İshaq Sələbi "Əl-Kəbir" adlı təfsirində Əbuzər Qəffaridən belə nəql edir: "Mən bu iki qulağımla eşitdim – yalan desəm, hər ikisi də kar olsun – və bu iki gözümlə gördüm – yalan desəm, hər ikisi də kor olsun ki,

Həzrəti-Peyğəmbər (s) belə buyurdu: "Əli möminlərin rəhbəri, kafirləri öldürəndir. Ona kömək edən (Allahdan) kömək görər, onu yalqız buraxan (Allah tərəfindən) yalqız buraxılar." Bilin ki, mən Həzrəti-Peyğəmbərlə (s) birlikdə namaz qıldığım bir gün bir sail məsciddə xalqdan yardım dilədi. Amma heç kim ona bir şey vermədi. Həzrəti-Əli (ə) isə ruku halında idi, üzük olan orta barmağını sailə tərəf uzatdı. Həmin sail gəlib Əlinin (ə) barmağındakı üzüyü çıxartdı. Bu vaxt Həzrəti-Peyğəmbər (s) Allaha yalvararaq belə dua etdi: "Ey Allahım! Qardaşım Musa sənə dua edərək dedi: "Ey Rəbbim, mənim köksümü aç, işimi asanlaşdır, dilimdəki düyünü aç ki, sözümü başa düşsünlər və mənim öz əhlimdən olan qardaşım Harunu mənə köməkçi et, onunla qüvvətləndir və onu mənim işimə şərik et ki, sənə çoxlu təsbih və zikr edək. Heç şübhəsiz, sən bizim (halımızı) ən yaxşı görənsən." Sən isə ona: "Ey Musa, dua qəbul edildi və istəyin verildi" – deyə vəhy etdin. Ey Allahım, mən də sənin bəndən və Peyğəmbərinəm; Sən mənim də köksümü aç, işimi asanlaşdır və mənim öz əhlimdən olan Əlini (ə) mənə vəzir (xəlifə, köməkçi) təyin et, onunla məni qüvvətləndir".

Əbuzər (ə) sözünə belə davam edir: "Allaha and olsun ki, hələ Peyğəmbər (s) sözünü qurtarmamışdı ki, Cəbrail (ə) nazil olub bu ayəni gətirdi: "Sizin vəliniz, rəhbəriniz ancaq Allah, onun elçisi və namaz qılarkən ruku halında zəkat verən möminlərdir".

Hər kim Allah, onun elçisi və möminlərlə dostluq etsə, bilsin ki, Allahın firqəsi qələbə çalacaqdır" ("Maidə", 56).

Sünnülərin "Sihah" və "Müsnəd" kitablarında nəql etdikləri rəvayətlərdə aydın şəkildə qeyd olunur ki, bu ayə Əlinin (ə) öz üzüyünü ruku halında sailə (fəqirə) verdiyi za-

man nazil olmuşdur. Peyğəmbərin (s) zamanında yaşayan və gözəl təbə malik olan şair Həssan İbni-Sabit bu hadisəni belə nəzmə çəkir. Şeirin sətri tərcüməsi belədir:

"Sən o kəssən ki, ruku halında bəxşiş etdin, canlar sənə fəda olsun, ey ruku edənlərin ən yaxşısı! Allah ən yaxşı vilayəti sənin barəndə nazil etdi və onu şəriətin xələl yetməyən hökmlərində bəyan etdi."

Bu ayənin şəni-nüzulu ilə əlaqədar olan sənədlər həddindən artıq çoxdur.[1] [16, s.273–275].

Bu ayənin nazil olma şəni haqqında deyilir: Peyğəmbər (s) məscidinə bir sail (dilənçi) daxil oldu. O, xalqdan kömək istədi. Kimsə ona bir şey vermədi. Həmin vaxt namaza məşğul olan Həzrəti-Əli (ə) rüku halındaca ayə nazil oldu.

Bu əhvalatı Həzrəti-Peyğəmbərin (s) İbn-Abbas, Əmmar Yasir, Cabir ibn Abdullah, Əbuzər, Ənəs ibn Malik, Bilal kimi on səhabəsi nəql etmişdir. Uyğun ayənin nüzul şəninə münasibətdə şiə və sünnilər yekdil fikidədirlər.

Əmmar Yasir deyir: "Namazda üzük infaq edildikdən və ayə nazil olduqdan sonra Həzrəti-Peyğəmbər (s) buyurdu: "Mən kimin mövlasıyamsa, Əli də onun mövlasıdır" .

Qədir-Xumda Həzrəti-Peyğəmbər (s) Həzrəti-Əlinin (ə) məqamını bəyan etmək üçün uyğun ayəni tilavət etdi. Həzrəti-Əli (ə) də dəfələrlə öz haqqını bəyan edərkən bu ayəni oxumuşdur. Hadisəyə şahid olan Əbuzər "Məscidül-həram"da uyğun əhvalatı xalqa nəql etmişdir.

İmam Sadiq (ə) buyurmuşdur: "Həzrəti-Əlinin (ə) Qədir-Xumda minlərlə şahidi var idi. Bununla belə, o, öz

---

[1]"Təfsiri-Təbəri". cild 6. səh. 186; "Təfsiri-Beyzavi". cild 1. səh. 345; "ddürrul-Mənsur". cild 2. səh. 293 və s.

haqqını ala bilmədi. Halbuki, bir müsəlmanın iki şahidi olduqda haqqını geri alır!”.

Ayədə “vəliyy” sözü dost mənasını bildirmir. Çünki, dostluq təkcə rüku halında infaq edənlərə yox, bütün müsəlmanlara aiddir.

İmam Sadiq (ə) buyurmuşdur: “O kəslər ki, iman gətirmişlər...” təbirində məqsəd Əli (ə) və onun imam övladlarıdır. Onlar qiyamət gününədək vardırlar. Onun övladlarından kim imamət məqamına çatsa, onun kimi rüku halında sədəqə verər”.

Mərhum Feyz Kaşani “Nəvadır”kitabında bir hədis nəql etmişdir. Bu hədisə əsasən məsum imamlardan hər biri namazda rüku halında fəqirlərə sədəqə vermişlər. Bu əməl ayədəki təbirlərlə uyğundur.

İmam Baqir (ə) buyurmuşdur: “Allah Öz peyğəmbərinə göstəriş verdi ki, Əlinin (ə) vilayət məsələsini bəyan etsin və bu məqsədlə ayə nazil edilmişdir”.

Ən üstün tanıtdırma odur ki, bir şəxsin əlamətləri və xüsusiyyətləri sadalananda qarşı tərəf özü onun kimliyini müəyyənləşdirsin (Ayə Həzrəti-Əlinin (ə) adını çəkmədən onun nişanə və hərəkətlərini sadalamışdır”).

İslam həm vilayət, həm də bəraət (müxaliflərdən üz döndərmə) dinidir. İslamda həm cazibə, həm də dəfetmə var. Əvvəlki ayələrdə yəhudi və məsihilərin vilayətinin qəbulu qadağan edildi (“Maidə”, 51).

Bu ayədə isə buyurulur: “Allahı, Onun Rəsulunu və ruku halında üzüyünü verəni özünüzə rəhbər seçin!”

“Əvliyaukum” sözünün əvəzinə ayədə “vəliyukum” sözünün işlədilməsindən belə bir nəticə çıxarmaq olar ki, Peyğəmbər (s) və Əli (ə) vilayətinin ruhu ilahi vilayət şüasıdır. Vilayətlər çiyin-çiyinə yox, yuxarıdan aşağıya gəlir.

müsəlmanlar üzərində vilayət əvvəlcə Allaha, sonra Peyğəmbərə, daha sonra isə imamlara məxsusdur. Həzrəti-Əlinin (ə) Peyğəmbər dövründə də vilayəti var idi [5, s.80–82].

Biz bu motivlə digər sənətkarlarımızın yaradıcılığında da rastlaşırıq:

*On dörd məsumdur gülümüz,*
*Qeyrisin bilməz dilimiz.*
*Şahi-Mərdandır vəlimiz,*
*Salman ona taya gəldi.*

*Əli mərdlərin mövlası,*
*Silinsin könlümün pası.*
*Behiştin əla libası,*
*Fatimeyi-Zəhraya gəldi.*

*Qasım ağlar zarı-zarı,*
*Var gözə görünməz Tarı,*
*Əli çəkdi Zülfüqarı,*
*Bərbər şəhri raya gəldi [11, s.146–147].*
*(Xəstə Qasım)*

***

*İmamət Əlinin haqqı bilib inan,*
*On bir övladıynan ol Şahi-Mərdan.*
*Vəliyyukumullah ayeyi-Quran,*
*Nisbəti Əhmədi-Muxtar eyləyir [3, s.45].*
*(Novrəs İman)*

***

*Üzük bəxş eyləmişsə sailə ol şəh namaz üstə,*
*Əlində əhli-həqqin hər nə varsa, nəzri-saildir.*
*(M.Füzuli)*

***

*Yeri, döy Əli qapısın, odur ey gədayi-miskin,*
*Kərəmiylə padşahlıq üzüyü verən gədayə.*
*(S.M.Şəhriyar)*

***

*Əlidən özgəni, Xəqani, tutmaram mövla,*
*Unutma, doğru vilayət, Əli vilayətidir.*
*(Xaqani Əmini)*
*[15, s.245].*

Bəllidir ki Allah-təalanın adları Qurani-Kərimdə nadir hallarda da Həzrəti-Məhəmmədə (s) də aid edilir. Mübarik "Tövbə" surəsinin 128-ci ayəsində "Rəuf", "Rəhim" adlarının Rəsulullaha (s) aid edilməsi buna misaldır.

"Ey ümmətim! Sizə özünüzdən bir peyğəmbər gəldi ki, sizin əziyyətə (məşəqqətə) düşməyiniz ona ağır gəlir, o, sizi (sizin iman gətirməyinizi) çox istəyir, möminlərə şəfqətlidir, mərhəmətlidir!" ("Tövbə", 128).

Qoşmanın üçüncü misrasını da bu yöndə qavramaq gərəkdir. Belə ki, el aşığı orada Həzrəti-Əliyə (ə) Allah-təalanın dörd adıyla müraciət etmişdir. "Rəhman", "Rəhim", "Cabbar", "Cəlil".

"Rəhman" – o kəs ki, onun rəhməti bütün bəndələrinə – istər mömin, istərsə də kafirlərə şamildir. Yəni o, bütün bəndələrinə ruzi verəndir. Bu ism də Allahın xüsusi ismlə-

rindən biridir ki, başqa heç kimə aid edilə bilməz [26, s.110].

“Rəhim” – “Əsmaul-hüsna”nın 30-cusudur və yalnız möminlərə rəhm edən mənasındadır. Bu rəhmət xüsusi olub kafirlərə şamil edilmir [26, s.113].

“Cabbar” – Allahın əsmaul-hüsnasında 40-cı ism olub, bu mənadadır ki, heç kimin əli Onun əzəmət məqamına çatmaz və o kəsdir ki, fəqirlərin fəqirliyini və zəiflərin zəifliyini aradan qaldırar və özünü qüdrətli bilənləri sındırar və məhv edər. Əgər bir kəs gündə 21 dəfə bu ismi zikr etsə, sitəmkarların şərrindən amanda qalar [26, s.147].

“Cəlil”– “Seyyid” və “Əzim” mənalarında zikr olunur. Şeyx Bursi buyurmuşdur ki, hər kəs bu ismi çox zikr edərsə xalqın nəzərində vüqarlı və heybətli olar.

“Cəlil” “Cəlal” sözündən götürürlmüşdür və kibriya və əzəmət deməkdir. “Cəlil” o kəsə deyilir ki, bütün qüdrət sahibləri – istər maddi olsun, istərsə də mənəvi, onun qarşısında kiçik və fəqirdirlər.

Cənubi Azərbaycanın Girmanşah vilayətində müqəddəs bir ocaq var. Həmin ocağın xadimlərinin müqəddəs məqbərəsi üzərində mübarək “ər-Rəhman” surəsinin 26 və 27-ci ayələri yazılmışdır:

“Kullu mən ələyhə fəən. Vəyəbqa vəchu Rabbikə zül-Cəlali vəl-İkram” (“Yer üzündə olan hər kəs fanidir, (ölümə məhkumdur): Ancaq Əzəmət və Kərəm sahibi olan Rəbbinin zati baqidir”) (“ər-Rəhman”, 26–27) [26, s.251–252].

Bəs ilahi adların övliyaya aid ediməsi nə dərəcədə doğrudur? Təfərrüata varmadan deyə bilərik ki, bu birincisi övliyalıq baxımından obyektivdir, ikincisi məmduhun adı

"Əli" sözünün Allahın adından (Əliyyul-əla) götürülməsi yönündə özünü doğruldacaqdır.

"Dilimdə şəninə çoxdur hekayət" – dedikdə isə el aşığı həm Həzrəti-Əli (ə) ilə bağlı rəvayətlərin çoxluğuna işarə vura bilərdi, həm də mümkündür ki, o, bu zaman ürəyində məmduhuna bəslədiyi məhəbbətin aşıb-daşmasını nəzərdə tutsun.

El aşığı qoşmanın ikinci bəndində məmduhun vəsfini bir qədər də genişləndirir:

*Ləngəri cahansan, ərşin mayağı,*
*Ərzin məhvərisən, meracın tağı,*
*Ruzi qiyamətdə məhşər otağı,*
*İftida verənsən dosta şəfahət.*

Göründüyü kimi şair burada Həzrəti-Əlinin (ə) altı keyfiyyətini bir araya gətirir:

1. Ləngəri-cahan (dünyanın sabitəşdirilmə amili)
2. Ərşin mayağı – Allaha ən yaxın olan yolgöstərici
3. Ərzin mehvəri – yer kürəsinin istinadgahı
4. Meracın tağı – meracın sütunu
5. Məhşər otağı – İlahi mükafat və cəzada iştirak
6. Dosta şəfaət – möminlərə yardım

Bu keyfiyyətlərlə bağlı yığcam anlayış əldə etməkdən ötrü onlardan biri – "Şəfaət" məvhumu üzərində dayanmaq kifayətdir:

"Şəfaət bir şəxsə arxa durmaq, sahib çıxmaq yardıma möhtac olan, qorunmağa layiq bir kimsə üçün əfv diləmək və onun yaxşılığına çalışmaqdır". Peyğəmbərin (s) Allahın izni ilə həm öz ümməti, həmdə bəşəriyyət üçün uzun-uzadı məhşər sorğu-sualından qurtarmaq məqsədi ilə edəcəyi

şəfaətə Şəfaəti-Kubra yəni (böyük şəfaət deyilir). Abdullah ibn Ömər Rəsulullahdan (s) rəvayət edir ki, qiyamət günü insanlar dəstə-dəstə öz Peyğəmbərlərinin (ə) arxasınca o baş-bu başa aparılacaq və Ulul-Əzim Peyğəmbərlərə "Ya Rəsul şəfaət et!" deyə yalvaracaqlar. Bu şəfaət tələbi İslam Peyğəmbərində (s) başa çatır. Allahın Rəsulullahı (s) Məqami-Məhmuda (s) (həmd edilməli dərəcəyə) təyin edəcəyi gün baş verəcək və məhşərdəkilərin hamısı o gün bu şəfaətinə görə ona minnətdar olacaqlar.

"Məqami-Məhmud" Həzrəti-Məhəmməd Peyğəmbərin (s) və övliyaların toplanacağı sahədə İslam rəhbərinin dayanacağı yerdir.

Allah Həzrəti-Muhamməd (s) ümmətinin yarısının cənnətə girməsi ilə onlara şəfaət etmək arasında seçmək hüququ vermiş, daha ümumi və daha kafi bir xilas yolu olduğundan oda "Şəfaəti-kubra"dan sonra öz ümmətindən zərrə qədər imanı olanların əfvi, cəhənnəmə layiq görülmüş bəzi şəxslərin oda atılmamaları, bəzilərini əzablarının yüngülləşdirilməsi və ya dərhal çıxarılması, bəzi şəxslərin hesaba çəkilmədən cənnətə daxil edilməsi üçün Ulu Yaradandan son iltimasını dilə gətirəcəkdir. Ən nəhayət, Rəsulallah (s) öz səhabələrinin bir çoxunun dərəcələrinin yüksəldilməsi və Əhli-beyti (ə) sevənlərin bağışlanması üçün dua edəcəkdir. Şəfaətə inanmayanlarla, müşriklərin şəfaətdən kənarda qalacağını Peyğəmbər (s) xəbər vermişdir: "Qiyamət günü mənim şəfaətim büs-bütün həqiqətdir və şəfaət bir səlahiyyətdir.

Kim buna inanmazsa, şəfaət əhlindən olmayacaqdır. Hər Peyğəmbərin (ə) qəbul olunması vəd edilmiş bir duası vardır və hər Peyğəmbər (ə) duasını etməkdə tələsmişdir. Ancaq mən ümmətimə şəfaət üçün duamı qiyamət gününə

saxladım, ümmətimdən Allaha şərik qərar vermədən vəfat etmiş hər bir şəxs, İnşəallah bu şəfaətə layiq olacaqdır".

Biz şəfaət motivi ilə biz Xətai və Füzuli yaradıcılığında da rastlaşırıq.

*Bu Xətai xəstəyə qılgil şəfaət ruzi-həşr,*
*Çünki əslindən səninlən aşinadır, ya Nəbi!*
*[22, s.233].*

*(Ey Peyğəmbər (s) qiyamət günündə bu xəstə Xətaiyə şəfaət et. Çünki, onun əsil-nəsəbi son nəticədə gedib sənə çatır, odur ki, sən də onu özünə dost-doğma bil).*

Mövlanə Məhəmməd Füzuli Rəsulullahla (s) bağlı şəfaət barədə belə bir beyt yazmışdır:

*Ol qədər zövqü-şəfaət cövhəri-zatındadır,*
*Kim, gəlir ərzi-xəta mənidə bir ehsan sənə.*

*(Sənin zatının mayasında şəfaət zövqü elə çoxdur ki, suçun dilə gətirilməsi, günahın bildirilməsi sənə yaxşılıq etmək mənasına gəlir) [16, s.282–283].*

Qoşmanın növbəti bəndi məmduhun zahiri və batini gözəlliklərinin tərənnümünə həsr edilmişdir:

*Nuri münəvvərdi hüsni-hilalın,*
*Kərəmdə nadirsən yoxdur misalın.*
*Ölüm qabağında, alım vüsalın,*
*Mədəni səxavət, kani-kəramət.*

Birinci misrada el şairi Həzrəti-Əlinin (ə) qaşlarını yeni doğulmuş aya bənzədir, onu nurlar nuru adlandırır. Əgər bu zaman o, mübarək “Nur” surəsinin 35-ci ayəsindəki “Nurun əla nur” – “O, nur üstündə nurdur...” – ayəsinə söykənmişsə bunu çox uğurlu bir epitet saymaq olar.

“Kərəmdə nadirsən, yoxdur misalın” isə məmduhun misilsiz səxavətindən, əliaçıqlıqlığından söz açır. Bu motivlərlə bağlı istər dini rəvayətlər, istərsə də ədəbi parçalar az deyildir:

*Mənə buta verib Həzrəti-Əli,*
*Nə buyurubsa da demişəm, – “bəli”.*
*Qurbaninin fkri-zikri, xəyali.*
*Axırı mətləbim Pəri xandadır.*

*(Aşıq Qurbani)*

***

*Könlüm istər o Allahı,*
*Dilim Mövla deyə-deyə.*
*İkinci də surullahı,*
*Dilim Mövla deyə-deyə.*

*Zülfüqarı çaldı daşa,*
*Bir cüt ulaq çıxdı qoşa.*
*Əjdahanı başdan-başa,*
*Böldü Mövla deyə-deyə.*

*Dinlə Abbasın səsini,*
*Tökər könüllər pasını.*
*O Xeybərin qalasını*
*Aldı Mövla deyə-deyə.*

*(Aşıq Abbas Tufarqanlı)*

***

*Ərşi-zəmin, lövhi-qələm yox ikən,*
*Varlığa hamıdan tez gələn Əli.*
*Ustadlar ustası özün olubsan,*
*Cəbrail məqamın düz bilən Əli.*

*Sənin hörmətinə quruldu varlıq,*
*Həyatın Zəmzəmi, o suyi-dirlik,*
*Səndə nəqş olundu elm və birlik,*
*Cəmi dillər ilə söz bilən Əli.*

*Xəstə Qasım zərbi-danəndən Əli,*
*Aləmi-zərridə demişəm "bəli",*
*Bir ismin Əlidi, bir ismin Vəli,*
*Cəmi pünhan dərdi tez bilən Əli" [27, s.376].*

*(Xəstə Qasım)*

***

*Ələstü birabbikum qalu-bəladan,*
*Mərdin Mövlasına nökər olmuşam.*
*Sürtmüşəm üzümü xaki-payına,*
*Elm tapıb sinədəftər olmuşam [8, s.126].*

*(Aşıq Ələsgər)*

***

*İbtida ustaddan dərsim almışam,*
*"Ələst" aləmində demişəm "bəli".*
*Həqiqətdən iki gözəl sevmişəm;*
*Birisi Məhəmməd, birisi Əli [8, s.45].*

*(Aşıq Ələsgər)*

***

*Gövhər sözüm məclislərdə yayılı,*
*Arif ondan mətləb qanıb ayılı.*
*Əhli- ibadətlər mömin sayılı,*
*Səxavətin ondan çoxdu savabı [8, s.49].*
*(Aşıq Ələsgər)*

Ustada görə "səxavət" adlanan əzəmətli bir əxlaqi fəzilət var ki, onun adı gələndə hər bir şey kölgədə qalır. Sanki, aşığın nəzərində əliaçıqlılıq və insanlılıq bir-birinə bərabər olan mənəvi-əxlaqi dəyərlər söz yox ki, ustadın bu düşüncəsini formalaşdıran bir çox dini-mənqəbəvi mənbələrimizdir. Məsələn, "Onlar özləri istədikləri (ehtiyac duyduqları) yeməyi kasıba, yetimə və əsirə verərlər. (və deyərlər): "Biz sizi yalnız Allaha xatir yedirdirik və sizdən nə əvəz, nə də bir minnətdarlıq gözləyirik" ("İnsan", 8, 9). Bu ayələr Həzrəti-Əlinin (ə), Həzrəti-Fatimeyi-Zəhranın (s.ə), İmam Həsən (ə.m) və İmam Hüseynin (ə.m) şənində nazil olmuşdur.

"Acları doyurmaq yaxşı insanların ən üstün cəhətlərindəndir". Quranda bu cəhətə çox böyük önəm verilmişdir. Əgər müasir dünyaya nəzər salsaq, yayılan xəbərlərə görə hər il dünyada milyonlarla adam aclıqdan ölür. Halbuki, dünyanın başqa yerlərində zibilliklərə küllü miqdarda yemək tökülür. Bu da islam qanunlarının çox yüksək dəyərlərə sahib olduğunu, dünyanın isə ondan nə qədər uzaq düşdüyünü açıq şəkildə göstərir. Hədislərdə bu məsələyə xüsusi önəm verilmişdir. Hədislərinin birində İmam Sadiq (ə) belə buyurmuşdur: "Bir möminə qarnı doyunca yemək verən şəxsi axirətdə hansı mükafatın gözlədiyini aləmlərin Rəbbi olan Allahdan başqa heç kəs, hətta, Allahın yaxın

mələkləri və peyğəmbərlər də bilməz”. Hədislərdə açıq şəkildə qeyd edilir ki, mömin və müsəlman olmasa belə ac adamları doyurmaq ən yaxşı əməllərdəndir. İslam Peyğəmbəri (s) belə buyurmuşdur: “Allah dərgahında əməllərin ən yaxşısı yanan ciyərləri sərinlətmək, ac qarınları doyurmaqdır. Canım əlində olana and olsun, müsəlman qardaşı gecəni ac yatdığı halda tox yatan bəndə mənə iman gətirməmişdir” [2, s.579]. Həzrəti-Əli (ə) buyurub: “Səxavət hər bir varlığın şərəfidir”. Məna və məzmun baxımından yuxarıdakı ayə ilə səsləşən digər ayələr də vardır: (“Bəqərə”, 261–265; “Münafiqun”, 10; “Ali İmran”, 92).

Lakin, el aşığı ikinci misra ilə doymayıb məmduhun şərəfinə “mədəni-səxavət, kani-kəramət” şəklindəki misralarını da deyir.

Üçüncü misrada aşiqin məşuq yolunda fədakarlığı önə çəkilir.

“Ölüm qabağında alım vüsalın” məna-məzmun tutumu bu baxımdan yalnız Füzulinin Peyğəmbərin mədhində dediyi beytlə müqayisə edilə bilər:

*Vəslin mənə həyat verir, firqətin məmat,*
*Sübhanə xaliqən xələqəl – movtə vəl – həyat*

*(Qovuşmağın mənə həyat verir, ayrılığın ölüm, “məni yaradan pak və müqəddəsdir, ölümü və həyatı yaratmışdır”).*

Bu qəzəl Füzulinin nətlərindəndir. “Nət” – tərif şeirinə, xüsusilə Məhəmməd peyğəmbərin (s) tərifində yazılmış qəzəllərindəndir. Misranın biri bir dildə, o biri isə başqa

dildə yazılan şeir növünə "müləmmə" deyilir. Deməli, bu qəzəl Füzulinin "müləmmə" – nət şeiridir.

Uca Allah Özü gözəl olduğu üçün, yaratdıqlarının da hamısı gözəldir. Bu gözəlliklər təkcə maddi deyil, həm də mənəvi gözəlliklərdən ibarətdir. Biz qarşımızdakı beyti şərh etmək üçün, qovuşmaq və həyatın ziddi olan, ayrılıq və ölüm adlı iki məvhumun gözəlliklərindən danışmaq istəyirik. Vüsal sözü, qovuşmaq, birləşmək deməkdir. Lakin, bu qovuşmaq heç də iki bədənin yaxınlaşması deyil, əksinə, iki ruhun qovuşmasıdır. Belə olan halda, ruhun bədəni tərk etməsi lazım gəlir. Qovuşmaq həsrətilə yaşamağın özü də həyat içində yeni bir həyat yaşamaq olduğuna görə gözəldir. Həyat da, qovuşmaq arzusu ilə dolu olduğuna görə gözəldir. Ayrılıq sonda insanları dünya əzabından qurtaran ölümlə nəticələndiyi üçün gözəldir. Öüm isə aşiqi məşuqunun vüsalına yetirdiyi üçün gözəldir. Bütün bunları nəzərə alan Füzuli demək istəyir ki, ey ulu Peyğəmbər (s) vüsalında həyat, ayrılığında ölüm olmasına baxmayaraq hər ikisi gözəldir, çünki həyatı da, ölümü də pak və müqəddəs olan gözəl Allah yaratmışdır [14, s.310–311].

Qoşmanın dördüncü bəndində məmduhun daha dörd keyfiyyəti bəhs mövzusuna çevrilib:

*Ələmlə dağıtdın bürcü Xeybəri,*
*"Ya mənhu" deyəndə böldün Əntəri.*
*İşarət eylədin, gün döndü geri,*
*Əlrəhman eylədi sənə ziyarət.*

Bu keyfiyyətlər Xeybər qalasının fəthindən, Əntərin məğlub edilməsindən, Allah-təalanın Peyğəmbərin (s) istəyi ilə Həzrəti-Əli (ə) üçün günəşi geri qaytarmasından və

Həzrəti-Əlinin (ə) məxsusi ilahi lütfə nail olmasından ibarətdir.

Xeybər döyüşü Peyğəmbərin (s) Xeybər yahudiləri etdiyi döyüşdür ki, hicrətin 7-ci ili (miladi 629-cu il) Məhərrəm ayında başlayıb Səfər ayında müsəlmanların qələbəsi ilə nəticələnmişdir. Xeybər yəhudiləri Mədinədən qovulmuş yəhudilərə pənah vermələri və bir sıra ərəb qəbilələrini müsəlmanların əleyhinə təhrik etmələri müharibəyə səbəb oldu. Bu müharibədə də müsəlmanlar qələbə çaldılar və bağlanmış müqaviləyə əsasən döyüşdə iştirak edən yəhudilər ailələri ilə birlikdə Xeybər ərazisini tərk etməli idilər. Xeybər Ərəbistanda, Mədinə şəhərinin yaxınlığında kiçik bir şəhərdir. Habelə, Mədinə ilə Levant yolunda keçmişdə 7 qala və təsərrüfatı olan bir sahədir. Bu sahə, hicrətin 7-ci ilində İslam Peyğəmbərinin (s) əmri ilə Həzrəti-Əlinin (ə) tərəfindən fəth edilmişdir.

Xeybərin qalaları bunlardan ibarət idi:

1) Həsni-Naim;
2) Həsni-Təmuz;
3) Həsnül-Səlam;
4) Həsnül-Şəqq;
5) Həsnül-Nətah;
6) Həsnül-Vətih;
7) Həsnül-Kətibə.

Bu qalaların cəminə Xəyabir (Xeybər) deyirlər.

Adları keçən qalalar üstdən aşağıya bir-bir Həzrəti-Əlinin (ə) əli ilə Xeybər döyüşü əsnasında fəth edilmişdi.

Xeybərin fəthindən sonra Həssan ibn Sabit kimi bəzi şairlər bu qəzvə haqqında şeirlər yazdılar. Həssan ibn Sabitin Xeybərin fatehi İmam Əli (ə) haqqındakı şeiri belədir:

“Əli göz xəstəliyindən əziyyət çəkirdi,

Onu müalicə etmək üçün vasitə axtararkən heç nə tapılmamışdır.

Allah Rəsulu (s) onu ağzının suyu ilə yaxşılaşdıranadək,

Nə mutlu sağaldana və nə mutlu sağalana.

Və dedi: Bu gün bayrağı Allahı sevən çox igid və cəsarətli birinə verəcəyəm.

Allah da, Mən də onu sevirik. Allah onun əlilə açdı möhkəm qalaları".

Həzrəti-Əlinin (ə) "Nəhcül-Bəlağə" əsərinə ətraflı şərh yazmış məşhur ərəb alimi İbni-Əbil Hədidin Xeybər döyüşü zamanı Həzrəti-Əlinin (ə) qala qapısını necə qoparmasını tərənnüm edən bir beyti ilə kifayətlənirik:

*Ya qaşəl Babilləzi ən həzziha,*
*Əcəzət əküffü ərbəunə və ərbəu.*

Beytin məzmunu bundan ibarətdir: "Ey o qapını qopardan (Əli (ə)), səndən sonra həmin qapını qaldırmaqda 44 nəfərin aciz olduğunu gördüm".

*Nə Xuda desəm səzadır, nə bəşər desəm rəvadır,*
*Necə versəm ad xətadır şəhi-mülki-lafətayə!*
*(S.M.Şəhriyar)*

S.M.Şəhriyarın bu beytdə işlətdiyi "lafəta" sözü Həzrəti-Əlinin (ə) Xeybər müharibəsindəki şücaətinə işarədir. Həmin davada Əli (ə) Xeybər yəhudilərinin başçısı, nəhəng cüssəli Mərhəblə təkbətək döyüşdə öz Zülfiqar qılıncı ilə ona elə bir zərbə vurdu ki, Mərhəbin dəbilqəsi, daşdan yonulmuş papağı, zirehi və başı parçalandı. Bu halda asimandakı mələklər bu sözləri oxudular: "La fəta illa Əli, la seyfə

illə Zülfiqar" (Əlidən başqa cavanmərd, Zülfiqardan başqa qılınc yoxdur). Bu sözləri bütün qoşun əhli eşitdi.

Mərhəbin qətlindən sonra yəhudilər qalaya çəkilib, qapını bağladılar. Əli (ə) qalanın qapısını çərçivədən qoparıb çıxardı və İslam qoşunu qalaya daxil olub, onu fəth etdi.

Müharibədən sonra müsəlman qoşunundan 40 nəfər qüvvətli kişi o qapını yerindən qaldıra bilmədi. Həzrəti-Əlidən (ə) qapını necə qopardığını soruşanda, belə cavab verdi: "Mən o qapını bəşəri qüvvə ilə deyil, ilahi qüvvə və qiyamət gününə imanla qoparıb qaldırdım") [28, s.159–160].

Biz bu motivlə həm Aşıq Ələsgər yaradıcılığında, həm də bir çox başqa sənətkarların yaradıcılığında rastlaşırıq:

*Bismillahir-Rahmənir-Rahim! – deyib,*
*Sidq ilə çağırram Şahi-Heydəri.*
*Qeyzə gəlib bir əlində götürdü,*
*Səksən min batmanlıq dəri-Xeybəri [8, s.46].*
*(Aşıq Ələsgər)*

***

*Haqq buyurdu Şiri-Əzəm Heydərə,*
*Şəhadət barmağın saldı Xeybərə.*
*Şəmameynən getdi ol Şəhrizərə,*
*Ağam orda boran-qarı çəkibdi [12, s.101].*
*(Qurbani)*

***

*İgid lazım bu meydanda durmağa,*
*Müjgan oxun şirin cana vurmağa,*
*Bir əbu Əntərə qılınc vurmağa,*
*Ağam Əli əldə Zülfüqar gərək [29, s.56].*
*(Aşıq Alı)*

***

*Çaldı Zülfüqarı, böldü Əntəri,*
*Tamaşaya gətdi o mələkləri.*
*Mübarək dəstiylə dəri-Xeybəri,*
*Götürüb kənara atdığın deyim [30, s.36].*
*(Göyçəli Aşıq Nəcəf)*

***

*Qaldırıb Xeybəri yerindən atan,*
*Tifilkən Ağ Divin bəndini çatan.*
*Özünü qul edib Bərbərdə satan,*
*Sən Əliyyi-Mürtəzanı neylədin? [31, s.30].*
*(Xındı Məmməd)*

***

*Gedəndə rəzmi-Xeybərə, Əli, əmiri "La fəta",*
*Dalınca ol Qəzənfərə nəbi, oxurdu "Həl-Əta".*

*Gedib o şah vüqar ilə nəzərdə tutdu Xeybəri,*
*Vurub daş üstə nəsb qıldı beydəqi Müzəffəri.*
*Dolandı rəzmi-şövq ilə o şahi-din qəzənfəri,*
*Nəhibi vurdu qəhr ilə ki: "Ey güruhi-kafəri!"*
*Mənəm Əliyyi Murtəza, mənəm behişt sərvəri,*
*Mənəm Əmiri-möminan, mənəm imami-müqtəda!*

*O dəmdə Mərhəbi-ləin baxıb soluna-sağına,*
*Əli adın eşitcəyin üşütmə düşdü canına,*
*Çevirdi qaçmağa üzün, oxun qoyub kamanına,*
*Qılınc əlində Şahi-din yetişdi o məlainə,*
*Bölüb özün və mərkəbin dünüm batırdı qaninə,*
*Bu zərbi-dəstə ərşdə mələk deyərdi "Mərhəba".*

*Cəhimə eylədi rəvan, kəsib başın o kafərin,*
*O dəmdə pirü həm cavan deyərdilər "yüz afərin"*
*Çün Haris, Əntər ol zaman belə görüb bəradərin,*
*Səbi tək etdilər fəğan, ucaltdılar sədalərin,*
*Əli verərmi heç aman? Tez aldılar cəzalərin!*
*Bu naibi peyəmbərə tamami-şiələr fəda!*
*(Səlman Rəhimli) [32, s.368–369].*

Xeybər qalasının fəthi zamanı Həzrəti-Əlinin (ə) döyüş tərəf-müqabillərindən biri də Əntər adlı məşhur ərəb pəhləvanı olmuşdur. Geniş yayılmış təsəvvürlərə görə Həzrəti-Əli (ə) Əntərin başına elə bir qılınc zərbəsi endirmişdir ki, əgər mələk Cəbrayıl (ə) qanadını Zülfüqarın altına verməsəymiş qılınc yerin dərin qatlarına qədər işləyə bilərmiş. S.Ə.Şirvaninin:

*"Ey hurivəş ki, əksi ruhin sağərimdədir,*
*Kövsəri zülalı badeyi-canpərvərimdədir"*

mətləli qəzəlini:

*Ol başı Zülfüqar vuran zəhmi-mühlikin,*
*Cibrili tək hənuz əsəri şəhpərimdədir*

Sonrakı iki beytdə şair İmam Əlinin (ə) xalq arasında məşhur olan möcüzələrəindən birini qısaca bədii qələmə almışdır:

*İşarət eylədin, gün döndü geri,*
*Əlrəhman eylədi sənə ziyarət.*

Bu rəvayətin müxtəlif reqionlarda bir-birindən fərqli versiyaları vardır. Bunların arasında daha məntiqi və daha sanballı olanlarından biri Axund Hacı Soltan Hüseynqulu oğlunun "Duayi-Heydəri və ya Həzrəti-Əli (ə) zirvəsinə bir baxış" kitabında verilmişdir:

"İmam Əli (ə) öz əshabı ilə birlikdə Babilə tərəf yola düşdülər. Yolun ortasında namaz qılmaq üçün münasib yer tapa bilməyib hərəkətlərinə davam etdilər. Nəhayət, namaz qılmaq üçün münasib yer tapdılar. Amma, günəşin batmasına çox az qalmışdı. Hərçənd Əli (ə) bir qrup əshabı ilə namazını qılmışdı. Lakin əshabın bir qrupu namazını qılmamışdı. Buna görə də öz namazları barədə danışmağa başladılar.

İmam Əli (ə) onların söz-söhbətini eşitdikdən sonra, Allah-təaladan günəşin qaytarılmasını istədi. Allah-təala onun duasını qəbul etdi. Günəşi əsr namazının vaxtına qaytardı. Həzrətin (ə) əshabı namazını qılıb qurtardıqdan sonra, günəş qüruba endi. Camaat bu aşkar möcüzəni müşahidə etdikdən sonra, Allaha şükr edib ondan bağışlanmaq istədilər. Bu xəbər hər tərəfə yayıldı [33, s.233].

Ustad Qurbanidən başqa bəzi aşıqlarımız da bu möcüzəvi hadisəyə bədii işarələr etmişdir:

*İşarət eylədi göydəki günə,*
*Günü günortadan qaytaran Əli!*

*(Qurbani)*

***

*İbni Əbdüvədi aradan yaran,*
*Bir göz qırpımında xətm edib Quran,*

*Günü günortadan dala qaytaran,*
*Özü öz tabutun götürən Əli [11, s.55].*
*(Xəstə Qasım)*

***

*Qırxların cəmini yetirən minə,*
*Sənin hökmün işlər ərşi-zəminə.*
*İşarət eylədi göydəki günə,*
*Günü günortadan qaytaran Əli.*

***

*Abi-Kövsər üstə Əli saqidir,*
*Səkkiz cənnət onun seyrəngahidir.*
*Qərib deyir: Müşkülümün çağidir,*
*O qüdrət kanını göstərən Əli [13, s.12].*

Şair qoşmanın möhürbəndini Ulu Yaradana razü niyazla bitirir:

*Layiqi cəzayam, cümleyi-cahan,*
*İndi əməlimdən olmuşam peşman.*
*Düşmüşəm qürbətə, ya qədri sübhan,*
*Rəhm qıl Məzahirə, göstər inayət.*

Bənd bu baxımdan Aşıq Ələsgərin və Şeyx Nizaminin bu misraları ilə səsləşir:

*Günahım dəryadı, özüm qanmışam,*
*Tutduğum işlərə çox utanmışam.*
*Püşt pənahına daldalanmışam.*
*Adım Ələsgərdi, əslim Göyçəli [8, s.45].*
*(Aşıq Ələsgər)*

***

*Əfv et suçlarımızı, Ulu Tanrı, bağışla,*
*Sığınmışıq biz sənə, ümidlə, yalvarışla.*
*Nizaminin adına şərəf gətirən Xuda,*
*Sənin qulun olmağım ağalıqdır dünyada.*
*Onun dilinə dua, şükr ərməğanı ver,*
*Səni tanısın deyə mərifət nişanı ver [6, s.94].*
*(Nizami Gəncəvi)*

Göründüyü kimi Dədə Ələsgər və Nizami Gəncəvi kimi Məzahir Daşqın da şeirin sonunda tövbə, istiğfar, məxfirət, peşmançılıq, üzüqaralıq, günahkarlıq hisslərini vahid müstəvidə və eyni qayə ətrafında bir araya gətirir.

Beləliklə, belə aydın olur ki, bu şeir el aşığının Həzrəti-Əliyə (ə) bəslədiyi dərin sayğı və sevginin parlaq bir bədii ifadəsi kimi meydana çıxmışdır.

**Ədəbiyyat:**

1. Qurani-Kərim. (Ərəb dilindən tərcümə edənlər: Z.M.Bünyadov; V.N.Məmmədəliyev). Bakı, 2005
2. Ayətullah-üzma Nasir Məkarim Şirazi. “Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı”. (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, “Nurlar”, 2017
3. Novrəs İman. “Seçilmiş əsərləri”. (toplayıb tərtib edəni: İslam Ələsgər). Bakı, “Səda”, 2004
4. Borsunlu Məzahir Daşqın. I cild. (tərtib edəni, ön sözün müəllifi: Bağır Ulduz). Bakı, “Agah”, 2003
5. Möhsün Qiraəti. “Nur təfsiri”. III-IV cild. (tərcümə: Hacı Arzu). Bakı, “Nurlar”, 2015

6. Nizami Gəncəvi. "Sirlər xəzinəsi". Bakı, "Yazıçı", 1988
7. Şah İsmail Səfəvi (Xətai) külliyyatı. Qəzəllər, qəsidələr, nəsihətnamə, dəhnamə, qoşmalar. (Tərtibatçısı: Mirzə Rəsul İsmailzadə). Bakı, Əlhuda, 2004
8. Aşıq Ələsgər. Əsərləri, dastan-rəvayətlər, xatirələr. Bakı, "Şərq-Qərb", 1999
9. Məhəmməd Fuzuli. "Seçilmiş əsərləri". Bakı, "Yazıçı", 1984
10. S.Ə.Şirvani. "Seçilmiş əsərləri", I cild. Bakı, 1966
11. Xəstə Qasım. Bakı, "Folklor İnstitutu", 2010
12. Qurbani. Bakı, "Bakı Universiteti", 1990
13. Aşıq Qərib. Dirili Qurbani Məclisi. "Ya Əli" nəzirələr toplusu. (tərtibçilər: Yusif Dirili, Həsən Sobulu). Bakı, "Təfəkkür", 2007
14. Hacı Ələmdar Mahir. "Füzuli qəzəllərinin şərhi". 3 cilddə. I cild, Bakı, "Elm və təhsil", 2012
15. H.Hüseyni. ""Bismilləh" ayəsinin incə görüntüləri və "bə" hərfinin altında olan nöqtənin sirri". Bakı, "MBM", 2014
16. Hacı Həsən Hüseyni. "Əhli-beyt (ə) aşiqi Dədə Ələsgər". Bakı, "İmza", 2022
17. V.Almasov. "Həzrəti-Əli (ə) aşiqi Füzuli". Bakı, "Çaşıoğlu", 2010
18. Məhəmməd Füzuli. "Əsərləri". II c. Bakı, 1958
19. Seyid Əbülqasim Nəbati. "Əsərləri". Bakı, "Yazıçı", 1985
20. Bəhmən Göyçəli. "Vətən, küsmə məndən". Bakı, "Elm", 1994
21. Nəsimi. "Seçilimiş əsərləri". Bakı, "Azərnəşr", 1973
22. Şah İsmayıl Xətai. "Keçmə namərd körpüsündən" (Şeirlər və poemalar). Bakı, "Yazıçı", 1988
23. Məhəmməd Füzuli. "Seçilmiş əsərləri". Bakı, 1999
24. Aşıq Talıb. "Könlüm Vətən arzular". Bakı, "Elm və təhsil", 2013
25. Sərraf Şiruyə. "Susma, ürək...". Bakı, "SkyG", 2015
26. Həbibullah Şətif Kaşani. "Əsmaullahul-husna"nın xüsusiyyətləri (Allahın 99 gözəl adı). Bakı, 2013

27. “Azərbaycan məhəbbət dastanları”. Bakı, “Elm”, 1979
28. H.H.Hüseyni. “Müqəddəs Zilhiccə bayramları”. Bakı, “Ecoprint”, 2020
29. Aşıq Alı. “Nə qaldı”. (toplayanı və tərtib edəni: İlham Qəhrəman). Bakı, “Qanun”, 2020
30. Göyçəli Aşıq Nəcəf. (toplayıb tərtib edəni: İslam Ələsgər). Bakı, “Səda”, 2000
31. Aşıq Xındı Məmməd. “Meydanda mərdi-mərdana”. Bakı, “Borçalı”, 2001
32. Axund Hacı Soltan Hüseynqulu oğlu. “Gizli xəzinələrdən incilər”. Bakı, “Tural-Ə” NPM, 2002
33. Axund Hacı Soltan Hüseynqulu oğlu Əlizadə. “Duayi-Heydəri və ya Həzrəti-Əli (ə) zirvəsinə bir baxış”. Bakı, “Tural-Ə” NPM, 2002

# ƏLAVƏLƏR

## ƏHMƏDLƏ[1] DEYİŞMƏ

İman
Məzlumlar ağası, mərdin mövlası,
Şəninə zikr olan hələtası, gəl!
Xəstələr bənası, din müdərası,
Aya, taha, yasin, qülkəfası, gəl!

Əhməd
Bey bir Allah, mim Məhəmməd, ya Əli,
Səndədi müşgülün var şəfası, gəl!
Qəribi-xəstənin mərizi-dili,
Mənim tək qulların sən ağası, gəl!

İman
Göstərən dəryada rahi-Cəbrail,
Yunisi bəlada qoymayan zəlil.
Al gətir əlindən Abi-Səlsəbil,
Şirindi qullara hər badası, gəl!

---

[1] Əhməd Kəlbəcər rayonunun Seyidlər kəndindən idi. İman həmin kənddə kənd şurasının katibi işlədiyi vaxt (1920-ci illərdə) bu qoşmalar yazılmışdır. (İslam Ələsgərin qeydi)

Əhməd
Hüseynin dəstində bir badə yetir,
Rey rəviyə gələr, nun nida yetir,
Hey haray eyləyər, sin səda yetir,
Almamış cismimi sin sədası, gəl!

İman
Ahutək mələrəm mən, dağ-daş ağlar,
Didəmdən tökülən qanlı yaş ağlar,
Nə ana can dəyər, nə qardaş ağlar,
Novrəs imanda var eşq havası, gəl!

Əhməd
Axdı dərdim, oldu dəryayü ümman,
Zamanə Əhmədə tuş tutub kaman.
Mehdi zühur eylə, sahib əz-zaman,
Aləmin imdadı, Mustafası, gəl!

## QEYSƏRLƏ DEYİŞMƏ[1]

### I

Qeysər
Qəza kəməndinə olubsan düçar,
Dolandırıb bu zamana, gəlibsən.
Çəkərsən əlimdən yaxşı ahü zar,
Boyanarsan əlvan qana, gəlibsən.

İman
Dilimdə Məhəmməd, kani-zülkərəm,
Əzbərimdi, bu cahana gəlmişəm.
Bağlayıb ürəkdən sidqü etiqad,
Onun kimi səxa kana gəlmişəm.

Qeysər
Binəva, nə lazım, darı mən quram,
İstəmirəm, sənlə rubəru duram,
Heyifsən, bənd edib, zindana vuram,
Rəhm edərəm sən cavana, gəlibsən.

İman
Söyləmə zindanı, zalım Qeysəri,
Çağırram Həsəni, şahi-heydəri.
Hər zaman canına salı ləngəri,
Doyduraram səni cana, gəlmişəm.

---

[1] Aşıqların söyləməsinə görə, İman guya Rum elinə səfər etmiş, orada Qeysər adlı bir aşıqla qarşılaşmış və onunla deyişmişdir. Əslində isə belə bir səfər olmamışdır. Oxuculara təqdim olunan bu deyişmələrin hər iki tərəfi İmanın öz yaradıcılığı olduğu kimi, söylənilən əhvalat da onun xəyalının məhsuludur. (İslam Ələsgərin qeydi)

Qeysər
Qeysərəm, nə zaman cəngdə durdum,
Neçə cür aşığa damü tor qurdum,
Sazın alıb, özün zindana vurdum,
Axır sənsən, bu məkana gəlibsən.

İman
Bil, mənəm ol şahi-heydər aşiqi,
Hüseyni-şəhidin əkbər aşiqi.
Novrəstə İmanam, dilbər aşiqi,
Nə dəliyəm, nə divanə, gəlmişəm.

**II**

Qeysər
Düşübsən nagahın cəngi-dəstimə,
Az vaxta çəkərəm dara mən səni.
Od vurram, yanarsan başdan-ayağa,
Atdırram alova, nara mən səni.

İman
Sidqinən dilərəm Şahi-Mərdanı,
Gətirərəm ahü zara mən səni.
Yetişsə quluna şahın fəramanı,
Salaram bir özgə kara mən səni.

Qeysər
Mənəm bir əjdaha, kamım açılsa,
Aləm yanar atəşimdən saçılsa.
Qeyzə gəlib, gül irənkin qaçılsa,
Eyləyərəm günüqara mən səni.

İman
Beçeyi-şahbazam, şikarım ovlar,
İstəsəm ağamdan, qılıncım sovlar.
Ataram, canına düşər alovlar,
Yandırram ataşa, nara mən səni.

Qeysər
Qafilsən işimdən, Rumi-Qeysərəm,
Qara yellər kimi əsən sərsərəm.
Bənd eyləyib, axır, başın kəsərəm,
Göndərərəm dar məzara mən səni.

İman
Eşidəsən, quli-Şahi-Mərdanam,
Qeybdən dərs alan Novrəs İmanam,
Belə cəng içində mərdi-meydanam,
Tərlanam, döndərrəm sara mən səni.

**III**

Qeysər
Fərşi-züumurun neçə nizamı,
Neçədi cəsədi, canı neçədi?
Neçədi təhtində səhvətül xuram,
Neçədi əfzəli, xanı neçədi?

İman
Fərşi-züumurun beşdi nizamı,
Cəsədi yeddidi, canı üç oldu.
Üç varlıq təngində fərşi göstərin,
Əfzəli ikidi, xanı üç oldu.

Qeysər
Ayeyi-vəlnəcmi-iza havadan,
Nə olur aşikar o vəzzühadan?
Vəl şəmsi, vəl leyli iza yaxadan,
O əziz ayənin sanı neçədi?

İman
Vəl nəcmi-Rəsulun qəlbi münəvvər,
Vəzzüha camalı, hüsnü müəttər
Vəl leyli şəmindən alındı xəbər,
Şeş guşə ayətin sanı üç oldu.

Qeysər
Momudu şintiya İlya Taptap,
Naibi mərmərə əbzədül şəhab.
Tohiri-əladır amasil xitab,
Qatili-huşanın şanı neçədi?

İman
Momudu şintiya Rəsuli-əla,
Taptap-Əlidir, nami-İlya.
Mərmərə şahabim şahi-Mürtəza,
Qatili-huşanın şanı üç oldu.

Qeysər
Qeysərəm, sözümdən qaldı bir kalam,
Harda bu işlərə verildi əncam?
Sən de, mən eşidim yerbəyer tamam,
Neçədi mənzili, xanı neçədi?

İman
Tohiri-əladır imamül hüda,
Uzatma, kəs dilin, sözün et cüda.
Bənd elərəm səni, istəsə xuda,
İman deyər, axır sözün heç oldu.

**IV**

Qeysər
Xaliqi-ləmyəzəl əvvəl, ibtida,
Nə yaratdı, bu suala xəbər ver?
Nə oldu vücudu, nə oldu cüda?
Nə gəldi o işdən hala xəbər ver?

İman
Rəhmətilin aləm nuri-hidayət
Xatəmül ənbiya xəlq olunubdu.
Vəsiyyi-Mustafa nurundan cüda,
Tamamən ənbiya xəlq olunubdu.

Qeysər
Haqq nədən yaratdı ərşi-əlanı?
Yer nədən yarandı, bəhri-dolanı?
Lohü kürsü qələm xilqət olanı
O göstərən qilü-qala xəbər ver.

İman
Xudam xəlq eylədi ərşi cövhərdən,
Bizə nişanadı yarısı yerdən.
Lohü kürsü qələm oldu bir-birdən,
Bir-birindən cüda xəlq olunubdu.

Qeysər
Nə üstə dolanır külli-kainat?
Neçədi sovmda səhvi-şəkkiyyat?
Qeysərəm, əlimdən çəkərsən heyhat,
Zikr elədim bu məqalə xəbər ver.

İman
Aləm xidmət edir hərə bir yola,
On beş səhv ilə şəkkiyyat ola.
Novrəstə İmanam, çağırram mövla,
Bir gündə masəva xəlq olunubdu.

**V**

Qeysər
Əvvəl vacibatdan kim gəldi cana?
Məhəmmədi əmin oldu aşikar?
Kim gətdi xudanın hökmün əyana?
Kim aldı, o işdən oldu xəbərdar?

İman
İbtida göndərdi həyyi-layənam,
Vacibdir şəhadət cümlə cahanı.
Xatəmən mürsəlin rəsuli-əkrəm
Bildi hökmləri, etdi bəyanı.

Qeysər
Nəyinən işlədi hökmi-layəzal?
Nə üstə olundu cümlə qilü-qal?
Bizə lazım olan əmri dalbadal
Neçə şeylər onu eylər istivar?

İman
Hökmün aşikara gətdi Zülfüqar,
Din üstə kafəri qıldı tar-mar.
Vacibdir süludin, firudin-bunlar,
Möhkəm eylər oruc, namaz insanı.

Qeysər
Ər gördüm, sərində nizamı beşdi,
Beş içində gəzir, məqamı beşdi,
Gah gördüm o şahın qulamı beşdi,
Qeysəri kim bilsə, çəkməz ahü zar.

İman
Sovmdur sərində rövnəqi-islam,
Pənci-Ali-Əba, on iki imam.
İluli-əzmdir əhmədə qulam,
Ağası öyrədib Novrəs İmanı.

## AŞIQ SADIQLA DEYİŞMƏ[1]

### I

Sadıq
Hikmət məclisində əyləşən alim,
Əvvəl, mana yamənhudan xəbər ver.
Ərşin sütununda, merac evində
Söz nə keçdi, goftü gudan xəbər ver.

İman
Bir ilahim Cəbrailə buyurdu,
Yamənhu – mən kiməm, tanı deməkdir.
Üç min kəlmə peyğəmbərə danışdı,
Gizlin, aşkar o sübhanı deməkdir.

Sadıq
O kim idi, yerə çaldı mayanı,
Su ikən bərkitdi səngü qayanı?
Be altında de noqdanı bəyanı,
Bərü bəhrü səngü sudan xəbər ver.

---

[1] Deyilənlərə görə, İman bir məsələ ilə bağlı olaraq Tiflisə gedibmiş. Bir az dincəlmək üçün çayçıya dönən İman divardan asılı bir saz görür, öz sazını onun yanından asır və çay içməyə başlayır. Bu zaman qapıdan girən Aşıq Sadıq burada başqa bir aşıq olduğunu bilir, bundan qəzəblənir və saz sahibi ilə deyişmək üçün onu meydana çağırır. İman sazını götürüb, onun qarşısına çıxmağa məcbur olur. Deyişmə vaxtı Aşıq Sadıq Xəstə Qasımın buradakı bağlamalarını oxuyur, İman da ona cavab verir.
Aşıqlar bu rəvayəti bir dastan şəklində danışırlar.
Aşıq Sadıq belə bir hadisənin olduğunu təsdiq etmirdi. (İslam Ələsgərin qeydi)

İman
Hikməti-xudadan maya vuruldu,
Be-bərkidi, haqq nizamı quruldu.
Və gün dedi, xak sudan duruldu,
Dağı, daşı, cismi, canı deməkdir.

Sadıq
O kim idi, zərnişanı oxudu?
Kim idi, peyğəmbərə kəfən toxudu?
Adəmdən irəli siğə yoxdu,
Vəznü vəştü ənkəhudan xəbər ver.

İman
Əzrayıl oxudu lövhi-məhfuzu,
Peyğəmbər kəfənin toxudu özü.
Cəbrailə dedi, siğə qıl bizi,
Adəm ilə o Həvvanı deməkdi.

Sadıq
O kim idi, bir məkana yetmədi?
O kim idi, əyri yolu tutmadı?
O nələrdi, öz həddinə çatmadı?
Həftü həştü sivü dudan xəbər ver.

İman
Musa haqqın hesabına yetmədi,
Salman idi, əyri yolu tutmadı.
Cənnət, cəhənnəmdi, həddə çatmadı,
Aydı, gündü, otuz sanı demədi.

Sadıq
O kim idi, yetişmədi nisaba?
Kim idi, peyğəmbərə oldu əsaba?
Xəstə Qasım, özün yetir hesaba,
Bərrü, bəhrü səngü sudan xəbər ver.

İman
Arif sözlərinə huş verdi sərim,
Hər yana yetirir məna gözlərim.
Coşdurur sinəmdə qəmli dəftərim,
Çox incidir bu İmanı deməkdi.

**II**

Sadıq
Adəmdən Xatəmə
Natiqi-quran mənim.
Din mənim, məzhəb mənim,
Yol mənim, ərkan mənim.
Gül mənim, bülbül mənim,
Sünbüllü reyhan mənim.
Yerdə insan, göydə qılman,
Ərşdə aslan mənim.

İman
İbtidadan intəhaya
Gərdişi-dövran mənim.
Nuri-əhməd xəlq olandan
Axır əz-zaman mənim.
Dil mənim, Zəbul mənim,
Qabili-tuban mənim.
Heydər mənim, Səfdər mənim,
Ol Şahi-Mərdan mənim.
Nuri-ənvər, Şəmsü Qəmər,
Rakini-iman mənim.

Sadıq
Abü ataş, xakü baddan
Yaratdı sübhan bizi.
Altı mindən altı yüzü
İsbat qıldı üç yüzü.
Dörd yüz arxa bağladı
Dəryada qırx dörd dənizi.

Yetmiş üçün mən biriyəm,
Altımışın qırx səkkizi.
Beş içində altı məkkə,
Səkkiz yüz fərman mənim.

İman
Ab, ataş - odda, sudu,
Xak - torpaq, bad - yel.
Altı mindən doqquz yüzdü
Həmdin nizamı bir il.
Sünnət əmri nəhyi məkruh,
Dörd yüz qırx dörd, onu bil.
Sovm içində müqəddimat,
Məkkə səkkiz yüz səbil;
Bu elmədə xaliq verib
Dərsimi pünhan mənim.

Sadıq
Yeddi eyvan, səkkiz seyvan,
Qırx sütun, bir ləngəri.
Yeddi molla, yeddi dərviş,
Yeddi püst, yeddi dəri.
Yeddi min qırxdan irəli,
Səkkiz yüz dörddən bəri;
Bi işləri cəm edənin
Sərinə əsər gəli.
Pir mənim, ustad mənim,
Yol mənim, ərkan mənim.

İman
Yeddi eyvan - cəhənnəmdi,
Səkkizdi Rizvan səda;
Ənbiyalar, övsiyalar
Qırx sütun ləngər xuda.
Yeddi səhvi, yeddi şəkki,
Yeddi ruz, yeddi nida.
Yeddi min qırx - keçən tarix,
Səkkiz yüz dörddü cüda;
Həm bənasız, həm vəfasız,
Nə olsa viran mənim.

Sadıq
Bistü həştü nisb içində
Yar məni isbat edər;
Bir mürəkkəbdə oxunan
Sureyi-əyyat edər.
Altı min altı yüz
Otuz dördü zat edər;
İncil, Zəbur, Söhvü Tövrat,
Ayeyi-Quran mənim.

İman
İslamiyyət aləmində
İyirmi səkkiz hərf var;
Xaçpərəstdə altı arıq,
Otuz dördür aşikar.
Bir tərəfdə nəzər qılsa,
Heydər - Düldülsəvar;
O eyndə nitqə gəlsə,
Əfv olunan can mənim.

Sadıq
Xəstə Qasım Tikmədaşlı,
Sahibi-cümlə xata.
Var ümidi taci-merac,
Billəm ki, eylər əta.
Gəlsə dəftər, olsa rəhbər,
Şahsuvar innafəta;
Nə qədər günahım olsa,
Əfv eylər rəhman mənim.

İman
Novrəs İman Göyçə elli,
Sidqi şahi-heydərə;
Ərşi-əladan mədh gəldi,
Biz də yazdıq dəftərə;
Tifil ikən məhd içində
Hökm qıldı əjdərə;
Xaliq özü şəfaətçi
Yazdı ruzi-məhşərə;
Qorxum yoxdu qurulanda
Ədalət divan mənim.

# NOVRƏS İMANIN ÇAP OLUNMAYAN ŞEİRLƏRİNDƏN

## BAZARDA[1]

Ədalət haqqımsan, ey sirri Sübhan,
Qoydun halal dükan, maya bazarda.
Halalla haramı, pakla hey təmiz,
Seçirlər, çəkirlər çaya bazarda.

İsmayıl qurbanı Mina dağında
Məhəmməd namazda, sübhün çağında.
Adları yazılıb behişt bağında,
Yazıqdır Sübhanım saya bazarda.

Məhəmməd Quranı əzizdi cana,
Əli haqq ağadır, Fatimə ana.
Həsənlə Hüseyn beşikdəkənə,
Oxudu Qurandan ayə bazarda.

Ağam da dərsimi veribdir pünhan,
Fikrində zikirdi qadiri Sübhan.
İman salavatnan verir imtahan
Baxaraq Günəşə, Aya bazarda.

---

[1] Şeir Həsən Xəyallının arxivindən əldə olunub. (Redaktor – A.Y.)

## ƏHVALAT

***Haqq vergili Novrəs İman haqqında olmuş hadisəni Taleh Vəliyev yazır:***

## O GƏLİNİN BAĞRI QAN, GÖZÜ DƏ YAŞLI İDİ

Novrəs İmanın yaxın dostu və balabançısı olmuş Qızılvəngli Nəsir Cəfərov xatirələrinin birində Novrəs İman haqqında danışırmış (Qeyd edim ki, balabançı Nəsir Cəfərov ustadlar ustadı Aşıq Alının bacısı Pəri xanımın oğul nəvəsi olub). Balabançı Nəsir Cəfərovun danışdığı bu xatirəni oğlu Xanbuta Cəfərovdan eşitmişəm:

Novrəs İmanla bir neçə günlük ağır el məclisindən – Dərəçiçək mahalının Paşakənd kəndindən toydan gəlirdik. Yazın-yaylağın yaxşı vaxtları idi. Yol kənarında qazaxlıların binələri qurulmuşdu. Binənin ağsaqqalları bizi əlisazlı yoldan keçən görüb qonaq dəvət etdilər. Gələn aşığın Novrəs İman olduğunu biləndə isə lap doğmalıq göstərdilər.

Allah verəndən süfrəyə düzdülər. Binənin gəlinlərindən biri ilk əvvəl sərin ayran gətirdi. Biz ayranı bəh-bəhlə içdiyimiz halda, Novrəs İman içmədi. Yanımızda əyləşən gənclərdən ona su gətirməyi xahiş etdi. Bir dolça suyu içdi.

Binənin ağsaqqalları ilə halalaşıb, sağollaşandan sonra yolumuza düzəldik. Yolda, "Ay ustad, o gəlin verən ayranı niyə içmədin?" – deyə sual etdim. Novrəs İman dərindən ah çəkib dedi: Ayran hazırlayıb gətirən o gəlinin bağrı qan, gözü də yaşlı idi. Onun təzəlikdə canından can ayrılıb, balası ölüb. Mən onun əlindən necə ayran alıb içə bilərdim? Heç binənin ağsaqqallarının, sakinlərinin də halı-hal deyil-

di. Aşıq ola, Qazax camaatı ola, onu çalıb-oxumamış boşduyalar, bu, çətin məsələdir.

Yolumuza davam etdik. Az bir vaxtdan sonra Dərəçiçəkdə yenə bir məclisə yolumuz düşdü. Həmən binədə dayanası olduq. Ağsaqqallarla hal-əhval tutduq. Bizi doğmalıqla qarşıladılar. Ağsaqqallardan biri üzünü Novrəs İmana tutub dedi: Ay oğul, keçən dönüş gəlişinizdə gözü yaşlıydıq. Ocağın yanındakı gəlinini (keçən dəfə bizə gələndə ayran verən gəlini) göstərib, onun 10 yaşlı bir uşağının tələf olduğunu bildirdi. Hansı ki, Novrəs İman həmin gəlinin gətirdiyi ayranı içməmişdi...

**Zakir ŞƏHRİYAZ**

## NOVRƏS İMANIN

*Novrəs İmanın 100 illiyinə*

Ustad süfrəsindən əlin üzməzdi,
Qisməti qismətmiş Novrəs İmanın.
Haqqı pərdələyib, nahaq deməzdi,
Ülfəti ülfətmiş Novrəs İmanın.

Gözəl təbli sənətkardan biriydi,
Dayandığı yeri ustad yeriydi.
Ləyaqət simvolu, ürfan əhliydi,
Şöhrəti şöhrətmiş Novrəs İmanın.

Sərində tükənməz inci varıymış,
Ustad yolun gedən bir ustadıymış,
Elə bil sinəsi ləl yatağıymış,
Sərvəti sərvətmiş Novrəs İmanın.

Danışanda girməmişəm bəhsə mən,
Sözümü deyəndə dedim kəsə mən.
Düz olanı niyə deyim tərsə mən?
Qüdrəti qüdrətmiş Novrəs İmanın.

Şəhriyaz yazdığın, yazdı yanıqlı,
Ömrü keçdi belə sirli-soraqlı.
Təcnisi təcnismiş yerli-yataqlı,
Hikməti hikmətmiş Novrəs İmanın.

## İMANIN

*Aşıq-şair Novrəs İmanın 110 illik yubileyinə*

Açıb kitabına nəzər yetirdim,
Sənətinə heyran oldum İmanın.
Təcnisi heyrətə gətirdi məni,
Qüdrətinə heyran oldum İmanın.

Belə bir sənətkar harda var, hanı?
Kim unudar bu sinəsi ümmanı.
Gözlər önündəydi ədəb-ərkanı,
İsmətinə heyran oldum İmanın.

Şəhriyazın halı özgə halıymış,
Sən demə bu dünya qilü-qalıymış.
Dərya təlatümlü təbi varıymış,
Sərvətinə heyran oldum İmanın.

*2013-cü il*

## İMAN KİMİ

*Novrəs İmanın 120 illik yubileyi ərəfəsində*

Şükür qoruyub saxladım isməti İman kimi,
Keşkə mən də qazanardım hörməti İman kimi.
Ədəb-ərkanı buraxıb tərs yönə yönəlmədim,
Mən sinəmdə bəsləmişəm sərvəti İman kimi.

Ürəyimdən keçənləri layiqincə deyərdim,
Bu sənətə kəm baxanın gözünə dağ çəkərdim.
Sənətkarlar cərgəsində sayılıb-seçilərdim,
Düz öyrənib, düz anlasam izzəti İman kimi.

Mən ki, sənətin yolunda usanıb-bezməmişəm,
Haqqı nahaqqa verəndə dayanıb dözməmişəm.
Şəhriyazam ləyaqətdən əlimi üzməmişəm,
Çalışıram dərk eyləyim hikməti İman kimi.

*2023-cü il*

**Adilə NƏZƏR**

## NOVRƏS İMANA

Bu yalan dünyanın düzü o idi,
Yalanı buraxıb hayana getdi?!
Hər kəlamı ərz edirdi Kitabı,
Kəlamı buraxıb hayana getdi?!

Hayıf oldu cavan ustad itgisi,
Din-imanlı, elin dərviş-vəlisi,
Düzəltdiyi piri-aləm məclisi,
Aləmi buraxıb hayana getdi?!

Dünya gen dedilər, sən demə, dardı,
Bilmədik bəxtinə yağan nə qardı.
Əlində gül kimi qələmi vardı,
Qələmi buraxıb hayana getdi?!

Ayrıldı ay üzlü nazlı yarından,
Qəlbinə köz düşdü qardaş qorundan.
Allah oğul verdi həyat barından,
Balanı buraxıb hayana getdi?!

Belə ağır imiş dərdləri məgər,
Ona ağlamışdı Aşıq Ələsgər.
Sözü möhkəm qala, yolusa ləngər,
Qalanı buraxıb hayana getdi?!

Adilə, yaxşını-pisi yoxladım,
Şair taleyinə ürək dağladım,
Salam-dua büküb bir pay bağladım,
Salamı buraxıb hayana getdi?!

*19.10.2023*

**Şamama ƏLƏSGƏRLİ**

## AĞLASIN

Bilsəm torpaq səni çəkib köksünə,
Deyərəm ellərə ellər ağlasın.
Eşitsin dərdini eşitməyənlər,
Töksün göz yaşını, sinə dağlasın.

Bəlkə nəvələrin qatır başını,
Qurudur gözündə həsrət yaşını.
Bəlkə də qoyublar məzar daşını,
Gətirsin sorağın yellər ağlasın.

Qürbətdə ölənə yoxdur xəyanət,
Qayalar köksündə saxlar əmanət.
Çiçəklənib, gülən allı təbiət,
Qeyzə gələr, deyər: çöllər ağlasın.

## HARDASAN

İstimi, soyuqmu yerin, məkanın,
Günün xoşmu yoxsa ahu-zardasan?
Ürək həsrət çəkir, gözlər yoldadır,
Söylə, ey İmanım, söylə, hardasan?!

Bəlkə bir diyarda ayağın tutub,
Təmtəraq içində, sən bir vardasan.
Bəlkə soyuq məzar sənə yar olub,
Söylə, ey İmanım, söylə, hardasan?!

İlk zaman üzünü tutdun ha yana?
Doydumu boyuna baxmaqdan ana?
Asimana tutur üzün Şamama,
Söylə, ey İmanım, söylə, hardasan?!

# KİTABIN İÇİNDƏKİLƏR

**Novrəs İmanın çap olunmayan şeirlərindən**



**Əhvalat**



**Novrəs İmana ithaf olunmuş şeirlər**

